# Qəzəllər

## Seyid əzim şirvani



«Qəd təcəlla min şüail-kəsi ənvarül-bəha,
Tilkə fəzlüllahi bəl yəhdi linurih mən yəşa.» [ 1]
Məşriqi-sağərdən etdi afitabi-mey tülu,
Məğribi-minadə verdi aləmə nurü bəha.
Mey zühuru oldu sağərdən əyan aləmlərə,
Kur olma,çeşmüvə ver dövri-sağərdən cila.
Qülqüli-mina sədayi-həqqi eylər aşikar,
Dəvəti- həqdir, bu gün afaqı tutmuş bu səda.
Canü dil sübhi-əzəldən talibi-dildar ikən,
Şükr-kim, tapdı gözüm didari-sağərdən ziya.
Cami-mey ayineyi-əsrari-həqdir, ey könül,
İstəsən əsrari-həqqi, cam ilə ol aşina.
Yoxdu bir rəmzaşina bu əsri-bədfərcamdə,
Eyləmə əsrari-həqqi çox da, Seyyid, bərməla.

[İstinad 1: Badənin şüasından parlaq nurlaq təcəlla (təzahür) etdi,
bu allahın mərhəmətidir ki, istədiyi adamı öz nuruna hidayət edər.]

Əya, zatın nihandır ol nihandan hər nihan peyda,
Olubdur hikmətindən cümlə bu kövnü məkan peyda.

Cahanı cam «ənə ərəf»[1]dən etdi məst əltafın,
Büruzə gəldi zatın, oldu ol kənzi-nihan peyda.
Cahanın xilqətindən məqsədin bir zati-əkrəmdir,
Məgər kətmi-ədəmdən olmaz idi bu cahan peyda.
Əgər mənzuri-çeşmin olmasaydı Əhmədi-mürsəl,
Bu abü tab ilə olmazdı ərzü asiman peyda.
Nəsimi-qəhrin eylər gəh xəzan yüz min gülüstani,
Bahari-feyzin eylər əsrgəh yüz gülsitan peyda.
Deyirlər lütfdən can zahir olmaz, bəs nədəndir bu
Olur hər ləhzə lütfündən neçə ruhi-rəvan peyda?!
Məzaqi-təlxkamani-cahanı etməgə şirin
Bu həm bir lütf koldu[2]Seyyidi-şirinzəban peyda.

[İstinad 1: Bizi tanı ]
[İstinad 2: Ki oldu]

Ey tari-səri-zülfün «vəlleyli iza yəğşa», [1]
Vəşşəms yüzün vəsfin zərratə qılıb inşa.
Ey mürşidi-nasuti, vey sayiri-lahuti!
Kim olmadı .həmseyrin Cibril şəbi-əsra.
Gün olsa kecə olmaz, ey mah, nədir vəchi,
Yəldayi-səri-zülfün gün üzdə olub peyda.
Sən cövhər, ərəz aləm, sən əsl, tüfeyl adəm,
Həm illəti-ğaisən, həm illətəsən məbda.
Hər illətə illətsən, sən baisi-xilqətsən,
Sən eyni-məşiyyətsən, sən aləməsən mövla.
Sən əvvəlü sən axir, sən zahirü sən batin,
Sən teyyibü sən tahir, sən surətü sən məna.
Ey çardə məsumun səyxeylü sərəfrazı,
Qurani-xudavənddə şahid bu sözə «Taha».
Xürşid cəmalindən bir zərrə əyan oldu,
Tur üzrə təcəlladən məbhut qalıb Musa.
Seyyid nəçidir etsin övsaf səni, ey şəh.
İzhari-xülusiyyət eylər sənə ol şeyda.

[İstinad 1: Qaranlıq çökəndə. ]

Xah Musa damənin tut; xah İsa, ey fəta,
Tərk qıl fironi -nəfsi, eşqə eylə iqtida.
Eşqdir ol qüvveyi-cazib ki, xaki-Məkkədən
Etdi cismi-ünsüriyyi-Əhmədi ərşaşina. •
Eşqdir kim ki, edər vadiyyi-eyməndən xüruş,
Eşqdir kim ki, dirəxti-Turdən eylər nida.
Ol gədayi-eşq, sultanlıq muradındır əgər •
Kim, diyari-eşqdə afaqə sultandır gəda.

Görəndə xaməni ol növxətin bənanında,
Neyi-həsəd yer edər əhli-eşq canında.
Görən deyər üzüvi nöqteyi-mürəkkəb ilə
Ki, lalədir açılıb hüsn gülsitanında,
Çəkər bəyazına möhrə hənuz mərdümi-çeşm
Ki, ta yaza:neçə ayət üzün bəyanında.
Usan bu dərsdən, ey şux, məşqi-naz eylə,
Keçirmə vəqtini yaquti-ləb zamanında.
Qəmi-dəhanüvə kim, sərf oldu varü yoxum,
Hənuz «Əmrdü Zeyd» ol məhin dəhanında.
Bu mətləi-ürəfa ilə bu qəzəl, Seyyid,
Xəraci-Misrə dəgər əhli-zövq yanında.

/Könül, ta var əlində cami-mey səbhəşümar olma,
Riyayi-xəlqdir, billah, namaz əhlinə yar olma.

Eşit sövti-müğənni, sakin ol meyxanə küncündə.
Müəzzin naləsindən məscid üçün biqərar olma.
Qurub təhtül-hənəkdən dam zahid, səbhədən danə,
Həzər, ey mürği-dil, ol danəvü damə şikar olma.
İmamə ixtiyarın vermə, hərgiz uyma təkbirə,
Onun tək faili-muxtarsən, biixtiyar olma.
Döşənmə buriya tək məscid içrə səcdeyi-səhvə,
Özü bu səhvdir, pamali-xəlqi-ruzigar olma.
Könül, meyxanə cənnət, badə kövsər, saqidir qılman,
Gedib vaiz deyən nisyə sözə ümmidvar olma.
Rümuzi-şerimin dərk etməmiş mənasını, Seyyid,
Gedib meyxanələrdə laübali meyküsar olma.

Qoy, vaiza, məni yetişim xüm ayağına,
Həq vasil eyləsin səni kövsər bulağına.
Gər bir əyağ ilə tuta, lütf eyləyib, əlim,
Canım fədadı saqiyi-bəzmin əyağına.
Fəsli-bahar ola, mey ola, bir də yar ola,
Adəm həvəs edərmi dəxi xüld bağına?!
Saqi, şərab ilə məni sən tərdəmağ elə,
Kimdir baxan bu zahidi-xüşkün yasağına!
Bir biədəblik eyləmədik biz ki, vaiza,
Bizdən nə sadir oldu ki, dəgdi dəmağına?
Dövri-ləbində xüzri-xətindən xəbər-tutub,
Düşdü Xızır da çeşmeyi-heyvan sorağına.
Seyyid, gözün işıqlana kim, piri-meykədə
Verdi ziya mey ilə genə gün çırağına.

Gecə gördüm səni, ey afəti-dövran, yuxuda --
Ki, edərdin mənə yüz lütfi-firavan yuxuda.

Görmüşəm ləlüvi, lazımdı tökülsün qanım-,
Etibar olmaz əgərçi görələr qan yuxuda.
Zahirəçvabi-bəqayə yetəcək xəstə könül
Kim, bilibdir dəhənin sirrini pinhan yuxuda-,
Nola ləlin görübən zövq ilə xəndan olsam,
Rəsmdir şad olu hər kim ola giryan yuxuda.
Var ümidim ola cəmiyyəti-vəslin məqdur
Ki, qara zülfüvi göz gördü pərişan yuxuda.
Geçə gördükdə səfayi-rüxün, ey kəbeyi-hüsn.
Kaş olaydım, dolanıb başuva, qurban yuxuda».
Seyyidi-zar gerüb vəslüvi bidar olmuş,
Bir gədadır ki, görüb özünü sultan yuxuda.

Olmasaydı qəmi-eşqin dili-viranımda,
Saxlamazdım onu bu izzət ilə yanımda.
O qara xalı mənə versələ qanın içərəm,
Nə üçün mənzil edib arizi-cananımda.
Tutanı müshəfi-rüxsarüvi ol kafər xət,
Görünür gör nə xələllər .mənim iymanımda.
Eyləməz aşiqi bir lütf ilə xürrəm, ya rəb,
Bu nə rəftardır ol sərvi-xuramanımda?
Düşəni xublərin könlümə fikri, Seyyid,
Əlli Yusif -tapılır gülbeyi-əhzanımda.

Ey xəyali-qamətin daim əlif tək can ara.
Daği-eşqindən əliflər sineyi-suzan ara.
Eylə kim gəncini saxlar düzdlərdən gəncvər,
Saxlaram peykanların can tək dili-viran ara
Nalə eylər gecələr bimar, eyb etmin əgər --
Könlüm etsə nalələr ol zülfi-müşkəfşan ara
Sudə əksi-sərvü güldür, ey nigari-gülbədən,

Ya xəyali-qəddü ruyin dideyi-giryan ara?!
Can sevər peykanını, peykanı canı, bilməzəm
Kim salıbdır bunca ülfət can ilə peykan ara.
Etməsin zahid mənə təklifi-cənnət kim, mənim
Sənsiz olmaz xatirim xoş rövzeyi-rizvan ara.
Tökməgə qanımı dəgdi bir-birə müjganların,
Salacaqdır qanım, axır, qanı ol müjgan ara,
Çün visalından olur əğyar, ey məh, naümid,
Mən xoşam gər çıxsa canım möhnəti-hicran ara.
Gizlənib zülfündə könlüm bilmişəm kim, bu sözü
Gözlərin eylər işarət qəmzeyi-pinhan ara,
Mən özüm məhrum, leyk ol mahə əfğanım yetər,
Kaş olaydım, Seyyida, pinhan özüm əfğan ara.

Xoşa ol aşiqə kim məclisində yarı ola,
Visali-yardə fərxəndə ruzigarı ola.
Necə rəfiqi-müvafiqlə əgləşib içə mey,
Nə kəsri məclisi-meydən, nə intizarı ola.
Şərabə olmasa da gərçi nəqd simü zəri,
Şərabxanədə bari bir etibarı ola.
Bu gunə qoymaz idim, zülfüvə əsir olsun,
Əgər əlimdə dili-zarın ixtiyarı ola.
İlahi, bülbülə olsun həmişə gül həmdəm!
Müdam o xəstədilin gülşəni, baharı ola.
Mənim tək olmaya məhrum gülüzarından,
Nə qüssədən ürəgi qan, nə xar xarı ola.
Behiştə meyl eləməz, Seyyidin əgər, ey gül,
Yanında sən kimi bir yari-gülüzarı ola.

Can nə lazımdır, əgər mənzuri-canan olmasa,
Bəsdi cananın xəyalı, qəm degil, can olmasa.
Nəfsi-əmmarə edər tərğib xəlqi zillətə,
Meyli-üsyan etməz idi kimsə şeytan olmasa.
Ey könül, daim elə şeytani-insidən həzər,
Küfrdə Fironi gör, qalmazdı haman olmasa.
Məcməi-əhli-dil olmazdı pərişan dəhrdə,
Gər səbadən türreyi-tarın pərişan olmasa. „
Sureyi-Vəlleyl zülfündür, yüzün Vəşşəmsdir,
Qəm degil aləmdə bundan qeyri quran olmasa.
Seyyida, iyman gətir rüxsari-yarə, bil yəqin,
Hər əməl etsən qəbul olmaz gər iyman olmasa.

Nola xətdən ola gər arizi-dilbərdə qəra,
Ayədən zahir olur müshəfi-davərdə qəra.
Xətin ibraz qılır müshəfi-hüsnün sirrin,
Kim bilər mənini gər olmaya dəftərdə qəra?
Katibi-sün yazıb mehri-rüxün övsafın,
O ki xəlqə gerünür mahi-münəvvərdə qəra.
Kakilin şövqü düşüb başıma, batdım qəmə kim,
Rəsmi-matəmdnr, əzizim, ola kim sərdə qəra.
Qoyma xəttin gələ ayineyi-rüxsar üzrə, ^
Nə rəvadır ola mirati-Skəndərdə qəra.
Əksi-rüxsari-münirin düşəni, ey məhi-tam.
Əsəri-mehr yetirməz dəxi bir yerdə qəra.
Bu qəzəldən genə bir rəmz göründü, Seyyid,
Mətləbin qeyrdir, amma sözədir pərdə qəra.

Nə dəm kim, xəlq ara ol gözləri cəllad olur peyda,
Düşər aləm hərasə, naləvü fəryad olur peyda.

Mənə mey ta xəti-bağdad, ver, ey şahidi-Xülləx
Ki, şami-qəm gözümdən Dəcleyi-Bağdad olur peyda.
O nazə dözməyən dil indi nari-hicrə səbr eylər,
Əcəb kim, mumdən xasiyyəti-fulad olur peyda.
Bu həsrət Xosrovun döndərməsinmi könlünü qanə
Kim, ol şirinləbə hər gündə bir Fərhad olur peyda.
Dolanmazdım əzəldən hiç bu nəxcirgah içrə,
Əgər bilsəydim ol ahuyə bir səyyad olur peyda.
Nə rüxsarın kimi gülzar ara bir gül olur -zahir,
Nə qəddin kimi Kəşmir içrə bir şimşad olur peyda.
hicabi-ismət içrə saxla təbi-bikrini, Seyyid,
Düşər kim, novərusi-nəzmə bir damad olur peyda.

Güzərin düşsə dəri-dilbərə, ey badi-səba,
Yetir ərzim o güli-əhmərə, ey badi-səba!
Güli-cəfər kimi rəngim saralıb firqətdən,
De bu halı o güli-cəfərə, ey badi səba!
Təlxkam olduğumu zəhri-qəmi-hicrindən,
Ərzi-hal et o ləbi-şəkkərə, ey badi-səba!
Tabdən saldı kətan tək bu dili-bitabı;
Neyləmişdim o məhi-ənvərə, ey badi-səba?!
Peykərim peykəri-Cövza kimi, gör, oldu dü nim,
Ver xəbər ol büti-məhpeykərə, ey badi-səba!
Bu qara gün ki, mənim başıma hicrində gəlib,
həq nəsib eyləməsin kafərə, ey badi-səba!
Lalə tək daği-dili-sineyi-suzanımı gör,
Ver xəbər sünbülü susənbərə, ey badi-səba!
Bu Məhəmməd elədi Seyyidi-biyarı, həlak,
Ərz qıl rövzeyi-peyğəmbərə, ey badi-səba!

Bu qədər kim görünür arizi-dilbərdə səfa,
Joxdu jüzdən biri ol Kəbeji-davərdə səfa.
Bu qədər Zəmzəmi tovsif eləmə, ej haci,
Abi-şuri nə qılım, var meji-əhmərdə səfa.
Xəlq derlər ki, səfa joxdu qəradə.-hejhat!
Bəs nədir bunca o gejsuji-müənbərdə səfa.
Zahir əhli nə bilir zövqi-ləbi-mejgunun,
Bəli, hal əhlinə var badeji-Xüllərdə səfa.
Badədən qejri-ərəzdir nə ki var aləmdə,
Cövhəri-fərd budur, var bu cövhərdə səfa.
Getdi ol Kəbeji-ülja nəzərindən, Sejjid,
Dəxi tərki-vətən et, joxdu bu kişvərdə səfa.

İkram edər o gül mənə əğjar janında,
Ta etsin özün sevgili,hər xar janında.
Məqsud -bu kim, mən olam azürdə, rəqibi
Əgləşdirə ol jari-dilazar, janında.
Sordum ki, rəqib ilə oturmaq nədir, ej şux,
Güldü, dedi: gül daim olur xar janında.
Şadəm ki, gözün fikridi pejvəstə könüldə,
Xoşdur ki, təbibi ola bimar janında.
Hər xar nə versin ərəqi-rujüvə qijmət
Kim, qədri gülabın olur əttar janında.
Haşa ki, güli-tər ola rüxsarüvə nisbət,
Gül xarə dönər ol rüxi-gülnar janında.
Gər ol sənəmin zülfi qəmindən ölə Sejjid,
Dəfn ejlədin ol sahibi-zünnar janında.

Xalın qəradı, zülf qəra, gözlərin qəra[1],
Bir ağ gün görərmi olan mübtəla sana?

Biganələrlə çünki olur aşina o gül,
Ey kaş olmayaydım əzəldən mən-aşina.
Müşki-Xəta dedim səri-zülfün, o gül dedi:--
Qanın hədərdi kim, genə sən eylədin xəta.
Yoxdur əgərçi vəchi-kifafım zəmanədə,
Bir şişə badə olsa mənə eylər iktifa.
Bildi cəfalərilə könül şad olduğun,
Tərk eylədi cəfalərin ol yari-bivəfa.
Ey dil, cəfası ilə vəfanın nə fərqi var,
Xoşdur nə eyləsə mənə ol yari-dilrüba.
Seyyid, təğafül eyləmə iksiri-badədən,
Məssi-vücudə lazım olubdur bu kimya.

[İstinad1: Mətlə yoxdur]

Xət yüzün tutdu, dar əbruyi-hilalında şüa,
Gün qürub etdi, hilal oldu əyan, tapdı şiya.
Rumi-rüxsarüvi tutmağə xətü zülf gəlib,
Ya ki, Sudanü həbəş qövmi ediblər icma.
Zöhrəvü şəms nola müştəri olsa o məhə,
Müştərisi çox olur rəsmdi xub olsa məta.
Sizi tarı, deyin, ol mah nə səmtə getdi,
Özümü bilməmişəm yar ilə həngami-vida.
Arizu etməz idim badeyi-Kövsər, Seyyid,
Gər verəydi mənə ol müğbeçə bir cam füqa

Gül qönçəlikdə gərçi olur xarə aşina,
Açsa niqabını olur əğyarə aşina.
Biganələrlə çünki olur aşina, könül,
Kaş olmayaydım ol güli-bixarə aşina.
Guya başında bir güli-alın həvası var,

Bülbül səbəbsiz olmadı gülzarə aşina.
Tökdü, dağıtdı arizə zülfi-siyahını,
Etdi zəmanədə günümü qarə aşina.
Gördüm rəqibə mail olan iltifatını,
Sandım rəqib kim, olacaq yarə aşina.
Cənnət həramım olsun əgər şəkvə eyləsəm,
Öz xahişimlə yaxsa məni narə aşina.
Lakin rəqib pəndin alıb, Seyyida, mənim
Etdi dili-həzinimi sədparə aşina.

Bir əhdüvə sən etmədin, ey bivəfa, vəfa,
Qıldı fərağın ilə dili-binəva, nəva.
Zəmzəm tək oldu kuyüvə əşkim rəvan, rəvan,
Ol Kəbə içrə görmədi əhli-səfa, səfa.
Derdim ləb üstə xal düşübdür qələt, qələt,
Derdim o çini-zülfüvə müşki-Xəta, xəta.
Mən sadəlövhə qıldı o rüxsari al, al,
Qıldı günümü ol səri-zülfi qəra, qəra.
Qıl kuyi-yarə kəştüvi, ey çarəsaz, saz,
Ya rəb, sənə müin ola, ey naxuda, xuda!
Məkr ilə sallama dəxi təhtül-hənək, hənək,
Zahid, büsati-eşqdədir buriya, riya.
Ey çərxi-kəcmədar mənə oldu yar, yar,
Etməz o mahdən məni növki-cida, cida.
Etmə şikəstə Seyyidi, ey badəxar, xar,
Etsin sənə həmişə bu əhli-dua, dua.

Qoymuşdu gər fələk məni həsrət cəmaluva,
Səd-şükr, aqibət ki, yetişdim visaluva.
hicri-rüxündə giryə ilə gəz[1] dolan gözüm,

Baxdı doyunca arizi-fərxəndə faluva.
Artar könüldə şövqi-tamaşayi-arizin,
Baxdıqca həsrət ilə sənin gül çəmaluva.
Qəm çəkmə, ey könül, dəxi eyşü nişat qıl
Kim, oldu çarə möhnətü dərdü məlaluva.
Qorxum budur ki, rəşk edə bu çərxi-kəcmədar,
həsrət qoya məni genə ol xəttü xaluva.
Lütf etmə qeyrə öldürü rəşk, ey pəri, məni,
Düşmə dəxi, amandır, əzəlki xisaluva.
Bil vəsli-yar qədrini, düşməzmi, Seyyida,
Hicrində çəkdigin qəmü möhnət xəyaluva.

[İstinad1:Dəfələrlə]

Qalıbdı sən gedəni xatirim xəyalında,
Dönübdü qanə könül fikri-ləli-alında.
Bu hicrdən məni qurtarmasın, gedim, billah,
Xəyalım olmasa can verməgə visalında.
Səvadə çox baxanın məhv olur gözündən nur,
İnanmazam bu sözə dövreyi-cəmalında.
Ziyad olur gözümün nuru, ey gözüm nuru,
Səbahü şam təmaşayi-xəttü xalında.
Şərabə batmış idi, ləlini nihan gördüm,
Hanı bu zövqü səfa, ey Xızır, zülalında.
həkim naqis imiş, sandı ay üzündə kədər,
Görüb nigah əsərin ruyi-məh misalında.
Sənə bu rəmzi-nihan, Seyyida, degilmi cavab,
Dəhanın açmadı ol gül sənin sualında.

Nə qədər gər ola bu çərxi-cəfacudə bəla,
Olmaz ol qədr ki, var ol büti-bədxudə bəla.

Nə bəlalər gətirir başıma çeşmin, ja rəb,
Nə qədər var imiş ol nərgisi-cadudə bəla.
Xətü xalü səri-zülfündən olub qan könlüm,
Kim görübdür bu qədər ləşkəri-hindudə bəla.
Mərdümi-didələrim rəncədi əşk içrə müdam,
Rəsmdir, kim ki qəriq olsa çəkər sudə bəla.
Ej könül, zülf ilə əbrusuna mejl etmə ki, var
Çini-zülfündə xəta, ol xəmi-əbrudə bəla.
Tapacaqdır məni hər jerdə kim, olsam guja,
Olmasam mən, qalacaqdır qəmu qajqudə bəla.
Görməmək jarı bəla, görməgi qejr ilə bəla,
Sejjida, düş, jıxıl öl, o da bəla, bu da bəla!

Zahid ki, atdı səngi-cəfa mej səbusuna,
Tanrı jetirməsin onu öz arizusuna.
Abid qaşın xəjalı ilə sərsəm ejləjib,
Mehrab içində bir bax onun göftügusuna.
Öz suzəninə rişteji-Mərjəm qılıb təraz,
Gəlmiş Məsih zəxmi-dərunum rüfusuna.
Abi-həjat özündədi Xızrın, nəzarə qıl
Zülmati-qəmdə hər jan onun cüstücusuna.
Olmaz qəbul, taəti münkərdi, zahidin,
Jüz gunə diqqət ejləsə abi-vüzusuna.
Rizvanü hur əldə gəlib şişeji-gülab,
Ej gülbədən, şəhidi-qəmin şüstüşusuna.
Çox da şikajət ejləmə Sejjid, sipehrdən,
Dilxahi üzrə kimdi jetən arizusuna.

Verməṅəm könlümü bir dilbərə bundan sonra,
Olmanam aşiq o siminbərə bundan sonra,

Aldı iymanımı əldən, məni bidin elədi,
Aşina olmanam ol kafərə bundan sonra.
Oxşayır mahi-fələk çünki üzari-yarə,
Baxmanam mən bu məhi-ənvərə bundan sonra.
Badənin ləli-ləbi-dilbərə çün nisbəti var,
Tökmənəm badəni mən sağərə bundan sonra.
Ənbərin zülfüvün ol qədr ziyanın deyərəm,
Kimsə rəğbət eləməz ənbərə bundan sonra.
Dəxi ol sərvqədin kuyinə cənnət deyibən
Gəzmənəm küçələri heyvərə bundan sonra.
Etmənəm zülfüvün ovsafını, şair deməsin
0 pəri Seyyidi-qəmpərvərə bundan sonra.

İnfiali-xətti-ruyindən tutuldu afitab,
Ləblərin görçək qızardı xiclətindən ləli-nab.
Hər günüm hicrində, ey məh, bir qiyamət tək keçər,
Bimürüvvətlikdir olsa bunlar ömrümdən hesab.
Novbahari-hüsnü etdikçə tərəqqi ol məhin,
Şərm edib hər gün uzaq yerdən dolanır afitab.
Olsa mərdümdən nihan gər nuri-çeşmim, həqqi var,
Xətti müşkin ol gözü ahuyə artırmış hicab.
Zülfün oldu bais, ey gülrux, Həlaki-Seyyidə,
Ari, ari bu məsəldir kim, iza kanəl-ğürab.[1]

[istinad1: qarğa rəhbər olsa [zəlalətə aparar]]

Qəm çəkməyin bu gün ki, qürub etdi afitab,
Yüz afitab üzündən açıbdır bu gün niqab.
Rüxsari-yar çeşmdə, var əldə cami-mey,
Qəm yoxdu gər qürub edə yüz mahü afitab.
Ya rəb bu günkü məclisimiz xoş keçir bizim,

Bu məclisi-məhəbbətə göstərmə inqnlab.
Yar ilə kim, bu gün içirəm badə, ey Xızır,
Billah, gözümdə abi-bəqadır dəxi sərab.
Mey kimi ru-güşadə ikən ol pəricəmal,
Artırdı xətti yüzdə o məhruyə yüz hicab.
haci, Əli məhəbbətinə getmə Kəbəyə,
Meyxanəni təvaf elə kim, bundadır səvab.

Nisfi-şəbdə istəsən kim, çıxsın ey məh, afitab,
Dur ayağə camə tök ta sübh minadən şərab.
Şöləvər qıldım ki, ahimdən məgər yansın rəqib,
Bəxti-bəd gör kim, özüm ol şölədən oldum kəbab.
Çərxi-kəcrovdən məgər təlim alıbdır kim, salıb
Rişteyi-ümmidimə hər ləhzə zülfün piçü tab.
Bəs nədən peykanları çeşmimdə oldu ləlgun,
Ey deyən kəs kim, sədəf baranı eylər dürri-nab.
Gün ki, hər saət girib bir əbr ara pünhan.olur,
Vəchi oldur kim, salıb mahim bu gün üzdən niqab.
Zahidi küfr öylə tutmuş düşməz iman fikrinə,
Gər yüzün vəsfində, ey məh, kökdən ensə yüz kitab.
Badəni tutdu bərabər ləlinə Seyyid bu gün,
Vacib oldu eyləmək ol biədəbdən ictinab.

Etməz həya, düşər ruxi-dildarə afitab,
Eylər qara günüm bu üzü qarə afitab.
Gördüm səhər düşüb dəri-dildarə zərrəvar
Sandım rəqib olubdu məni-zarə afitab.
Ol afitabım eşqi ilə biqərar olub,
Bica degil düşər dərü divarə afitab,
Derlər ki, afitab budur, ol sitarədir,

Dursa müqabil arizi-dildarə afitab.
Laf etməsəydi arizi-yar ilə hüsndə,
Məhşərdə daxil olmaz idi narə afitab.
Ay kəsməyibdi gün qabağın, bu degil küsuf,
Aşiq olubdu bəs ki, o rüxsarə afitab.
Eynək qoyubdu çeşminə mahi-münirdən,
Eylər nəzarə. xətti-rüxi-yarə afitab.
Öz Zöhrəsilə mahimə bir müştəri olub,
Hər gün çıxar sipehrdə bazarə afitab.
Seyyid, ümid mərhəməti kəsmə yardən--
Kim, tərbiyət verir gülə, həm xarə afitab.

Arizi-pakindi, ey nuri-xuda,ümmül-kitab,
Mahrüxsarım, bu yüzdən bir vərəqdir afitab.
Yetdi çün xaki-Mədinə məqdəmindən dövlətə,
Oldu virdi-asiman: ya leytəni küntü türab[1].
Ta niqab oldu sənin rüxsarüvə zülfi-siyah,
Afitab oldu nihan, hətta təvarət bilhicab. [2]
Əlləməl-əsmadə[3] oldun sən müəllim Adəmə,
Eyləyib İdris səndən dərsi-hikmət iktisab.
Qaibəm səndən, vəli könlüm sənin yanındadır,
Halıma şamil degildir nükteyi- mən ğabə ğab. [4]
Sən ki, şəhri-elmsən, ol şəhr babı Mürtəza,
Babiyəm ol babə mən övsaf qıllam bab-bab.
Yandı Seyyid şöleyi-nari-fəraqından sənin,
Qoyma kim, yansın onu duzəxdə, ey alicənab.

[istinad 1: Ey bizi yaradan, məni torpaq et].
[istinad 2: Örtükd» gizləndi]
[istinad 3: Adları (əşyanı) öyrətməkdə]
[istinad 4: Qeyb olan qeyb oldu (ölən öldü) ].

«Rəbbi, ərni», sö ylədim, saqi mənə qıldı itab,
Nagəhan qıldı təcəlla Turi-sağərdən şərab.
Şəşəati-nuri-sübhani  göründü badədən,
Kim onun bir zərrəsi olmazdı mahü afitab.
Mən dua qıldım, mənə düşnam verdi dilbərim,
Müstəcabüddəvə yəm, oldu duamız müstəcab.
E y xəti müşkin, xəti-re yhan ilə cədvəl çəkib,
 Gülsitani-hüsnün övsafını yazdım bab-bab.
Bu  gecə xab içrə ol zülfi-si yahı tutmuşam,
Var  günahım, e y si yəhxət, qanımı tök, qıl səvab
Dövri-xəttindir nola pe yvəstə  gəlsəm ku yüvə.
Şami-tirə e yləməz sail sualından hicab.
Se y yida, tutdu xəti-müşkin üzarın ol məhin,
Leyli-müzlim basdı afaqı, tutuldu afitab.

Olsa nəzzarəsinə ol məhin üşşaqdə tab,
Zülfi-şəbrəngini rüxsarinə e ylərmi hicab?1
Kişvəri-eşqdə təmir ilə abad olmaz,
Ta könül olmasa se ylabi-sirişk ilə xərab.
Dane yi-xalüvə dil verdi könül mürğü, xoşam
Ki, yanıb atəşi-hicranın ilə oldu kəbab.
Duzəx əhlinə  gələr atəşi-duzəx cənnət,
Versələr onlara  gər möhnəti-hicrinlə əzab.
Nə səadətdi bu kim, küşte yi-tiği-sitəmin,
Şühəda silsiləsindən sa yılır ruzi-hesab,
Sitəmindən su yerinə qan axar, e y zalim,
Ona şahid tökülən didələrimdən xunab,
Tak a yağında olan xakə tamaşa e ylə,
Cam içində  görünür, indi olub ləli-müzab.
Se y yida, e ylə Şəki mülkünə əlbəttə rəvan,
Bu qəzəl  gərçi degil  göfte yi-Nakamə cəvab.

Görəsən kim nə imiş  hörməti-səhbayə səbəb
Ki, həram etdi bu can cövhərini Şahi-Ərəb.
Məstlikdir səbəbi- hürməti gər səhbanın,
Qeyri-səhba dəxi bu məstligə çoxdu səbəb.
Var ümidim ki, nəsibi ola abi-kövsər,
Rəznişanlıqda ki, dehqan bu qədər çəkdi təəb.
Meyvəsi oxşamasaydı ləbinə dildarın,
Bağban  əkməz idi bağdə bir nəxli-rütəb.
 Ürəgim qan, sirişkim meyi-gülgunə dönər,
 L əbi-innabinə  hərdəm ki, dəgə mai- ənəb.
Udü səndəl nə gərək, nəkhəti-zülfün xoşdur,
Gülrüxüm mən degiləm dəhrdə həmmali- hətəb.
Seyyida, qoymaz idi şaxi-gül üstə qədəmin,
Bülbüli-məstdə olsaydı  əgər rəsmi- ədəb.

Qəmzə peykanın çəkib  hərdəm bizə, ey nuşləb,
Bisəbəb qan tökmək istərsən, nədir axır s əbəb?
Vaiza, meykəşlərə daim qəzəbdir adətin,
Qorx o gündən kim, sənə piri-müğan eylər qəzəb.
Eşqdə bidərdlər eylər təəccüb  halıma,
Yoxsa bu kişvərdə bir dərd  əhli yoxdur, büləcəb»
G özlərin, ey səngdil, sındırdı könlüm şişəsin,
Məstlər bəzmində olmazmış müraati- ədəb.
Dəhr ara bir gül yetirdim, dərdi gülçin aqibət,
Kamə yetdi bitəəb- əğyar, mən çəkdim təəb.
Gahü gər dil istəyir busə üzündən, vəchi var,
 Öz fəqirindir ki, quti-layəmut eylər tələb.
Mütriba, l əhni- hicaz ilə sürudun saz qıl,
Ta Məhəmməd eşqinə Seyyid bu şəb etsin tərəb.

Çıxır can cismdən, bir dəm yetir cananımı, ya rəb
Görüb rüxsarını təslim edim bu canımı, ya rəb!
Görüb rüxsarını nəzr etmişəm kim, can edim qurban,
Yetir yarı, qəbul eylə mənim qurbanımı, ya rəb!
Təni-zarımdan al ya, ey xuda, bu cani-naşadı,
Mübəddəl qıl visali-yarə ya hicranımı, ya rəb!
Tənuri-pirəzəndən bədtər oldu çəşmi-xunpaşım,
Cahan qərq oldu, sakit eylə bu tufanımı, ya rəb!
Tökəydi qanımı, azad olaydım dərdi-hicrandan,
Gətir bir rəhmə ol bidadgər sultanımı, ya rəb!
Ümidim var kim, görsə fəğanım rəhm edə dilbər,
Yetir ol mahi-bimehrə mənim əfğanımı, ya rəb!
Tutub xət ruyin, oldu fitneyi-dövri-qəmər peyda,
Xətadən hifz qıl bu SeYYidi-nalanımı, ya rəb!

Ləbi-ləlində xəs, ey mehri-səma, gerdüm əcəb,
Ləldə xasiyəti-kahrüba gördüm əcəb.
Görəsən ki, o kimin dəhrdə torpağı imiş,
Xak olandan sonra, mən kahrüba gördüm əcəb.
Rəgi-ləl oldu nümayan o ləbi-tərdə məgər,
Rəglərim nalə qılır, şurü nəva gördüm əcəb.
Olmadı yar yanında xəscə miqdarım,
Ləbi-dilbərdə xəsə zövqü səfa gördüm əcəb.
Öpdü xəs ləli-ləbi-yarı, mən oldum məhrum,
Cigərim qanə dönüb dərdü bəla gördüm əcəb.
Verdi dil kakili-pürpiçinə ol müşk-xətin,
Seyyidi başdan özüm bəxtiqəra gördüm əcəb.

Oldu sünbüllər xəcil zülfi-pərişanın görüb,
Qönçələr qan oldular ləli-dürəfşanın görüb.
Yusifə zindan təmənna oldu mehrindən sənin.
Aləmi-zərratdə çahi-zənəxdanın görüb.
Bağban hər gündə bir sərvin qopardır bağdən,
Ta kim, ey ruhi-rəvan, sərvi-xuramanın görüb.
Guylər tək əşki-gülgunum olur hər yan rəvan,
Əldə çövkan, ərsədə Rəxş üzrə cövlanın görüb
Qoy ölüm, axır nəfəsdir, gəlmə nəşim üstə, ta
Qeyrlər mərg etməsin xahiş, bu ehsanın görüb.
Zəxminə mərhəm təsəvvür etdi tiri-Rüstəmi,
Əşkəbus, ey qaşı yay, sinəmdə peykanın görüb.
Qönçə tək yüz pirəhən çak etdi, ey gül, rəşkdən
Seyyidi-xunincigər çaki-giribanın görüb.

Arizi-alın o şuxun xəti-reyhanı tutub,
Sünbüli-tər genə bu səhni-gülüstanı tutub.
Xət gəlib ruyinə, Rum içrə düşübdür qovğa,
Ləşkəri-hindü həbəş kişvəri-sultanı tutub.
Dəşti-Qıpçağı tutubdur Qaraqeytaq əhli,
Ya ki, ol xətti-siyəhdir rüxi-cananı tutub.
Təlxkam olsan əgər, var yeri, ey tutiyi-dil,
Ləşkəri-murü məgəs bu şəkəristanı tutub.
Xət degil səfheyi-ruyində o xurşidrüxün,
Zilli-məxruti zəminin məhi-tabanı tutub.
Rüxi-yar üzrə düşən zülfi-siyəhdir, ya kim,
Pəri-Cibrili-əmin səfheyi-quranı tutub?!
Dəhəni-dilbərə dil meyl eləyib, qanə dönüb,
Əcəb olmuş, neyə məndən bunu pinhanı tutub?!
Saralıb rəngi-rüxün, ləblərüvün qanı qaçıb,
Səni, ey lalərüx, aşiqlərüvün qanı tutub.
Belə məlum gedib Seyyidin əldən o gülü,
Bülbüli-zar kimi aləmi əfğanı tutub.

Olur qədim xəm o məhruyi biniqab görüb,

Necə ki, səcdə edər hindu afitab görüb.
Görüb könül açılır əldə tiği-bürranın
O növ kim, açılır təşnə könlü ab görüb.
Fəğanə gəlmə, könül, çəkdi yar şəmşirin,
Məbadə əl çəkə qətlimdən, iztirab görüb.
Xəyali-qəmzən ilə şərhə-şərhə oldu cigər,
Nolur gözün tökə qanımı,bir səvab görüb.
Sanıb nə görsə səni dil, yorur o təşnələbi
Ki, su deyib yügürür hər tərəf sərab görüb.
Keçib zəmani-visal, indi hicrdə halım
O şəxs təkdi ki, nagəh oyanə xab görüb.
Demin ki yarə, edib Seyyidi zəmanə zəlil,
Məbadə könlü yana, halimi xərab görüb.

Tutdu bir ayinə kim, gör surətim, ol da, firib,
Yar ilə ayinədə öz əksimi sandım rəqib.
Baği-hüsnün dərdilər eşq əhli şəftalusunu,
Mən ki, bimarəm gərək sibi-zənəxdanın nəsib.
Sənsiz, ey gül, hur ola, bir kəslə ülfət tutmaram,
Ol səbəbdən olmuşam dünyadə hüsnün tək qərib.
Çarəyi-dərdimdə zəhmət çəkməyin, ey dustlər,
Dərdi-eşqə çarə olmaz, olsa Əflatun təbib.
Vəsldən düşdum cüda eyb etməyin əfğanımı,
Ağlamazmı fəsli-gül ayrılsa güldən əndəlib?
Mən necə səbr eyləyim ol Yusifim hicranına,
Ey əzizan, etməyib hicranə peyğəmbər şəkib.
Eşqə düşdüm kəsdi məndən ülfətin əhbablər,
Ya həbibullah, dəxiləm, Seyyidə sənsən həbib.

Ol ahu gözlü, deyirlər, bu gün şikarə gedib,

Alıbdı səbrü qərarimi aşikarə, gedib.
Gedib şikarə bu gün ol qəzali-mişkinmu,
Aparmayıb itini bilmirəm nə karə gedib.
Gəlir mənə bu qəmin hər dəqiqəsi bir ay,
Bu gün o mah ki, bu şəhrdən kənarə gedib.
O şəh fərağı mənə rüx veribdi mat oldum,
Vəziri-əql düşüb dərdə, ol səvarə gedib,
Bu gün mənim gözümə afitab tar gəlir,
O zülfi qarə günümü edibdi qarə, gedib.
Gedib o qaşı kaman qeyrilə şikarə bu gün,
Xədəngi-hicri vurub xatirimə yarə, gedib.
Olubdu qaib o mahın behişt rüxsarı,
Salıbdı Seyyidini aşikarə narə, gedib.

Bu naməni ki, yari-dilaram göndərib,
Canə sürur, könlümə aram göndərib.
Kafurə sehr ilə eləyib müşkdən rəqəm,
Sübh üzrə ya ki, nəqş qılıb şam göndərib.
Bu namə ilə canə verib sərfərazlıq,
Nakamü zar könlümə bir kam göndərib.
Öz aşiqi-şikəstədilü biqərarına,
Ol namə ilə bir neçə peyğam göndərib.
Bilmiş günüm fəraqı ilə qarə olduğun,
Dərdü qəmü fəraqə sərənçam göndərib.
Etmiş visalə Seyyidi-zarın ümidvar,
Öz mübtəlası könlünə aram göndərib.

Bu gələn kimdi ki, yüz vəlvələ Şirvanə salıb,
Qulğülə, hüsnü onun, aləmi-imkanə salıb.
Qızarıb arizi-ali güli-tər tək meydən,

Açıban ruyini eşq əhlini yüz qanə salıb.
Kimdi bu arizi xurşidi-dirəxşan ki, bu gün
Xunlər ləli-ləbi kuhi-Bədəxşanə salıb.
Bu əzizə neçə Yusiflər olub zarü əsir,
Hansının könlünü ol çahi-zənəxdanə salıb?
Dövri-ruyini tutub ləşkəri-xətti-siyəhi,
Mürlər rəxnə, məgər, mülki-Süleymanə salıb!
BUNA  Mahmud deyim, bilməyirəm ya ki. Əyaz
Cəzbeyi-eşqini bu xatiri-sultanə salıb.
Görməmiş Seyyidi-sərgəştə o şəmi-hüsnü,
Bu əcəbdir ki, özün atəşi-suzanə salıb.

Maşallah, bu gözəl kimdi ki, Şirvanə gəlib,
Ləbini mürdeyi-sədsalə görüb canə gəlib.
Həmdlər xaliqi-bimislə ki, Şirvanı genə
Salmağa tazədən ol müğbeçə samanə gəlib.
Meydə yox ləli-ləbində olan asari-səfa,
Sanma ki, gərdişə hərgiz belə peymanə gəlib.
Vərəqi-arizi-alın görüb ol lalərüxün,
Bağ ara bülbüli-şeyda genə əfğanə gəlib.
Demərəm adını mən, bax səri-hər beytə, bu gün
Bilisən Seyyid, özün kimdi ki, Şirvanə gəlib.

Ey könül, məscid yolun tərk et, rəhi-meyxanə tut.
Tutma əldə zahidin təsbihini, peymanə tut.
Zahidü məscid təmənnasın çox etmə, ey könül,
Zahidi bir cüğd bil, həm məscidi viranə tut.
Xublər zülfündə görsən bu pərişan könlümü,
Boynu bağlanmış, onu, zəncirə bir divanə tut.
Ol məhi-namehriban istər ki, zülfün darəsin,

Sən götür ayinə, ey gün, ey qəmər ,sən şanə tut.
Can verib cananə, yan şəmi-rüxündən dilbərin,
Gər kəmal istərsən, ey dil, şiveyi-pərvanə tut.
Xublər eşqində gör şimdi mənim rüsvalığım,
Qisseyi-Fərhad ilə Məcnunu bir əfsanə tut.
Girmə sən məscidlərə namərd zahidlər kimi,
Seyyida, meyxanədə peymanəni mərdanə tut.

Könül olubdu fərağında biqərar, ey dust»
Neçin məni elədin zarü dilfikar, ey dust!
Ümid əlim üzülüb daməni-visalından,
Sənə bu növ degildim ümidvar, ey dust!
Binayi-taqətimi seyli-ğəm xərab etdi,
Bu qədr gözlərimi etmə əşkbar, ey dust!
Visaldə neçə gün xoş keçirdi əyyamım,
Həsəd apardı bizə çərxi-kəcmədar, ey dust!
Nə sən fəraqə səbəb olmusan, nə mən bais,
Bu dərdə saldı bizi dövri-ruzigar, ey dust!
Səni vəfalı bilib eşqinə könül verdim,
Pəriliqalərə olmazmış etibar, ey dust!
Olan nə lütf idi, ey gülüzar, bu nə cəfa,
Tərəhhüm et, məni öldürdü xar-xar, ey dust!
Səni qəsəm verirəm ol kərimi-zişənə,
Bəyan qıl mənə könlündə hər nə var, ey dust!
Fəda olum sənə, Seyyid sənin qulamındır,
Bu qədr zillətə etmə onu düçar, ey dust!

Ey xəstə könül, əzmi-səri-kuyi-nigar et,
Ol kuydə can nəqdini cananə -nisar et.

Mahi-rüxi-canan xət ilə oldu siyəhgun,
Gün keçdi, könül, gəl dəxi fikri-şəbi-tar et.
Peymanəni sındırmaya ta səngi-Həvadis,
Mey şişələrin dövrənə, ey dust, həsar et.
Cəhd et olasan vəsvəseyi-əqldən azad,
Məcnun kimi seyr etməgə səhrayə güzar et.
Məsciddə həsiri eləmə aləti-təzvir,
Mərdanə qədəh tut, bu riyadən dəxi ar et.
Mənzurun əgər aləm ara kəsbi-ziyadır,
Bir mahrüxün tut ətəgin, busi-kənar et.
Ey Seyyid, əgər həşt-behişt isə muradın
Aləmdə, yeri, peyrəviyi-həştü çəhar et.

Nola dil bilməsə rəmzi-rüxi-cananı dürüst,
Kimdir ol kəs ki, bilə məniyi-quranı durüst.
Sünbüli-zülfün o gül etsə şikəstə üzünə,
Qalmaz əhli-vərəin din ilə iymanı dürüst,
Bülbül övsafi-rüxün qıldı məgər gülşəndə,
Qalmadı bağdə bir qönçə giribanı dürüst.
Qönçənin könlü bütün, leyk yox əhdində vəfa,
Bülbülün qəlbi sınıq, etdigi əlhanı dürüst.
Dura bilməz üzüvə mah müqabil bir gün,
Ayda yüz dəfə əgər kim, ola nöqsanı dürüst.
Bir gecə hüsnüvə oxşatdı özün Ay, odu kim,
Elə bir yanı şikəstə olu, bir yanı dürüst.
Demə, Seyyid, ki şikəst eylədi peymanını yar,
Hiç bir yar olurmu ola peymanı dürüst?

Yar eyləsə üşşaqi-diləfkarə ədavət,
Mümkün degil aşiq eləsin yarə ədavət.
Gər qanımı içsə mənim ol dilbəri-xunxar,

Mən kafir olum, etsəm o xunxarə ədavət.
Xar etmə məni hicrin ilə, ey gülü-bixar,
Gülşəndə haçan gül eləyib xarə ədavət?!
Səlmanınam, ey Əhmədi-Muxtari-zəmanə,
Səlman eləməz Əhmədi-Muxtarə ədavət.
Bir kərrə ədavət eləsəm mən sənə, ey gül,
Yüz kərrə edim Heydəri-Kərrarə ədavət.
Bülbül gülə eylər gilə, ey novgüli-rəna,
hərgiz eləməz gülşənü gülzarə ədavət.
Yandırdı gecə şəmi-şəbistan pərü balın,
Pərvanə haçan etmiş idi narə ədavət?
Könlümə dolub mehrin, ədavət yeri yoxdur,
Tək sən eləmə Seyyidi-biyarə ədavət.

Əğyarı ki, gördüm eləyir yarə məhəbbət,
Minbəd gərək mən edim əğyarə məhəbbat.
Gər yar üçün əğyarı tutum dust, nə eybi,
Gül xatirinə eyləmişəm xarə məhəbbət.
Zülfi-siyəhi-yarə şəbih olduğu yüzdən
Daim qılıram rişteyi-zünnarə məhəbbət.
Gər meylim ola şəmi-rüxi-yarə, nə nəqsi,
Adətdi ki, pərvanə edər narə məhəbbət.
Qurbandı dilü can səgi-kuyinə o mahın,
Möminlər edər, rəsmdi, zəvvarə məhəbbət.
Xət gəldi ruxi-yarə, füzun oldu məlalım,
Axır günümü eylədi gör qarə, məhəbbət.
Seyyid, o siyəh zülf mənim oldu tənabım,
Mənsur kimi çəkdi məni darə məhəbbət.

Könül, vurub başuva tişə növhə bünyad et,
Savabın ol əməlin vəqfi-ruhi-Fərhad et.

Qulami-kakilinəm, məndən ar edirsən əgər,
Çevir məni başuva, sərv-qəddim, azad et.
Könül səraçəsini vermişəm sənə, ey eşq,
Dilərsən eylə xarab, istər isən abad et.
Cəfavü cövrünə müxtəsdir mənim fərəhim,
Get, özgələr ürəgin lütfün ilə sən şad et.
Könül, genə sənə həmdəmdi Kuhkən, billah,
Üzün tutub tərəfi-Bisütunə fəryad et,
Görüb cəfasını ta qeyr tərki-eşqin edə,
O mahparəni, ey dil, cəfayə mötad et.
Keçən gecə yuxuda, Seyyida, mənə Məcnun
Dedi ki, sureyi-«Vəlleyl» oxu, məni yad et.
*/

/*
Dönər rəyimlə kim, bir dəm bu çərxi-kəcmədar əlbət,
Olur tədbirimə bir gün müvafiq ruzigar əlbət.
Gətirdin, ey könül, zarə məni sən ahü zarınla,
Çəkər ol dilbəri-bimehr tiği-abidar əlbət.
Yaxırsan cismi-zarım atəşi-ahınla hər saət,
Gəlir mövcə, könül, dəryayi-çeşmi-əşkbar, əlbət.
Xəyali-zülf ilə hər şam dil yüz piçü tab eylər,
O bəxti-qarənin, ey mah, bir məqsudu var əlbət.
Nə baxmaqdır mənə, ey müddəi, çeşmi-həqarətlə,
Olur gərduni-dunun gərdişindən yar, yar əlbət.
Meyi-külfamdən  zahid sözilə eylədin tövbə,
hələ səbr eylə sən, Seyyid, gəlir fəsli-bahar əlbət.
*/

Nə tutmuşsan, könül, qürbət diyarın, əzmi-Şirvan et
Tamaşayi-rüxi-yar ilə seyri-kuyi-canan et.
Nə olmuşsan giriftari-qəfəs, ey tayiri-qüdsi,
Çıxıb bu damdən pərvaz qıl, seyri-gülüstan et.

Təəllüq aləmindən əl götür, təcrid qıl hasil,
Məsiha tək məqamın xaneyi-xurşidi-rəxşan et.
Könül ver bir nigarə, fariq ol dünyavü üqbadən,
Pərişanlıq binasın eylə viran, fikri-saman et
Əgərçi çoxdu Şirvan içrə ziba şuxlər, Seyyid,
Bəli sən canuvi şövq ilə İsmailə qurban et.

Eylədi vəsf könül arizi-cananı qələt,
Oxudu tifl bu məktəbdə «Gülüstanı» qələt.
Sandı güldə tapılır nəfxeyi-zülfi-siyəhin,
Etdi hər fəsldə dil seyr bu bustanı qələt.
Səfheyi-arizinə katibi-qüdrət o gülün,
Biməqam etdi rəqəm ol xəti-reYhanı qələt.
Sandılar kim düri-dəndanına.həmtay olur,
Saldılar məğlətəyə gövhəri-qəltanı qələt,
Bağdə açdı yüzündən o güli-tazə niqab,
Çaşdırıb bülbül özün, eylədi əlhanı qələt.
Qaşların «nuni-qələm», zülfünü «Vəlleyl» dedim,
Dedilər kim, oxudun ayeyi-quranı qələt.
«Qab-qovseyn» oxudum əbruyi-yarı, Seyyid,
Vay o gündən ki, müfəssir verə mənanı qələt.

Ta ki, gəldi əbr tək rüxsari-mahi-yarə xət,
Ruzgarım eylədi ol zülflər tək qarə xət.
Atəşin rüxsarə xəttin gəldi könlüm almağa,
Rəsmdir əhli-əzaim kim, salırlar narə xət.
Gülsitani-kuyi-dilbər vəsfinin inşasına,
Katibi-qüdrət yazıb reyhan ilə gülzarə xət.
Gəldi xət rüxsarına, üşşaqə dəgdi yarələr,
Görməmişdim kim, bu sirri qəlbə vursun yarə xət.

Əşki-gülgundur midadım, xameyi-mücgan ilə
Yazdım, ey gül, şami-hicrində dərü divarə xət,
Xətti gəlcək qətli-amə açdı əl ol gül, məgər
Hüsn sultanı yazıbdır qətl üçün sərdarə xət.
Qarə olsun ruzigarı xətti-yarın mən kimi,
Tirə etdi ruzigarım, Seyyida, ol qarə xət.

Kim ki, ağzın qönçeyi-xəndan güman eylər, qələt,
Ləli-nabın çeşmeyi-heyvan güman eylər, qələt.
Hansı gündən vaqifi-əsrari-qeyb oldu həkim,
Gər dəhanın nöqteyi-pinhan güman eylər, qələt.
handa görmüş, ya eşitmiş -bağbani-ruzigar,
Kakilin gər sünbülü reyhan güman eylər, qələt.
Yusifi bir zərrə hüsnün qıldı məşhuri-cahan,
El səni gər Yusifi-Kənan güman eylər, qələt.
Hər mərəzdə var təbibin şöhrəti, amma əgər
Dərdi-eşqi qabili-dərman güman eylvr, qələt.
Talibi-dünya olan dünyadə qalmaz müttəsil,
Aləmi gər mülki-cavidan güman eylər, qələt.
Hiç söz yox şeyxi-şəhrin qüvveyi-təşxisinə,
Seyyidi gər qabili-ürfan güman eylər, qələt.

Ey  zülfi-tabdardə rüxsarı guyi-ac,
Sən hüsn şahı, kakili-müşkin başında tac.
Bir nim qəmzə bəsdi könül şəhrin almağa,
Üz vermə, üzdə xətti-siyahə yox ehtiyac.
Sənsən o mahi-bürci-məlahət ki, dəhrdə
Yusifdən aldı şəhneyi-hüsnün xəracü bac.
Düşmüş gəzər dalımca, uşaqlar, əlində daş,

Səd şükr kim, mətai-cünunum tapıb rəvac.
Bildi məgər təbib ki, bimari-çeşminəm,
Eylər həmişə rovğəni-badam ilə əlac.
Hər tarı bir tikan təki cismimə sancılır,
Dibac olsa xəsteyi-eşqə əgər dəvac.
Gəl ey Məsih, lütflə bir gün əyadətə,
Seyyid həvadis ilə olub münqəlib-mizac.

Mən həkimi-ruzigarəm, dəhrə hökmümdür rəvac,
Əyyühənnas üşrübü xəmrən ləküm minhül-ilac.[1]
Gənc-istiğna üçün xurşidi-sağərdir dəlil,
Sirri-rövşəndir bu, istidlalə yoxdur ehtiyac.
Şahlıq tac ilə olmaz, əldə Cami-Cəm gərək,
Yoxsa vardır, ey pərivəş, hüdhüdün başında tac.
Xar tutma əhli-eşqi, ey əzizim kim, düşüb--
Yusifin bazarına eşqi-Züleyxadən rəvac.
Canım aldın, alma peykanın dili-suzandən,
Rəsmdir kim, şahlər viranədən almaz xərac.
Tərki-mey əmrilə qəmnak etmə, ey vaiz, bizi--
Kim, məzaqi-canımız meydən tapıbdır ibtihac.
Ərrəhil, ey zayirani-beyti-paki-meykədə--
Kim, bu gün ol Kəbəyə Seyyid olubdur miri-hac.

[istinad 1: Ey insanlar, şərab için ki, sizin dərdinizin dərmanı olsun].

Münqəlib oldu həvadislə məni-zarə mizac,
Ey Məsihanəfəsim, qıl məni-bimarə əlac!
Rövşən et xanəmizi bir gecə təşrifinlə,
Ey cəmalı fələki-hüsnə siraci-vəhhac.
Abi-Kövsər ləbi-şirininə nisbət, guya
Biridir əzbi-Fəratü biridir milhi-Ücac.

Tutmusan dəhrdə, sən hiç müsəlmanın əlin?
Etməsin tarı sənə-kafəri, ya rəb, möhtac.
Şəm pərvanəni yandırmaz idi, amma sən
Yandırıb aşiqi, etdin bunu aləmdə rəvac.
Ləşkəri-Zəngü həbəş tutdular ətrafi-rüxün,
Dəxi müşküldü bu gün Kəbəyə-getsin hüccac.
Daneyi-kəndümi-xalinə təmə eyləmə kim,
Seyyida, cənnəti-kuyindən edərlər ixrac!

Ey qoyan başına izzətlə «ləəmrük»dən tac,
Şahsən, feyzinə məcmueyi-aləm möhtac.
Zati-pakindi sənin vasiteyi-ərzü-səma,
Arizin pərtövüdür göydə siraci-vəhhac.
Qabi-qovseyn o kəman qaşlaruvun ovsafı,
Ey xədəngi-səfi-mücganına canlar amac.
Görünən çərxdə hər ayda degildir məhi-nov,
Əsəri-nəli-Büraqindi zəmani-merac.
Çarəsi şərbəti-göftari-şəkərbarındır,
Ola bir kəsdə həvadisdən əgər sui-mizac.
Rüsuli-sabiqə səndən yetişib izzü şərəf
Necə kim, sikkə ilə sim bulur qədri-rəvac.
Öz rəhi-şərini qıl Seyyidə qismət kim, olub
Müxtəlit əzbi-Fərat ilə bu gün milhi-Ücac.

Şəbi-vəsl olsa o məhdən mənə bir cam bərat,
Yegdir ondan ki, şəbi-Qədrdə yüz min həsənat.
Ölümümdür mənim ol ruhi-rəvansız bu gecə,.
Gər içəm badeyi-gülgun yerinə abi-həyat.
Sərvi pəst etdi qədin bağdə cövlanə gəlib,
Bu nə rəftardır, ey dilbəri mövzunhərəkat?

Demə kim lüknəti var, bəs ki ləbi şirindir,
Yapışır ləblərinə hiyni-təkəllüm kəlimat.
Cami-mey təşnəsiyəm, qoymaz içim zahidi-dun,
heyf ki, düşdü bu zalım əlinə abi-həyat.
Can verəndə oxuyun nəğməni quran əvəzi,
Qəbrim üstundə verin ruhuma meydən xeyrat.
Seyyida, sən get oxu sidq ilə quran, ki mənim
Əzbərim mimi-Məhəmməddi, şüarım sələvat.

Mücdə, ey dil, gələcək bu gecə canan-xəlvət;
Verəcək qalibi-biruhumuza can xəlvət.
Mərdümi-didə xəyal ilə həmağuş olmuş,
Sanki Bülqeysə edib sərh Süleyman xəlvət.
Sinəmin dağlərin mən necə pinhan qılım,
Olumu, padşəhim, hiç çırağan xəlvət.
Xət gəlibmiş demə rüxsarına ol sim-tənin,
Gətiribmiş, nə bilim, kafəri iyman xəlvət?
Vadiyi-vəhdətə gəl, ey dili-divanə, dəxi
Ola bilməz bu sifət hiç biyaban xəlvət.
Çıxdı pirahəni-çakilə gülüstandan gül,
San, Züleyxa ilə etmiş məhi-Kənan xəlvət.
Gah peyğami-cəfa, gah bəlayi-hicran,
Seyyidə yar qılır gündə bir ehsan xəlvət.

Vəfa rəsmin tutub gəl, ey pəri, cövrü cəfadən keç,
Əgər adəmsən, insaf et, bu vəzi-narəvadən keç.
Gözüm yaşından, ey sərvi-rəvan, rəncidə olmuşsan,
Bu təsiri-sitarəmdir, gəlib ol macəradən keç.
Pərişanlıqdan ol zülfü dedim dün nafeyi-Çindir,
Çevir öz başına, ey gül, məni, sən ol xətadən keç. -

Dəhani-yardən bir söz təmənnasindəsən çoxdan,
Nə çıxsın yoxdan, ey dil, bir usan, bu müddəadən keç.
Həsiri aləti-təzvir edib əgləşmə məsciddə,
Gəl, allahı sevərsən, zahida, sən buriyadən keç.
Səfayi-xatir olmaz aşiqə meyxanəsiz, ey dil,
Əgər bu Kəbədən çəkdinsə əl, bəs get Səfadən keç.
Cahan mülkündə, Seyyid, yoxdu bir ehsani-biminnət,
Şikəstə xatirə səbr eyləyib, ol mumiyadən keç.

Badeyi-gülfamdən rəngin gülüstandır qədəh,
Lalələr, güllər açılmış, bağü bostandır qədəh.
Əksi-xurşidi-rüxi-saqilə tapmış tərbiyət,
Ləlü gövhərdən dolu kani-Bədəxşandır qədəh.
Gər desəm Məryəm, edər təsdiq əhli-ruhlər,
Kim bunu inkar edər ki, hamili-candır qədəh?
Ləli-meydir, ya nigini-xatəmi-əngüşti-Cəm,
Beyzeyi-xurşid, ya taci-Süleymandır qədəh.
Xizrü Musadən qədəh sirrin sual etdim, dedi: ,
Kəştiyi-Bəhreynə bənzər, bari-mərcandır qədəh.
Bir-birindən zərrəcə aləmdə olmazlar cüda,
Badə İsadır məgər, xurşidi-rəxşandır qədəh. .
Zahida, sən dəhrdə siparələr al, vəqf qıl,
Seyyidin ərvahına aləmdə ehsandır qədəh.

Mahi-bimehrim əgər kim göstərir rüxsar sübh,
Öz tüluundan olub şərməndə, eylər ar subh.
Açmaz idi göz ruxi-xurşidi-rövşənpeykərə,
Gər o mah eşqində olsaydı mənim tək zar subh.
Geçə ol mah ilə həmbəzm olduğumdan dağ olub,
Sanma gundüz daği-pinhanın qılır izhar sübh.

Şam edib eyşü tərəb, yatdı o məh şəbgirdə,
Xabi-qəflətdən əcəb bivəqt olub bidar, sübh.
Gəldi mahım, çıxdı gün, mən gövhəri-əşkim saçıb, •
Qıldı həm şabaş yüz min gövhəri-şəhvar subh.
Qaziyi-Beyzavi tək «Vəşşəms» təfsirin qılıb,
Zərrə-zərrə kainatə kəşf edər əsrar sübh.
Arizi sübhi-əzəldən aldı pərtövlər məgər--
Kim, səbahətlər qılır hər sübh istizhar sübh.
Seyyida, yetsəm əgər bir şəb o mahın vəslinə,
Bilmərəm gün yoxdu bu aləmdə, ya kim, var subh.

Ey badi-səba, qasidi-müşkinərəvayeh,
Ol gözləri-ahuyə qıl əhvalımı vazeh.
Naseh, nə dögürsən bu qədər ahəni-sərdi,
Divanəyə eylərmi əsər pəndu nəsayeh.
Onlar edər eşq içrə mənə indi nəsihət--
Kim, bundan əvail mən idim onlara naseh.
Mən taət üçün geyməmişəm xirqəni, zahid,
Ancaq bunu bildim özümə sətri-qəbayeh.
Həqdən oluram bir vələdi-salehə talib--
Kim, düxtəri-rəz əqdinə oldum genə nakeh.
Rəsmi-qəzəlin xatəmi yox, mən də rəsuləm,
Maqəblə mənəm xatəmü mabədimə fateh.
Ərşi-əhəd altında olan kənzi-nihanə,
Ey Seyyidi-xoşnəzm, zəbanındı məfateh.

Sənsiz fəzayi-cənnəti-məvadə yox fərəh,
Ətrindən olmasa güli-rənadə, yox fərəh.
Eylə mərizi-eşqə ləbin çarə, ey həkim,
Məcuni-ləli-nabi-müsəffadə yox fərəh!

Derlərdi zəfəranı müfərreh, nədəndi bəs,
Rəngim saraldı, yarə bu mənadə yox fərəh!
Busə nə qədr çox ola xoş, laəqəl iki,
Məşhurdur ki, buseyi-tənhadə yox fərəh.
Meydən murad buseyi-sağərdir, ey könül,
Məşrutu olmayan meyi-səhbadə yox fərəh.
Meracın ilə oldu fərəhnak ərşiyan,
Sənsiz, həbibim, ərşi-müəlladə yox fərəh.
Nadan tapar həmişə fərəh vəsli-yardən,
Seyyid, cahanda xatiri-danadə yox fərəh.

Şikəst sübhə verir rövnəqi-səfayi-qədəh,
Cilayi-aləmə baisdir incilayi-qədəh.
Behişti-Ədndən Adəm gətirdi toprağın,
Behişt lütfüdu xaki-tərəffəzayi-qədəh.
Açıldı feyzi-qədəhdən üzümə çox qapılar,
Zibəs ki, mən oxudum ruzü şəb duayi-qədəh,
Məqami-qürbə işarətdi «qaf»i, «dal»i dilə,
Həzar hikmət «ha»-indədir, fədayi-qədəh.
Qədəh bəhasına can vermək istərəm, amma,
Nə çarə kim, iki aləm degil bəhayi-qədəh.
Qədəh sənasını sən nəğmə eylə, ey bülbül,
Mənim təranələrim çün degil səzayi-qədəh.
Sənayi-zati-xüdayi-cahan muradın isə,
Həmişə, Seyyid, elə sidq ilə sənayi-qədəh.

Saqi, səbuh tərkini qılma ələssəbah,
Bir cam ilə xumarımı rəf eylə, ta rəvah.
Minayi-mey müəzzinə bənzər ki, naləsi
Can guşuna bəşarədi «həyyə ələl-fəlah».

Kuyündü qiblə, xaki-dərin səcdəgahımız,
Adındı xəstə dillərə təkbiri-iftitah.
Tökməzdi bunca qanlar o sultani-gülrüxan,
Gər bilməsəydi qanını eşq əhlinin mübah.
Fovt etmə vəqti-eyşi ki, yox ömrə etibar,
«Əl eyşü bərqi-xatifü vəl ömrü kərriyah»[1]
Yarı görüncə qeyr ilə cövlanda hər zaman,
Xoşdur mənə əgər gözümə sancıla rimah.
Yox ləfzi-qeyri-müstələhin hüsnü şerdə,
Eylə qəzəl ədasını movqufi-istilah.
Seyyid, qəzəldə ləfzi-qəliz etmə, mündəric--
Kim, kəşfinə zərurət ola «Kənz» ya «Sihah»,

[İstinad1:eyş--çaxan ildırım, ömr--küləkdir]

Dedilər xəlq ki, var badeyi-həmradə fərəh,
Yarsız görmədim ol cami-qəməfzadə fərəh.
Yarsız neyləyirəm seyri-gülü gülzarı,
Olmasa yar, olumu cənnəti-məvadə fərəh?
Şəbi-meraci-visalın məni zar etdi rəqib,
Görmədim, seyr elədim çərxi-müəlladə fərəh.
Çeşmi bimarına mərbutdur, ey gül, fərəhim,
Baxmışam yüz kərə, yox nərgisi-şəhladə fərəh.
Dağım olduqca füzun şad olur aşüftə könül,
Tifl üçün eyddə var ziynəti-kaladə fərəh.
Yarımın adını bildikdə fərəh hasil olur,
Onu təshif eləsən var bu müəmmadə fərəh.
Seyyida, eylə fərəh, çəkmə bu dünya qəmini,
Çünki beş günlük olur bülbüli-şeydadə fərəh.

O-gündür aşiqi-miskinə ruzi-istiftah
Ki, nuş eyləyə ol nuş-ləblə sağəri-rah.
Diyari-eşqdə bir tiflə mən giriftarəm
Ki, şiri-madəri tək qanımı bilibdi mübah.

Dönübdü bəhrə gözüm möhnəti-fəraqından,
Olubdu mərdümi-çeşmim o bəhrdə məllah.
Nəkarəyəm, nəçiyəm mən, bir ixtiyarım yox,
Səlahi-karım odur ki, odur sənə islah.
Nə xarlıqdı, könül, xardən götürməz əl
Həzar mərtəbə bülbül gülə edə illah.
Xərab olmadı bir gunə dil fəraqindən
Ki, eyləyə bilə memari-vəsl onu islah.
Nə qürrəsən bu vəfasız həyatə, ey xacə,
Nəhayət oldu bu şəb, ömrdür çirağі-səbah.
Bu gecə gördü yüzün öz nigarının, Seyyid,
Münəvvər oldu bu müşkatdə məgər misbah.

Ta ki tapdı səndən ey məh, ziynətü zivər külah,
Ayrılıb səndən dəxi xurşidə əgməz sər külah.
Zülfi-pürxəm üstünə əkmiş külahı dilbərim,
Rəsmdir mar üstə ari, qoymuş əfsungər külah.
Sərvü  məh derdim o tubaqamətü  məhtələti,
Sərv əgər geysə qəba, qoysa məhi-ənvər külah.
Padişahi-hüsnsən, əhli-məhəbbət ləşkərin,
Məsnədin övci-məlahətdir, sənə əfsər külah.
Bu külah ilə tutub gün-tək cahanı şöhrətin,
Mahruyim, başa qoy hər gündə bir digər külah!
Çox müsəlmanın yetirdin çərxə dudi-ahını,
Ta ki, qoydun başa sən naz ilə, ey kafər, külah!
Bu külah ilə müsəxxər qıldı Seyyid aləmi,
San, qoyubdur başına himmətlə İskəndər külah.

Aldım ələ peymanə, təvəkkəltü ələllah!
Oldum genə rindanə, təvəkkəltü ələllah!
Düşdüm həvəsi-silsileyi-zülfi-nigarə,
Oldum genə divanə, təvəkkəltü ələllah!
Ol həlqeyi-zülfündə görüb gəndümi-xalın,
Aldatdı məni danə, təvəkkəltü ələllah!
Qorxum  budu cəmiyyətimiz ola  pərişan,

Yar aldı ələ şanə, təvəkkəltü ələllah!
Mən aşiqi-divanə, uşaqlar əli daşlı,
Çıxdım genə meydanə, təvəkkəltü ələllah!
Züşar salıb boynuma zülfi-siyəhindən,
Döndüm genə Sənanə, təvəkkəltü ələllah!
Seyyid məni-tərdaməni vəslində bilibdir,
Düşdüm quru böhtanə, təvəkkəltü ələllah!

Ey könül, sirri-dəhani-yardən asar yox,
Getdi bu bir nöqtə sövdasında əldən var-yox.
Ləblərin tək kan ara hərgiz tapılmaz ləli-tər,
Dişlərin tək bəhri-Ümmanda düri-şəhvar yox.
Dedilər istə ləbindən dərdi-pinhanə dəva,
Qoy nihan qalsın ki, məndə qüdrəti-izhar yox.
Yarı əğyar ilə görsən qılma, ey dil, nalələr,
Gülsitani-aləm içrə bir güli-bixar yox.
Can çəkib pinhanı çox sordum dəhani-yardən,
Yox bilən, söz çox, vəli bir vaqifi-əsrar yox.
Olmuş ənvari-təcəlla Turi-vəhdətdən əyan,
«Rəbbi ərni»[1] söyləyən bir talibi-didar yox.
Yarını əğyar ilə gördü, özün öldürmədi,
Adını aşiq qoyub, Seyyiddə hərgiz ar yox.

[İstinad 1: ey mənim allahım, özünü mənə göstər]

Neyləyirsən Müshəfi zahid . cəmali- yarə bax,
Ayeyi-nuri bəyan eylər,ləbi-dildarə bax.
Yar kuyində sirişkim seylinə eylə nəzər,
«Rovzeyi-cənnati-ədnni təhtəhəl-ənharə»[1] bax.
Xət gəlib ərablər kimi təvafi-hüsnünə,
Qıl tamaşa hüsnünə, bu kəsrəti-zəvvarə bax.
Qərü ənbiqi-dü çeşmim çəkdi ruyindən gülab

Qətrə-qətrə əşki-gülgunimi gör, əttarə bax.
Surəti-rəhmanı görmək xahiş eylərsən, könül,
Masivadən göz yumub ol arizi-gülnarə bax.
Bir kitabullahdır hər bərgi-gül, ey əndəlib,
Qönçəyə seyr eyləyib məstur olan əsrarə bax.
Seyyida, oldu təcəlla Turi-vəhdətdən əyan,
Aləmi-cai münəvvər eyləyən ənvarə bax.

[İstinad1: behişt bağlarında axan çaylar.]

Ol lalərüxün işvəvü nazı çox imiş, çox,
Üşşaqə onun suzü güdazı çox imiş, çox.
Mehrabi-dü əbrudə könül xeyli zamandır
Qalmış, bilirəm, razü niyazı çox imiş, çox.
Bir Kəbə degilmiş bu Səfa əhlinə qiblə,
Məhbubi-həqin mülki-hicazı çox imiş, çox.
Müddətdi ki, qıllam qədəmin daşına səcdə,
Eşqin bu məqam içrə nəmazı çox imiş, çox.
Mən az bilirdim mənə ənamını yarın,
Bu cövrü cəfanın, dəxi, azı çox imiş, çox.
Bu səltənəti-eşqdə Məhmud tapılmaz,
Hər guşədə afaqın Əyazı çox imiş, çox.
Yox dəhrdə bir kəs ki, ola arifi-həqbin,
Seyyid, aradım eşqi-məcazi çox imiş, çox.

Gədayi-kuyi-yarəm, təxtü tacə ehtiyacım yox,
Sivayi-dərdü möhnət fəqr mülkündən xəracım yox.
Səbayi-məskənətdə hüdhüdi-mülki-Süleymanəm,
Əgərçi hüdhüd-asa fərqi-iqbalımda tacım yox.
Rüxi-zərdimdə nəqşi-buriya zahirdürür, əmma
Tilayi-sikkədarəm, suqi-izzətdə rəvacım yox.
Çirağı-ahdən rövşəndi hər şəb külbeyi-tarım,

Bu zülmətxanə içrə bundan özgə bir siracım yox.
Məni zindiq oxurlar cümlə aləm əhli, lakin mən
Mücərrəd cövhərəm kim, imtahanə ehtiyacım yox.
Deyərlər kim, qəm olmaz olsa bir kəsdə fərəh, əmma
Mənim aləmdə bir gün dərdü qəmsiz ibtihacım yox.
Şərabi-nab bir cövhərdi, bu aləm ərəz, Seyyid,
Mənim ayrılmağa ol cövhəri-tərdən əlacım yox.

Zahida, ol sənəmin zülfi-çəlipasına bax,
Aç bəsirət gözüvü, nərgisi-şəhlasına bax.
Ayeyi-xəmr oxuyur, nəfini ingar qılır,
Tutduğu felini gör, verdigi mənasına bax.
Cənnətə getdi və ya duzəxə mürdə, nə qəmin,
İrsinə dig gözüvü, külçəvü həlvasına bax.
İstəyir cənnəti zahid bu qədər hiylə ilə,
Əbləhin fikrini gör, dildə təmənnasına bax.
Dili-divanə sevən can tək o zülfi-siyəhi,
Başının şurini gör, eşqdə sövdasına bax.
Sanma bu Seyyidi sən əhli-cəhənnəm, vaiz,
Neyləyirsən əməlin, dildə təmənnasına bax.

Ey zahidi-xudbin, bilirəm kim, hünərin yox.
Meydani-məhəbbət tərəfə bir güzərin yox.
Mehrabdə əgləş ki, cigərdar degilsən,
Bu nari-qəmə yanmağa əsla cigərin yox.
Ta müxbiri-eşq oldu könül, bixəbərəm mən,
Zahid, xəbərim yox, bu xəbərdən xəbərin yox.
Sən eylə pəri, hur xəyalilə ibadət,
Bəzmində ələnnəqd büti-simbərin yox.
Ey zahidi-xüşk, eyləmə üşşaqə təfaxür,
Ahi-səhərin, suzi-dilin, çeşmi-tərin yox.
Nə vəslü nə ağuşü nə bir busü kənarın,
Ey nəxli-məlahət, bizə əsla səmərin yox.
Ey dil, elədin cənnəti-kuyini təmənna,

Uçmağa hanı, heyf, sənin balü pərin yox.
Bəsdir sənə rüxsari-zərü əşk çü simin,
Seyyid, nə qəmin, gərçi sənin simü zərin yox.

Hər aşiqin ki, sən kimi bir məhcəmalı yox,
Nöqsanı var ki, eşqinin əsla kəmalı yox.
Yüz xətt ilə küsuf edə xurşidn-tələtin,
Mehrin dilimdə zərrə qədər bir zəvalı yox.
Ey bəxtimin sitarəsi, xətt içrə ruyüvi
Gər ay tutuldu dersə görənlər, vəbalı yox.
Yüz vədeyi-visal eləsin ol pəricəmal,
Hərgiz gəlib görünməsinin ehtimalı yox.
Seyyid, qayıt, bu mərhələdən kəs ayağını,
Axır bu rahi-meykədənin bir məalı yox.

Başımda nəşeyi-mey, əldə cami-xoşgüvarım yox.
Sən, ey bülbül, fəğan et güldən ötrü səhni-gülşəndə,
Mənim nitqim tutulmuşdur ki, yari-gülüzarım yox.
Sənin döndü xəzanın, vəsli-güldən novbahar oldu,
Mənim fəsli-xəzanımdır kim, ol rəşki-baharım yox.
Açıldı qönçə, bülbül vəsli-güldən yetdi didarə,
Edib çaki-giriban ölməzəm mən, hiç arım yox.
Nə nəqdim var meyi-nabə, nə rəhni-camə dəstarım,
Bətər ondan bu kim, meyxanələrdə etibarım yox.
Nə tərğib eyləyirsən cənnətə hərdəm məni, vaiz,
Mənim bağі-behiştim yardır, cənnətdə karım yox.
Həzər qıl, yaxma dildə ah odilə navəkin, Seyyid,
Mənim ol qaşı yaydan bundan özgə yadigarım yox.

Mən tək bahardə hər o şəxsin ki, yarı yox,
Bir bülbüli-fələkzədədir kim, baharı yox.
Ol kəs ki, yarını görə əğyarə yar olub,
Öldürməsə əgər özünü, hiç arı yox.
Çox kimsənin əgərçi kəsibdir qərarını,
Əmma mənim təki o gülün biqərarı yox.
Bənzər o nəxlə kim, ola bisayəvü səmər,
Hər dilbərin ki, aşiqə busü kənarı yox.
Seyyid, hanı şərabın, ötür fəsli-novbahar,
Bir də baharə çıxmağının etibarı yox.

Dolanım başuva, ey nazlıca yarım, bəri bax,
İşvəli, qəmzəli, çəm-xəmli nigarım, bəri bax.
İşvə ağaz qılıb səbrimi tarac eləmə,
Getdi dildən dəxi aramü qərarım, bəri bax.
Xəm yemiş qamətim əbrulərivün qurbanı,
Zülfi-pürtabuva qurban təni-zarım, bəri bax.
Bu cəfadidə dil ol kakili-mişkinə fəda,
Gözlərin sədqəsi bu cismi-fikarım, bəri bax.
Can nisar etməgə amadədi Seyyid, gözəlim,
Gər desən lütf ilə: ey aşiqi-zarım bəri bax!

Çəkdi bağə fərşi-rəngarəng çərxi-lacivərd,
Geydi al don lalələr, şəbnəmlə doldu cami-vərd.
Açmamış xabi-ədəmdən nərgisi-tər çeşmini,
Sanki aşiqdir gülə, izhar edər rüxsari-zərd.
Sən də mən tək aşiqi-gülsən əgər, ey əndəlib,
hanı səndə suzi-qəlbü əşki-gərmü ahi-sərd!
Dərdi-eşqi-yarə, ey dil, fikri-dərman eyləmə
Kim, bu dərdi-eşqi yüz dərmanə verməz əhli-dərd.
Mehrü məhdər kəbəteyn almış ələ nərradi-çərx,
Şeşdəri-heyrətdə qoymaqçın səni, oynar o, nərd.

Cüft qaşın tağına peyvəstə qamət xəm qılıb,
Səcdə qılmaqdır işim kim, olmuşam aləmdə fərd,
Seyyida, divaneyi-Leyla ki, Leyla səndədir,
Olma Məcnun tək, düşüb səhralərə bihudəgərd.

Şadəm ki, xak olam, ola ol xak girdbad,
Ta daməni-nigarə yetəm, hərçi bad-bad.
Gər mən sən olsam, etməz idim, ey sipehri-dun,
Şirini təlxkam, o Fərhadı namurad.
Bad əsdi, gəldi nəfxeyi-zülfi-müənbərin,
Qəmgin olan könül-olub ol töhfə ilə şad.
Derlər ki, ömr olsa əgər yar, yar olur,
Yarə nə etibar, bu ömrə nə etimad!
Sultanım, eylə xəttini hər həftədə təraş,
Qoyma həbəş sipahı sala Rum ara fəsad.

Şeşdəri-hicrində qaldı xəstə könlüm namurad,
Olmadı bir babi-vəslin, ey güli-rəna, güşad.
Şeş cəhətdə tasi-bəxtim atmadı bir «pəncü şeş»,
Çarsudən qəm mənə yüz verdi şamü bamdad.
Xət qəra, kakil qəra, müjganü geysulər qəra,
Dilbərim bunca səvad ilə genə bilməz səvad.
Mən necə dilşad olum mərdümlə gördükdə səni
Kim, mənim öz mərdümi-çeşmimə yoxdur etimad.
Çox nigahi-lütflər eylərdi ruzi-vəsldə,
Ta məni hicrində yandırsın o, həsrətlə ziyad.
Çıxdı tüğrayi-itaət xət bəyazi-ruyinə,
Eylədim sultani-hüsnə canü dildən inqiyad.
Yarsız mey içmək, ey aşiq, hərami-məhzdir,
Eyləyib bu barədə müddətdi Seyyid ictihad.

Eşqdir eyləyən aləmdə bəlalər iycad,
Eşqdəndir bu qədər aləmi-kovn içrə fəsad.
Eşqdir mürşidi-kamil, ona afaq mürid,
Eşqə şagird cahan əhli, o kamil ustad.
Eşqdir aləm ara darə çəkən Mənsuri,
Eşqdir Qeysi qılan Leyli qəmindən naşad.
Dağdə surəti-Şirinini nəqş eylər ikən,
Başına vurdu külüngün niyə axır, Fərhad?
Seyyida, eşq sözün söyləmə nafəhmlərə,
Çəkmə zəhmət, nə bilir rütbeyi-insanı cəmad.

Əlminnətü-lilləh ki, olub bəxt müsaid, •
Saldı qolunu boynuma ol ayinə said.
Zahid, sənə meraci-məarif olu zahir,
Gər nəşeyi-mey başına olsa mütəsaid.
Vaiz, bu qədər zəmmi-mey etməkdə nə sudun,
Axır bu əbəs feldə gördün nə fəvaid?
Səd şükr ki, mən rindi-qədəhxarəvü məstəm,
Xəlq-eyləmədi bari-təala məni zahid.
Zahid ki, meyin ümmi-fəsad adını qoymuş,
Bir batil olan sözdü bu, bir fikri fasid.
Hər qasid ilə namə edim yarıma irsal,
Görcək rüxi-dildarı qayıtmaz dəxi qasid.
Seyyid, sənə məqsud ola gər mətləbə yetmək,
Asan yol odur kim, edəsən tərki-məqasid.

Ta şanə olub ülfəti-zülfündən olam şad,
Şadəm ki, dönəm xakə, qubarım ola şimşad,
Şadəm ki, məni eşqdə qəmgin görüb ol şux,
Gül tək açılır xatiri.halımdan olur şad.
Mərgim mənim asandı, vəli müşkil odur kim,
Məndən sora eylər kimə cövr ol büti-naşad.
Aləmdə mənəm Leyliyi-əsrari-həqiqət,

Məcnunu mənəm məst qılan, eyləyən irşad.
Cəzb eyləməsəydi onu şuri-ləbi-Şirin,
Dağlarda külüng çalmaz idi başına Fərhad.
Saqi, elə məxmurü xərab et məni meydən
Kim, olmaya məqdur dəxi eyləmək abad.
Seyyid, yetişib aləmə fəryadü fəğanım,
Fəryad ki, təsir eləməz ol gülə fəryad!

Kənari-ləli-ləbində siyah xali-Məhəmməd
Kənari-çeşmeyi-Zəmzəmdədir Bilali-Məhəmməd.
Çəkər bəyazına mehri-münir mərdümi-çeşmim
Kim, ol bəyaza çəkə surəti-misali-Məhəmməd.
Nə meyli-bağı-behişt eyləyər, nə hur, nə qılman,
Əgər müyəssər ola dövləti-visali-Məhəmməd.
Behişt vəsfini kim, bunca eyləyir mənə xaliq,
Müşəxxəs oldu ki, mənzurdür cəmali-Məhəmməd.
Həram edər bizə hicranı şürbi-badə ilə,
Olubdu qanımız aya nədən Həlali-Məhəmməd!
İşimdi səcdə həmişə dü taqi-əbrüyi-yarə,
Xəmidə qıldı qədim həsrəti-hilali-Məhəmməd.
Səfa isə qərəzin kəbeyi-visaldə, Seyyid,
Bəsindi eşqi-Məhəmmədlə mehri-ali-Məhəmməd.

Gərçi məndən etdi sərkəşlik o sərvi-sərbülənd,
Tapmışam təsxirinə ahi-dilimdən bir kəmənd.
Olmuşam eylə nəhif ol nuşləb eşqində kim,
Zəfdən çıxmaz nəfəs, ney tək kəsilsəm bənd-bənd,
Ey dil, ol bidərdə izhar etmə dərdi-eşqi kim,
Yüz desin, fəhm -eyləməz, bidərdə dərdin dərdmənd. •
Atəşin rüxsarın üzrə xali-hindulərmidir,
Ya ki, dəfi-zəxmi-çeşmə məcmərə saldın sipənd?!
Giryeyi-biixtiyarım təlx edib ovqatımı,
Bir açılmaz, halımı sormaz o ləli-nuşxənd.
Cam tutdum kim, tutub piri-müğanın pəndini,
Kim deyir, divanələr tutmaz, könül, aləmdə pənd?
Bilmirəm məsciddən, ey Seyyid, nə gördün aqibət

Kim, çəkib məsciddən əl, meyxanəni etdin pəsənd.

Ey xudavəndi-qadiri-mövcud
Vahibi-mülki-cudü əslİ-vücud.
Ey ki, manəndi-bərgi-neylufər,
Bağı-sününlə nöh sipehri-kəbud.
Düşdü Leylayə pərtövi-hüsnün,
Fərəh-əfzayi-xatiri-Məhmud.
Əsəri-cah şuri-eşqindir,
Şövkəti-Cəm, təraneyi-Davud.
Ki, Brahimə abi-lütfündən
Oldu gülzar atəşi-Nəmrud.
Gah olur tündbadi-qəhrindən
Xakə yeksan güruhi-Adü Səmud.
Seyyida, masiva irir fani.
Leysə fil-mülk ğeyrəhu mövcud[1]

[istinad1: dünyada ondan başqa yoxdur(allaha işarə)]

Ey ləbin düşnamı əhli-eşqə şəkkərdən ləziz,
Ləblərin şəkkər, sözün qəndi-mükərrərdən ləziz.
Xaki-kuyi-dilkəşin yüz bağı-cənnətdən lətif,
Dürdi-cami-məclisin min abi-Kövsərdən ləziz.
Ey məzaqi-cani-şirinimdə acı sözlərin
Nəşeyi-zövqi-şərabi-ruhpərvərdən ləziz.
Çaşniyyi-badə ləli-yardır, ya kim olur
Buseyi-ləli-ləbi-dildar sağərdən ləziz.
Dövləti-vəslin dili-nalanə candan sevgili,
Nəkhəti-zülfün məşami-canə ənbərdən ləziz.
Zövq edər görcək saralmış arizim ol simtən,
Ari, olmaz əğniyayə hiç şey zərdən ləziz.
Seyyida, söz yox ki, ləzzət var meyi-gülfamdə,
Leyk olmaz mey cavabi-təlxi-dilbərdən ləziz.

Ləbin ki, şəkkər idi eylədi itab ləziz,

Bu çaşnidən olub türfə şəkkərab ləziz.
Cavabi-təlx ləbi-ləlüvə zərər verməz,
Nə qədr təlx olursa, olur şərab ləziz.
Sənə dua elədim, föhş verdi ləli-ləbin,
Məzaq əhlinə xoşdur belə cavabi-ləziz.
Xət etmədi səni xabi-qürurdan bidar,
Bahar fəsli olur sübh vəqti xab ləziz.
Ləbin xəyalı ilə dildə şur olur peyda,
Bəli, nəməklə olur, rəsmdir, kəbab ləziz.
İtabi-yar-verir özgə ləzzət əhli-dilə,
Xüsusən ol ləbi-şəkkər qıla itabi-ləziz.
Bu qədr şerdə olmaz nəmək, vəli, Seyyid
Ləbin havası ilə yazdı bir kitabi-ləziz.

Dili-sədçakə zülfündən gələn qəm şanədən gəlməz;
Cəfa kim aşinalərdən gəlir, biganədən gəlməz.
Bu qədri fərqi var kim, suzişi-nari-məhəbbətdə
O əfğanlar ki, bülbüldən gəlir pərvanədən gəlməz.
Səfayi-meykədə üşşaqə olmaz Kəbədən hasil,
Şəfa dərd əhlinə aləmdə hər bir xanədən gəlməz.
Ləbi-yar ilədir peymanənin zövqi-rəvanbəxşi,
Və illa zövqi-xatir badəvü peymanədən gəlməz.
Pozub xət rövnəqi-rüxsari-yarı saldı dillərdən,
Nə mane var-dəxi, ol şuxi-bipərva nədən gəlməz?
Bu nə dilbəstə olmaqdır pərilər zülfü xalinə,
Bu işlər kim, könül, səndən gəlir, divanədən gəlməz.
Qəribə xanəviran, rindi-bipərvadı Seyyid kim,
Əlindən cam düşməz, bir çıxıb meyxanədən-gəlməz.

Yarım  kimi bir sərvqədü gülbədən olmaz.
Rüxsarına bənzər o gülün nəstərən olmaz.
Məcruh olur, ey gül, bədənin sayeyi-güldən,
Qurbanın olum mən, belə nazik bədən olmaz.
Dəryadə dişin tək düri-şəhvar tapılmaz,
Ləlin kimi kan içrə əqiqi-Yəmən olmaz.

Eylər  hükəma  nükteyi-mövhumu müşəxxəs,
Sirri-dəhənin nöqtəsin amma bilən olmaz.
Hər  adı Məhəmməd ola bilməz şəhi-Bətha,
Hər aşiqi-dilxəstə Üveysi-Qərən olmaz.
Dəfn eyləyin üryan məni kuyində o mahın,
Şər ilə müşəxxəsdi, şəhidə kəfən olmaz.
heyvandı ki, yox başının əfsarı, həqiqət,
hər kimsənə kim aşiqi-vəchi-həsən olmaz.
Ol Yusifi-gülçöhrə qəmindən sənə, Seyyid,
Şirvan niyə hər ləhzədə beytül-həzən olmaz?

Qurtardı nisfi-şamdə, saqi, şərabımız,
Etdi qürub, heyf, bizim afitabımız.
Baxma  kitabi-hikmətə,  mey  tök kitabiyə,
Çoxdan itibdi, ey ləbi meygun, kitabımız.
Derlər behişt əhlinə cənnətdə yox əzab,
Bəs kuyi-yardə niyə  artdı əzabımız?
Ağzın açıb xitabıma verməz cavab gül,
Pinhan nə söyləyim ki, verildi cavabımız.
Zahid sözilə eyləmədik bir səvabə meyl,
Bəsdir cəza günündə bizə bu səvabımız.
Bülbül pərində başını gizlətdi şərmdən,
Əskik degil -o qönçeyi-tərdən hicabımız.
Seyyid, həmişə talibi-meyxanəyik məgər
 Bu xakdən siriştə olubdur türabımız?!

Səndə, ey ləli şəkər, bunca vəcahət qalmaz,
Dili-sədpareyi-aşiqdə cərahət qalmaz.
Zövq verməz dəxi ,eşq əhlinə şirin dəhənin,
Təlx olur sözlərin, asari-məlahət qalmaz.
Sübhi-rüxsaruvü, ey mah, tutar zülməti-xət,
Sibqəti-leyl ola sübh üzrə səbahət qalmaz.
Xət basar arizüvi hüsnüvü eylər bərhəm
Dəxi ol nəqşi-dilaradə təravət qalmaz.

Ləblərin möciz ilə mürdələr etməz ehya,
Nəfəsi-paki-Məsihadə fəsahət qalmaz.
Gözlərin yadı ilə sinədə asayiş yox,
İki bimar olan xanədə rahət qalmaz.
Ləbiyar ilə mükərrər ola gər qafiyələr,
Seyyida, qəndi-mükərrərdi, qəbahət qalmaz.

Tapdı ləlindən şəfa dərdi-dili bimarımız,
Şükr lillah kim, Məsihadən olur timarımız.
Atdığı peykanları ətrafıma. çəkdi həsar,
Ahənü fuladə dönmüşdür dərü divarımız.
Qüvvədən biz bunla gəldik, indi varıq,"ey həkim,
Ol dəhən fikriylə müşküldür, yox-olmaz varımız.
Bir əzizin dil qulamı oldu ta Yusif kimi,
Var ümidim müştəridən gərm ola bazarımız.
Bağban oldum sənə, verdim gözümdən su, vəli
Səndən, ey nəxli-məlahət, dardü qəmdir barımız.
Yar kuyin dövr edir hər şəb xəyalım, leyk mən
Sakinəm mərkəz kimi, dəvvar olub pərgarımız.
Seyyida, qəm çox, vəli aləmdə yox bir qəmgüsar
Qəm, qəm olmazdı əgər olsaydı bir qəmxarımız.

Zahidə cənnət təmənnasında huradır qərəz,
Aşiqə_meyxanədən ol şuxi-tərsadır qərəz.
Harda olsa dövləti-didarın olsun cilvəgər,
Arifə məqsəd nə məscid, nə kəlisadır qərəz.
Vəsfi-cənnətdən mənim qəsdim cəmali-yardır, .
Mədhi Kövsərdən mənə ol cami-səhbadır qərəz.
Can verib cananə yetməkdir muradı aşiqin,
Göftguyi-zülfü xalından bu sövdadır qərəz.
«Lən tərani» olsa da Musayə xoşdur bu xitab,
İstimai-hərfi-dildarə təmənnadır qərəz.
Turi-kuyi-yarı kim, bunca səyahət eylərəm,
Dövləti-didari-dilbərdən təcəlladır qərəz,
Bir vücudi-kamilin olmuş tüfeyli kainat,
Xəlqi-aləmdən nə Musavü nə İsadır qərəz.
Pənctənlər adını zikr et ki, Seyyid, bilmişəm

Adəmə təlimi-əsmadən bu mənadır qərəz.

Novbahar əyyamıdır, mən zar qaldım yarsız,
Hiç bülbül olmasın bu fəsldə gülzarsız.
Ol güli-alə dedim bir yanıma gəl birəqib,
Güldü ki, ey aşiqi-şeyda,gül olmaz xarsız.
Getsə şami-tirə rövşən sübh olur, laknn mənim
Ruzgarım tar olur ol türreyi-tərrarsız.
Çox edən bimarə xidmət, aqibət bimar olur,
Leyk könlüm xəstədir ol nərgisi-bimarsız.
Seyrdə əğyarə bax, ol mahə oldu müştəri,
Mən vəbala düşmüşəm ol kövkəbi-səyyarsız.
Nükteyi-pinhanı sor ləli-ləbi-dildardən,
Ey könül, olmaz dəhani-yar hiç əsrarsız.
Zülfünü daim basar bağrına çeşmi, vəchi var,
Seyyida, kəc getmə kim, əfsungər olmaz marsız.

Bağlər səbz oldu, olmaz xatirim xürrəm hənuz,
Gül açıldı, bülbül oldu şad, məndə qəm hənuz.
Aləm oldu şad, bülbül vəsli-güldən kamyab,
Məndədir bir gül fərağından qəmi-aləm hənuz.
Kuhkən dağ üzrə oldu tişeyi-qəmdən həlak,
Qarə geydim, dağə batdım, saxlaram matəm hənuz.
Afitabım, ləlini bir gecə görmüş xabdə,
Şövqdən dürlər tökər bu dideyi-pürnəm hənuz.
Mehri ol mahın siriştə oldu ol gün könlümə
Kim, müxəmmər olmamışdı tiynəti-Adəm hənuz.
Ey Məsihadən ləbin canbəxş, ləldn dilrüba,
Görməyib sən kimi bir ruhi-rəvan Məryəm hənuz.
Görmüşəm xab içrə bir müddətdi qaşın tağını,
Qəddim ol mehrab şöövqindən qalıbdır xəm hənuz.
Xal məhrəm, sürmə həmdəmdir o mahə, Seyyida,
Mən qərabəxtü qəragün olmazam məhrəm hənuz.

Mehri-rüxsarüvi dil mahi-səmadən seçməz,
Etibarı yox onun, ağı qəradən seçməz.
Nə hünərdir ki, tanır xublər içrə səni dil,
Hansı bir kəsdir o kim, şahı gədadən seçməz.
Ey ləbin aşiqə gülqənd, gözün bimarı
Mövtə müşrifdi, dəxi dərdi dəvadən seçməz.
Bəski dil aşiqi-göftari-şəkərbarındır,
İstəyir nitqüvi, düşnamı duadən seçməz.
Dili divanəni zəncirə çəkərsən yeri var,
Ətri-zülfün nə üçün müşki-Xətadən seçməz.
Sən nə bütsən ki, əya Kəbeyi-ərbabi-səfa,
Mərveyi-kuyüvi hüccac Səfadən seçməz.
Demə Seyyid, ki vəfa tərkin edib qıldı cəfa.
Tifldir,yar, hələ zülmü vəfadən seçməz.

Çəkər candan-əlin könlüm ləbi-dildardən keçməz,
Keçər meyxarə aləmdən, meyi-gülnardən keçməz.
Nola keçməz yüzündən ol nigari-azərinin dil.
Birəhmən bütdən əl-çəkməz, səməndər nardən keçməz.
Şitab ilə keçər çox xatiri-əğyar üçün məndən,
Vəli bir məndən ötrü xatiri-əğyardən keçməz.
Keçər piri-müğan hər bir günahı, kani-rəhmətdir,
Vəlakin cami-mey tərkin qılan huşyardən keçməz.
Şərabi-«əlbəlaü lilvila»dən məst olan aşiq
Keçər Mənsur tək candan, bəlayi-dardən keçməz;
Gözün gər içsə qanım nazuvi çəkmək münasibdir,
Pərəstarı olan kəs xatiri-bimardən keçməz:
O tari-zülfə Seyyid qılmaz iyman, məhz kafərdir,
Çəkər təsbihdən əl, rişteyi-zünnardən keçməz.

Tiğ etsə xətin pak sənə bir zərər olmaz,
Ayinədə seyqəl ola hərgiz kədər olmaz.
Gəl bəzmi-Züleyxayə sən, ey Yusifi-sani,
Bu hüsnü lətafətdə desinlər bəşər olmaz.
Ağuşə çəkib arizi-zibanı şəbü ruz,
Aləmdə o zülfün kimi bir bəxtəvər olmaz.
Sorma bu gecə silsileyi-zülfi-siyahın
Tulani olan qissədi, bu müxtəsər olmaz.
Yoxdan açıb ağzın verir axırda cavabım,
Pinhani olan nalələrim biəsər olmaz.
Bağı-dilə ol nəxli-məhəbbət ki, mən əkdim,
Ondan bilirəm qeyri-bəla, bir səmər olmaz.
At qəmzən oxun Seyyidə, ey qaşı hilalım,
Ruintənə yüz ox atasan kargər olmaz.

Aləmi-eşq içrə cananın sevən can istəməz,
Bak edən canü dilindən vəsli-canan istəməz.
Zülməti-zülfündə dil xurşidə etməz iltifat,
Maili-ləlin olan kəs abi-heyvan istəməz.
Mülki-dünya aqibət bərbad olur, ey huşyar!
Murcə əqli olan mülki-Süleyman istəməz.
Guşeyi-vəhdətdə gülzari-həqə vasil olan,
Xardən eylər həzər, seyri-gülüstan istəməz.
Gözlörin rövşən edən şəmi-rüxündən, ey pəri,
Sübhə meyl etməz, ziyayi-mehri-rəxşan istəməz.
İstəməz aşiq ki, xət tutsun üzari-dilbəri,
Eşqdə kamil olan, ol mahə nöqsan istəməz.
Sinədən peykanların çəkmə, dili etmə xərab,
Padşahi-adil öz mülkünü viran istəməz.
Ey təbib, əl çək əlacımdan, məni incitmə çox,
Aşiqi-sadiq olan dərdinə dərman istəməz.
Bəs nədən rüxsarına zülfün pərişan etdi yar,
Gər bu qarəgünləri zarü pərişan istəməz.
Seyyida, sən eylə daim şahi-mərdan vəsfini,
Şahi-mərdan çeşmüvi məhşərdə giryan istəməv.

Hansı bir aşiqə kim, sən kimi canan olmaz,
Bu müşəxxəsdi ki, cismində onun can olmaz.
hansı bir şəhrdə kim, sən kimi qarətgər ola,
Şahidəm, şəhrdə billah ki, iyman olmaz.
Nə qədər küfri-səri-zülfüvə dinin verməz,
Zahidi-tirənişin hiç müsəlman olmaz.
Ruxi-gülgunə əbəs gəldi bu xətti-siyəhin,
Yox davamı, gülə səbt ayeyi-quran olmaz.
Səni görsəm özüm ilə, həsədimdən ölərəm,
Bu səbəbdən dəxi vəslin mənə imkan olmaz.
Məni bir yerdə o mah ilə deyib xəlqə rəqib,
Tarı şahiddi ki, beylə_quru böhtan olmaz.
Səfheyi-xatirə nəqş oldu cəmalın əksi,
Şükrlillah, mənimçün dəxi hicran olmaz.
Verdi Seyyid o bütün zülfi-pərişanına dil,
Cəmdir xatiri, minbəd pərişan olmaz.

Hər kəs ki, üzündə xəti-reyhanı .bəgənməz,
Rövşəndi bu kim, məniyi-quranı bəgənməz.
Ey sərv, bir adəm ki,edə kuyüvi məskən,
Müftə deyələr rövzeyi-rizvanı bəgənməz.
hər bir kəsin əndamını kim, dağ edə eşqin,
Ey murxətim, möhri-Süleymanı bəgənməz.
Gər Xızr o feyzi-dəmi-şəmşirüvi bilsə,
Ömri-əbədi, çeşmeyi-heyvanı bəgənməz.
Bir canə gümanım gəlir, ol ruhi-rəvanım,
Əfğan ki, nisar eyləməgə canı bəgənməz.
Mötad olan hicr ilə vəslə həvəs etməz,
Qürbündə olan dərd ilə dərmanı bəgənməz.
Gəldi dilə qan içməgə peykanı o şuxin,
Seyyid, kim olur ki, belə mehmanı bəgənməz.

Hansı bir aşiqə kim, sən kimi canan olmaz,
Bu müşəxxəsdi ki, cismində onun can olmaz.
hansı bir şəhrdə kim, sən kimi qarətgər ola,
Şahidəm, şəhrdə billah ki, iyman olmaz.
Nə qədər küfri-səri-zülfüvə dinin verməz,
Zahidi-tirənişin hiç müsəlman olmaz.
Ruxi-gülgunə əbəs gəldi bu xətti-siyəhin,
Yox davamı, gülə səbt ayeyi-quran olmaz.
Səni görsəm özüm ilə, həsədimdən ölərəm,
Bu səbəbdən dəxi vəslin mənə imkan olmaz.
Məni bir yerdə o mah ilə deyib xəlqə rəqib,
Tarı şahiddi ki, beylə_quru böhtan olmaz.
Səfheyi-xatirə nəqş oldu cəmalın əksi,
Şükrlillah, mənimçün dəxi hicran olmaz.
Verdi Seyyid o bütün zülfi-pərişanına dil,
Cəmdir xatiri, minbəd pərişan olmaz.

Hər kəs ki, üzündə xəti-reyhanı .bəgənməz,
Rövşəndi bu kim, məniyi-quranı bəgənməz.
Ey sərv, bir adəm ki,edə kuyüvi məskən,
Müftə deyələr rövzeyi-rizvanı bəgənməz.
hər bir kəsin əndamını kim, dağ edə eşqin,
Ey murxətim, möhri-Süleymanı bəgənməz.
Gər Xızr o feyzi-dəmi-şəmşirüvi bilsə,
Ömri-əbədi, çeşmeyi-heyvanı bəgənməz.
Bir canə gümanım gəlir, ol ruhi-rəvanım,
Əfğan ki, nisar eyləməgə canı bəgənməz.
Mötad olan hicr ilə vəslə həvəs etməz,
Qürbündə olan dərd ilə dərmanı bəgənməz.
Gəldi dilə qan içməgə peykanı o şuxin,
Seyyid, kim olur ki, belə mehmanı bəgənməz.

Ey Xızır, zülməti-zülfü sənə asan olmaz, ]
Dəhəni-yar kimi çeşmeyi-heyvan olmaz.
hüsnə mövquf degil, yar gərək hal əhli,
Çox olur yar, vəli yari-zəbandan olmaz.

Seyd qılmaz dili-üşşaqı, könül, kakilü zülf
Hüdhüdün tacı əgər olsa, Süleyman olmaz.
Qan edibdir dili-üşşaqı xəyali-dəhənin,
Afitabım, ləbüvi ləl desəm qan olmaz.
Xəlq edə aşiq üçün xaliq əgər yüz firdovs,
Bu yəqinimdi ki, əcri-şəbi-hicran olmaz.
Zahida, etmə mənim könlümə iyman təlqin,
Kafəri-eşqdi bu, hiç müsəlman olmaz.
Sənə hədsiz olur, ey şux, mənim tək aşiq,
Mənə bu aləm ara sən kimi canan olmaz.
Zülməti-şəbdən usandım, ey əlin qurbanı,
Sinəni açmayasan, sübh nümayan olmaz.
Hüsn sultanı sənin kimi tapşşaz hərgiz,
Sənə Seyyid kimi bir bəndeyi-fərman olmaz.

Aləma fitnə salan mədəni-şərdir vaiz,
haşəlillah demənəm mən ki, bəşərdir vaiz.
Anası daməni-mehrabə atıb qundağın,
Eyləmə cəhl ki, məchul-pədərdir vaiz.
Gətirib tazə genə şəhrə cəhənnəm xəbərin,
Sifətindən deyəsən əhli-səqərdir vaiz,
«Rətbü Yabisdən» açıb bab, salıb məbhəsələr,
Quru sözdən nə bitər, mədəni-şərdir vaiz.
Özü layəqilü sərməsti-meyi-qəflətdir,
Söyləyir badəni kim, əqlə zərərdir, vaiz.
Yox yəqin olmayan işdən sözünü nəql eylər,
Seyyida, var xəbərim, əhli-xəbərdir vaiz,

Bu hüsnü lətafətdə yəqindir bəşər olmaz,
Rüxsaruva bənzər, fələk üzrə, qəmər olmaz.
Ey ləli şəkər, çox yemişəm Misr nəbatı,
hərgiz ləbi-şirinüvə bənzər şəkər olmaz.
Qəddindi sənin sərvi-xuraman, zəqənin sib,

Amma nə deyim, sərvdə hərgiz səmər olmaz.
Gögdən yerə sən enmisən, ey ayeyi-rəhmət!
Rüxsari-lətifin kimi gülbərgi-tər olmaz.
Mücgan oxun atsan əgər, ey qaşı kamanım,
Ol kimdi ki, bu tiri-bəlayə sipər olmaz.
Saradır adın, ikki saçın ənbəri-sara,
Saçın kimi aləmdə sənin müşki-tər olmaz.
Saçında əyandır mənə tulani bəlalər,
Yüz gecə desəm dərdi-dnlim, müxtəsər olmaz.
Seyyid, genə oldun həvəsi-eşq ilə dürpaş,
Əşari-lətifin kimi dürrü gühər olmaz.

Salıbdır məscidə övsafi-duzəxdən şərər vaiz,
CəHənnəmdən gəlib guya, gətirmiş bir xəbər vaiz.
Behişti-həştdər vəsfin mənə yüz bab ilə söylər,
Firib ilə məni eylər qapından dərbədər vaiz.
Cəmalın müshəfin görməz, deyər erabi-quranı,
Binayi-xaneyi-dini edər zirü zəbər vaiz.
Nə zöhdi-xüşkdir hərdəm satarsan, zar ağlarsan,
Düşübdür abrudən minbər, ey damanı tər vaiz!
Özündən qıl riyanı tərk, əgər vardır hünər səndə,,
Degil əhli-riyayə etirazın bir hünər, vaiz.
Əli vəsfin qılırsan, çəkməsən Həcvi-Ömərdən əl,
İlahi, xəsmin olsun ruzi-məhşərdə Ömər, vaiz.
Yedin mali-yetimi sən, biz içdik badeyi-gülgun,
Özün insaf elə, bir gör hansıdır feli-bətər, vaiz?
Həmişə vəsf edərsən Canü dildən ayeyi-fərci
Nə ləzzət görmüsən, ağzındadır .....vaiz..
Mənim meyxanə içrə şişeyi-meydən həsarım var,
Sənin məsciddə nifrinin mənə verməz zərər, vaiz.
Neçin mən eyləyirsən Seyyidi bütlər sücudundan,
Nə etmişdir sənə axır bütani-simbər, vaiz.

Nişimənin ki, sənin buriyadır, ey vaiz!
Qəsəm o xaliqə kim, bu riyadır, ey vaiz!
Xəlayiqi əməli-xeyrə dəvətin xoşdur,
Özündə yox bir əməl, bu xətadır, ey vaiz!
Edib cəhənnəmi övsaf, hərdəm ağlarsan,
Bu nə fəsanə, bu nə macəradır, ey vaiz!
Yetim malına göz dikməgin nədir daim,
həlal kəsb məgər narəvadır, ey vaiz?!
Yoxundu kəbeyi-rüxsari-yardən xəbərin,
Bu vəchdəndi sözün bisəfadır, ey vaiz!
Ümidvarsən öz tutduğun əməllərə sən,
Bizim ümidimiz əfvi-xudadır, ey vaiz!
Mey içməgin qıla Seyyid əgər nihan səndən,
Sənin təki o da əhli-riyadır, ey vaiz!

Xəyali-yar edib aldım bu şəb ol dilrübadən həzz,
Gəhi busi-ləbindən, gəh şərabi-dilgüşadən həzz.
Baxıb ayinəyə müjganü əbrusilə oynar çox,
Bəli, adət budur kim, türk eylər tirü yadən[1] həzz.
Dili-sərgəştəmi zülfündə tapdım, şadman oldum,
Kişi qürbətdə eylərmiş görəndə aşinadən həzz.
Edər gəhvarəsin təhrik çün ətfali-gülzarın,
Gül eylər gülşən içrə cünbüşi-badi-səbadən həzz.
Visali-yar qədrin xəsteyi-hicran bilir, ari,
Şikəstə üstüxan eylər, həqiqət, mumyadən həzz.
Nə bilsin bibəsərlər qədri-feyzi-nuri-rüxsarın,
Müşəxxəsdir bu kim, əmalər etməzlər ziyadən həzz.
O gündən kim, mənim, Seyyid, təbibim ol Məsihadır,
Ümidi-səhhət etməm, canü dil eylər dəvadən həzz.

[İstinad1: Yaydan.]

Hanı bir cövhər ola badeyi-səhbadən əvəz?
Mürdələr zində qılan kimdi Məsihadən əvəz?
Gər mürəkkəb edəsən aləmin əczalarını,
Ola bilməz meyi-gülfami-müsəffadən əvəz.
Xublərdən necə sənsiz eləyim könlümü şad,
Aləmi-surəti kim eylədi mənadən əvəz.
Görəsən zati-həq isbatına, ey İbrahim,
Məhü xurşid olumi sağərü minadən əvəz?
Sanma kim, qeyr sənə mən kimi olsun, ey gül,
Olumi zağü zəğan bülbüli-şeydadən əvəz?!
Hər məkanda eləyib çünki təcəlla rüxi-yar,
Eybi yox məscid əgər olsa kəlisadən əvəz.
Seyyida, etmə rəha piri-müğan damənini,
Kimdir ol kəs ki, ola həzrəti-mövladən əvəz.

halımı bil, ey səba, etməgə cananə ərz.
Bülbüli-bidil qəmin eylə gülüstanə ərz.
Zülfü-xəyalı məni qıldı pərişan, səba,
Eylə bu əhvalı ol zülfi-pərişanə ərz.
Şanəyə ərz etmişəm çaki-dərunum, vəli
Eyləyə bilməz gedib kakilüvə şanə ərz
Cənnəti-kuyində bir adəm idim mən, vəli,
İndi görüb zillətim, qıl o pəri şanə ərz.
Bijəni-könlüm qalıb çahi-bəladə əsir,
Eylə bu halı səba, Rustəmi-dəstanə ərz.
Qoy məni ərz eyləyim ol gülümə halımı,
Etsə gəda, eybi yox, halını sultanə ərz.
Kimsənədən olmadı dərdinə, Seyyid, əlac,
Eyləmə hər nakəsə haluvi əfsanə ərz.

Gəldi bahar, gəlmədi ol gülüzarımız,
Ya rəb, görüm xəzanə dönə novbaharımız.
Saldı arayə təfriqə gülçini-ruzigar,

Ol gül yanında qalmadı bir etibarımız.
Gül-gül dəyib sirişki-tərim, çeşmi-xunfəşan,
Ey sərv laləzarə dönübdür kənarımız.
Zənnim budur ki, həşrdə şahini sındıra,
Səncidə olsa əcri-şəbi-intizarımız.
Biz bir qətar naqələrik dəşti-eşqdə,
Lakin düşübdü nakəs əlinə məharımız.
Derlər ki, verm ə ol məhi-bimehrə ixtiyar,
Eylə bilillər əldə qalıb ixtiyarımız.
Gördü o tari-türreyi-pürpiçü pürxəmi,
Seyyid, kəməndə düşdü dili-biqərarımız.

Dəmbədəm nalə qılır hiç həvadən düşməz,
Ney təki sineyi-üşşaq nəvadən düşməz.
Zinəti-beyti-xuda pərdeyi-müşkin ilədir,
Xət hicabilə rüxi-yar səfadən düşməz.
Gər desəm aydı yer üstündə gəlib rəftarə,
Əql bavər eləməz, mah səmadən düşməz.
Yar olan yerdə nədir xublərin didarı,
Gün tülu eyləsə bir zöv, Sühadən düşməz.
Gün çəkibdir gözünə xaki-dəri-dildarı,
Bu səbəbdəndi ki, bir zərrə ziyadən düşməz.
Xal ziri-ləbi-canpərvərüvə vacib imiş,
Nöqtə saqit oluban rəsmdi «ba»dən düşməz
Nə görüb bilməyirəm fəqrü fənadən Seyyid,
Bir zaman arizuyi-fəqrü fənadən düşməz.

Xəbər ol sərv-qamətdən mənə badi-səba verməz,
Nihali-arizuyə lütf ilə nəşvü nüma verməz.
Qoyub xaki-dərin çəkmə gözə köhli-Sifahanı,
Bu rövşəndir cilayi-didə hər bir tutiya verməz.
Qəbuli-feyzi-vəsli-yarə istedadımız yoxdur,

İnani-gəştini hər badə əldən naxuda verməz-
Sınıbdır xatirim səndən, dəxi ahü fəğan etməz,
Qalıb qəm guşəsində bir sınıq ney tək, nəva verməz.
O çini-zülfdən sındı könül, düşdü sədasından,
Bu çindir ki, əgər çini şikəst olsa səda verməz.
O gunə rəşk var məndə, görün ey mərdümi-aləm
Özümlə ol pərinin vəslinə könlüm riza verməz.
Üzündən nurüvi kəsb etməsə xurşid əgər, ey məh,
Bu, gün tək xəlqə-rövşəndir ki, afaqə cila verməz.
Səri-mückanə, ey kül, təkyə eylər çeşmi-bimarın,.
O kimdir kim, əlinə aqibət gərdun əsa verməz.
Mətai-şer o qədr ərzan olub aləmdə, ey Seyyid,
Ki, əbnayi-zaman yüz nüktəyə bir mərhəba verməz.

Mey içməyən, bu müşəxxəsdi, əhli-hal olmaz.
Desəm ki, zahidi bizövqdir, vəbal olmaz.
Küsufi-xətt ilə yüz qarələnsə rüxsarın,
Könüldə zərrə qədər mehrimə zəval olmaz.
Qaşın tək ay başına, ey qəmər, hila yəqin
Desəm ki, aydır üzarın mənə vəbal olmaz.
Yeyibdi mazini, müstəqbələ dikib gözünü,
Bu gunə əbdi-şikəm qazi əhli-hal olmaz.
Necə bərabər edim məscidə mən, ey zahid,
Fəzayi-meykədədə zərrəcə məlal olmaz.
Əgər o şəh çəkə şəmşir qətli-üşşaqə,
Yetər nəhayətə ömrüm, mənə məcal olmaz.
Müridi-piri-müğanik, cahanda biz, zahid,
Sənə məhal isə cənnət, bizə məhal olmaz.
Səfiri-xameyi-canpərvərindən, ey Seyyid,
hanı o fəsl ki, bülbül çəməndə lal olmaz.

Mənə ol mahi-bimehrim yəqinimdir ki, ram olmaz,
Nedim[1] kim, mehri çıxmaz sinədən, ömrüm tamam olmaz.
Muradi-yar əgər eşq əhlini nakam qılmaqdır,
Bu eyni kamdır, billah ki, bundan yaxşı kam olmaz.

Səfayi-xatir ilə səylər qıllam, nə hasil kim,
Mənimçün Kəbeyi-kuyində, ey gül, bir məqam olmaz.
Qənimət bil bu gün, ey dil, şərabi-bəzmi-dildarı
Ki, əhli-eşq üçün ol mahdən şəfqət müdam olmaz.
Eşitdim mey həram olmuş, ləbi-dildardən sordum,
Dedi kim, yar olan yerdə meyi-gülgun həram olmaz.
Nəzərdən yar getçək qarət etdi qəm könül mülkün,
Bu rövşəndir ki, şəhsiz mülkdə hərgiz nizam olmaz,
Əgər aşiqsən ol bimehrə, rüsvalıqdan ar etmə,
Məhəbbət əhlinin fikrində, Seyyid, nəngü nam olmaz.

[İstinad1: Nə edim]

Çərxi-dun eşq əhlinin kamınca dövran eyləməz.
Ta ki, üşşaqı cəfadən xakə yeksan eyləməz.
Bir gül açmaz dövri-gərdun gülsitani-dəhrdə,
Qönçə tək ta əndəlibin bağrını qan eyləməz.
Mərdümi-dana iləndir kineyi-çərxi-dəni,
Yoxsa bu dövranı dönmüş qəsdi-nadan eyləməz.
Görsə nadanda əgər bir dərd, eylər yüz dəva,
Arifin yüz dərdi olsa, bircə dərman eyləməz.
Eyləməz fərzin Nəvaini fələk yüz gestərib,
Ta onu fərmanbəri-şahi-Xorasan eyləməz.
Əsbi-kamə-fili-çərx etməz Füzulini süvar,
Ta piyadə dəşti-qəmdə matü heyran eyləməz.
Qəm büsatın xətm edibdir dövr Seyyid adına,
Kim nəzirin dəhrdə hərgiz nümayan eyləməz.

Cənnət olurmu guşeyi-meyxanədən əvəz.
Ya Səlsəbil sağərü peymanədən əvəz.
Vermə mənə müfərrihi-yaqut, ey həkim,
Olmaz səfadə ol ləbi-cananədən əvəz.
Səd çak eylədim dili-məcruhü şanə tək,
Şayəd o müşki-muyə ola şanədən əvəz.
Düşdüm o şuxi-hiləgərin dami-zülfünə,
Xali-siyahı oldu mənə danədən əvəz.

Şəmi-rüxün ki verdi ziya bəzmi-aləmə,
Yandım o şəmə hər gecə pərvanədən əvəz.
Gənci-kəmal layiqi-bu xakidan degil,
Bir başqa mülk varmı bu viranədən əvəz?
Seyyid ki gördü sən büti-tərsanı, ey pəri,
Zünnarı qıldı səbheyi-səddanədən əvəz.

Yüz il gər hicr çəksə qəlbi-aşiqdən səfa getməz,
Tila xak içrə qalmaqla vücudundan cila getməz.
Edərsən cari mövci-əşkimi, ey çərx, qafilsən,
Ki bu seyli-rəvan ilə gözümdən tutiya getməz.
Üzündə zahidin yüz gunə olsa buriya nəqşi,
Riyadandır bu işlər, hiç ondan bu riya getməz.
Əgərçi zülfi-pürçinin desə dil nafeyi-Çindir,
Bu çindir, ey qəzali-müşkmu, dildən xəta getməz.
Dəhanın öpsə aşiq, incimə, var sirri-pinhanı,
Küsüb bir yoxdan ötrü aşinadən aşina, getməz.
Könül qərq oldu əşki-alə, lakin narə cazibdir,
Su içrə qalsa da xasiyyəti-ahənrüba getməz.
Qalıbdır şişeyi-çeşmimdə, Seyyid, əksi-rüxsarı,
Gedər zövi gözümdən,leyk hərgiz bu ziya getməz.

Könüldə jox qərarü səbr, ej arami-can, sənsiz,
Olubdur cismi-zarım firqətindən natəvan sənsiz.,
O gündən kim gözümdən qaib olmuş mahi-rüxsarın,
Olubdur çeşmimə tarik jeksər bu cahan sənsiz.
Degil mümkün, jazıb izhar qılmaq şərhi-hicranın,
Zibəs ki, xatirim aşüftədir, ej dilsitan, sənsiz.
Gözüm jaşı qəmində ağlamaqdan döndü dərjajə,
Məni axır həlak ejlər bu çeşmi-xunfəşan, sənsiz
Məni əhbablər təklif edər sejri-gülüstanə,
Nə mejli-bağ edər könlüm, nə fikri-gülsitan sənsiz.
Mənim bağım, baharım, həm gülüm, həm bülbülümsənsən
Nə lazımdır mənə bağü baharü busitan sənsiz.

Tökər xunab gözdən sübhü şam ağlar fərağından,
Olubdur qəm əsiri Sejjidi-bixaniman sənsiz.

Nəxli-ənduhü bəlajıq, dərdü qəmdir tuşəmiz,
Əbri-azarü cəfadən su içibdir rişəmiz.
Camü badə qəsdini etmişdi çoxdan möhtəsib,
Bəxtəvər bivəxt atdı daş, sındı şişəmiz.
Dürri-bəhrejni-dü çeşmə ta o məhdir müştəri,
Mövci-əşki-al ara qəvvaslıqdır pişəmiz.
Naxuni-qəmlə bizi Fərhadə nisbət etməjin
Kim, jıxar bir gündə jüz min Bisütunu tişəmiz.
Sejjida, biz vaqiati-şami-hicran görmüşük,
Hövli-ruzi-həşrdən olmaz bizim əndişəmiz.

Məsti-ləlin sağərü səhbayə eylər etiraz,
Aşiqi-ruyün güli-həmrayə eylər etiraz.
Maili-çeşmin olan badamə etməz iltifat,
Bağə getməz, nərgisi-şəhlayə eylər etiraz.
Etməzəm səndən siva rüxsarına bir zərrə meyl,
Talibi-xurşid olan kəs ayə eylər etiraz.
Bu uzun müddətdə təhqiq eylədim bu əmri kim,
Talibi-zülfün şəbi-yeldayə eylər etiraz.
Can alıb bir busə versən ləblərindən, ey pəri,
Sanma ki, Seyyid belə sövdayə eylər etiraz.

Baği-aləmdə mənə bir güli-rənadı qərəz,
Bir qədi sərv, üzü laleyi-həmradı qərəz.
Əhədü Əhmədü Məhmudü Əbülqasimdən,
Zahirən ismdi, amma ki, müsəmmadı qərəz.
Ey könül, cilvəgəhi-dustdü səcdəgəhimiz,

Kəbəvü deyrü nə məscid, nə kəlisadı qərəz.
Surəti-zahirə hərçənd ki, var rəğbətimiz,
Leyk əlfaz oxumaqdan bizə mənadı qərəz.
Bülbül istər gülü, pərvanə sevər şəmi, vəli
Bizə nə şəm,.nə ey dil, güli-rənadı qərəz.
Xəlqi-insanda nə surət, nə həyula, Seyyid,
Nükteyi-müxtəfiyi-sirri-süveydadı qərəz.

İstərəm bir gülü nə bağü nə bostan gülüdür,
Bülbüləm bir gülə kim, rövzeyi-rizvan gülüdür.
Eşqimi eyləmə nisbət özüvə, ey bülbül,
O sənin istədigin fəsli-gülüstan gülüdür.
Cümleyi-rövzeyi-rizvanda tapılmaz belə gül,
Güli-xoşrayihədir, çünki bu Qazyan gülüdür.
Bu güli-xilqəti-xaliqdə lətafət çoxdur,
Sanma, kim, bu güli-xoşrayihə Səlyan gülüdür.
Ey xuda, kim çəkər axırda gülabın bu gülün,
Dərdi-sər dəfinə aləmdə bu, dərman gülüdür.
Ərəqi-ruyi-Məhəmmədən olub gül zahir,
Bu güli-tazə məgər, ol şəhi-dövran gülüdür.
Ya Məhəmməd özüdür, gül ərəqi-pakı onun,
Rüxi-zibayi-dilarası bunun can gülüdür.
Səlavat eylə görüb surəti-pakın, Seyyid,
Rüxi-həmrası bunun xaliqi-sübhan gülüdür.

Bu günkü bəzmdə cami-şərabımız yoxdur,
Qara olub günümüz, afitabımız yoxdur.
hədisi-hüsnü məhəbbətdi dərsimiz ki, bizim
Cəmali-yardən özgə kitabımız yoxdur.
Əcəbmi nameyi-əmalımız qalırsa səfid
Ki, səbt olunmalı cürmü səvabımız yoxdur.
həmişə şer deyib, mey içib, cavan sevərik,
Ziyadə felə bizim irtikabımız yoxdur.
Əli məhəbbətidir qəlbimizdə nöqteyi-eşq,
Təğəyyür eyləmənik inqilabımız yoxdur.

Nə qəm mühasibeyi-ruzi-həşrdən, Seyyid,
Sualə layiq olan bir cavabımız yoxdur.

Məni gədalığa ol yari-pürsitiz istər,
Həzar şükr ki, yarım məni əziz istər,
Gəlibdi cilvəyə ol sərv qəddü qamətlə,
Müşəxxəs oldu ki, aləmdə rəstəxiz istər.
Tökər sirişk gözüm, su verir o, müjganə
Ki, qətli-am üçün ol tiği-tündü tiz istər.
Səba dəgib dağıdır tellərin üzə hərdəm,
Məgər o, tari-səri-zülfü müşkbiz istər?
Dedim: bu qədr məni, ey həbibim, ağlatma,
Dedi ki, aşiqini yar əşkriz istər.
Üz ilə zülfüvü dərk etmədim lətafətdən,
Seçə qəradən ağı qüvveyi-təmiz istər.
Nə əldə nəqdi-dilü can, nə dinü iymanım,
Bütani-simbədən Seyyid, əldə çiz istər.

Hər aşiqin ki, sən kimi bir gülyanağı var?
Lalə kimi, əyandı ki, köksündə dağı var.
Könlümü tazə dağlərin rövşən eyləmiş,
Şami-qəmində, şükr, onun şəbçirağı var.
Sünbül özünü zülfüvə oxşatdı bir gecə,
Gördü xətadır, indi pərişan dəmağı var.
Ta qoymaya dodağını dilbər dodağıma,
Mən bavər etmənəm ki, o mahın dodağı var.
Ta, xari-möhnətin dili-pürxunə sancılıb,
Ey ,gülüzar, lalə gülün gül fərağı var.
Seyyid yetirdi axır özün xüm ayağına,
Başında şuri-nəşəsi, əldə əyağı var.

Ləli-ləbin səfadə kim, badeyi-nabdən keçər,
Badəpərəst gər onu görsə şərabdən keçər.
Zəxmli könlüm içrə gör navəki-qəmzən, ey pəri,
Keçdi cikərdən eylə kim, six kəbabdən keçər.
Necə ki, əksi-gün keçər mövcli-bəhrdən, elə
Cilveyi-hüsni-tələtin çeşmi-pürabdən keçər.
Keçdi xəyalın, ey pəri, bu dili-dərdnakdən,
Eylə ki, şahi-kamran mülki-xərabdən keçər.
Seyyidə zöhd əgər səvab olsa,.məhəbbətin günah,
Beylə günah, üçün o, yüz eylə səvabdən keçər.

Sövdalərə düşdüm, dedim: allah kərimdir,
Gər yandım, alışdım, dedim: allah kərimdir.
Bənd oldu, könül tari-səri-zülfi-nigarə,
Bu damə ilişdim, dedim: allah kərimdir.
Yandırdı məni şəşəeyi-nuri-cəmalı, .
Bu narə alışdım, dedim: allah kərimdir.
Gəh yaxdı məni hicri-rüxi, gah visalı,
Odlarə tutuşdum, dedim: allah kərimdir.
Xam idi könül düşdü qəmi-buteyi-eşqə,
Ol butədə bişdim, dedim: allah kərimdir.
Seyyid, dolanıb gün təki məcmui-cahanı
Dəryaları aşdım, dedim: allah kərimdir.

Derlər ki, badə ruhə cila, cismə can verir,
Ari verir, gər ol büti-şirinzəban verir
Sanma ki, xanagəhdə görünsün fəqihdən,
Meyxanədə o feyz ki, piri-müğan verir.
Qıllam nisar piri-müğan xidmətində can

Dövran mənə əgərçi əcəldən aman verir.
Canlar fəda o şişəyə kim, zərfi-badədir,
Qurban o dəstə kim, o meyi-ərğəvan verir.
Seyyid şərabı məzhəri-həq bilsə, ney əcəb
Kim, sağəri-şərab xudadən nişan verir.

Şərabxanədə, vaiz, nigarü sağər var,
Sənin əgərçi behiştində hurü Kövsər var.
Danışma həşr sözün çox da, həqdə rəhməti gör,
Bağışla sən, bilirik biz də ruzi-məhşər var.
Ləbini bir neçə ildir ki, öpmüşəm yuxuda,
Hənuz künci-dəmağımda təmi-şəkkər var.
Üzün görüb gəli kim, şəxsi-kafər iymanə,
Müşəxxəs oldu ki, hər əsrdə peyəmbər var.
Sənin bu hüsnüvə layiq degil şərab içəsən,
Ki seyqəli-mey açar səndə hər nə cövhər var,
Xətin üzündə görüb söylədi münəccim kim,
Diyari-Rumə həbəşdən bu ayda ləşkər var.
Dedin ki, Seyyid,bax ayə, ey hilaləbru,
Məgər bu.şəhrdə sən tək məhi-münəvvər var?

Üzün hədisini dün söylədim bir ayə qədər,
Görək ki, şərhini vaiz bilir bir ayə qədər?
Səfayi-Kəbeyi-kuyin taparmı şeyxi-hərəm
Əgər yüz.il yügürə Mərvdən Səfayə qədər.
Dedim:visalın üçün çox dualar eyləmişəm,
Dedi:çatıbdı sənə etdigin duayə qədər.
Dünənki gün də gün idi, bu gün də bir gündür
Vəli təfavütü var ərzdən səmayə qədər.
Bu qədr Seyyidə cövr etmə, ey məlaikxu,
Fəda olum sənə, ölməzmi bu cəfayə,-qədər?

Ruhun qidası gərçi meyi-ləlfamdır,
Hər kəs ki, yarsız içə, billah həramdır.
Yari-müvafiq olmasa, meydən nə faidə,
Mey bəzmi birəfiq ola gər, natəmamdır.
Baxma fəqihin eylədkgi dərsü bəhsinə,
Adabi-eşqdən xəbəri yox, əvamdır.
Zahid riyayi-taət ilə cənnət istəyir,
Xud bilməyir özü ki, bu iş fikri-xamdır.
Seyyid, həyat isə qərəzin ruzigardən,
Get badə iç ki, şərbəti-yöhyil-izamdır.

Ey mələksima, cəmalın rəşki-cənnət bağıdır,
Qamətin Tuba, ləbin guya ki, gül yaprağıdır.
Cismi-zarım əşki-çeşmimdən pozulsa ney əcəb,
Tez tapar rəxnə, bəli,bir yer ki, su oynağıdır.
Ləşkəri-qəm könlümün mülkini viran eylədi,
Padşahım, bir tərəhhüm qıl, mürüvvət çağıdır.
Vaiza, təqrir qılma çox da ruzi-həşrdən,
Aşiq üçün ruzi-məhşər yarın ayrılmağıdır.
Hər yetən şuxi-cəfapişə mənə eylər sitəm,
Bu bəla çəkmiş vücudum xublər tapdağıdır.
Lalələr kim, baş verib xaki-məzarımdan çıxar, <
Firqətindən çəkdigim sinəmdə həsrət dağıdır.
Lütf edib bir gün nolur sorsan pərişan halımı, «
Seyyidi-sərgəştə zülfi-pürxəmin dustağıdır.

O qəragöz ki, mənim eşqdə sultanımdır,
Xaki-payı gözümə köhli-Sifahanımdır.
Nə pəri sədməsidir sərdə, nə sövdayi-cünun,
Məni Məcnun edən ol zülfi-pərişanımdır.
Sanma kim, arizi-alın xət ilə oldu siyah,
Səni, ey mahi-pəriçöhrə, tutan qanımdır.
Qaldı can, çəkdilər ol şuxun oxun cismimdən,

Eylə bildim ki, oxu qaldı, çıxan canımdır.
Getmə kəc, ey dili-şeyda, o hilaləbrunun,
Gər desəm mah üzün, eşqdə nöqsanımdır.
Xızr al səbzxətin təng dəhanın görcək,
Basdı kim bağrına, bu çeşmeyi-heyvanımdır.
Seyyid, ol şəm qəmindən kecələr sübhə kimi
Yanan əhvalıma kim, bu dili-suzanımdır.

Şərabi-nabdə hərçənd zövqü behcət var,
Vəli o şux ilə içməkdə özgə halət var.
Zəmanə tək yetirib hüsndə bu Şirvanı,
Gəzin,təfəhhüs edin,əlli min vilayət var.
Deyirlər aqibətül-əmr bir qiyamət olur,
Bu şəhr içrə, vəli, kündə yüz qiyamət var.
Deyirlər özgə yerin əhli-hüsnü zibadır,
Bu şuxlərdə, vəli, başqa bir məlahət var-
Baxın bu məclisə diqqətlə bir sizi tari,
Nə yerdə bunlara manənd hüsni-surət var?
Yığıbdılar bu büsat içrə hurü qılmanı,
İnanmazam desələr bundan özkə cənnət var.
Bu bəzmi-işrət ara Seyyidi salın yadə,
Gedibdi xakə, vəli, sinəsində həsrət var.

Rindlər meyxanəni cənnət ki derlər, doğrudur^
Doğrudur bu söz, bəhəqqi-abi-Kövsər, doğrudur.
Sağəri derlərdi «kəsül-həq», degilmiş iftira,
Saqini derlərdi zati-həqqə məzhər, doğrudur.
Cənnəti dünyadə hərgiz bavər etməzdi fəqih,
Görcəkin ruyin dedi: «allahu əkbər!»doğrudur!
Ta ki gəldi xət,üzari-yarə bildim, ey könül,
Ol ki, derlərdi gəlir iymanə kafər, doğrudur.
Badəni derlər edib nəss ilə peyğəmbər həram,
Yarsız içsən, bəli, hökmi-peyəmbər doğrudur.
Gəndümi-xalinə yarın verdi Seyyid cənnəti,
Əsl Adəm oğludur, billah, bəradər, doğrudur.

Ey gül, nə rəvadır səni meyxarə desinlər,
Bədnam desinlər səni avarə desinlər.
Xəlvət nə rəva qeyr ilə, ey Yusifi-sani,
Kim, pirəhəni-ismətüvi parə desinlər.
Xurşidi-mey ardınca səni hər gecə ta sübh,
Ey mah, nə layiqdi ki, səyyarə desinlər.
Hər qəlbi qara nakəs ilə eyləmə ülfət,
heyfa,səni aləmdə üzüqarə desinlər.
Seyyid təki etmə həvəsi-badeyi-gülgun,
Qorxum budur, ey məh, səni meyxarə desinlər.

Dəhrin mənə sənsiz bu baharı nə gərəkdir?
Gülzari-çəmən sövti-həzarı nə gərəkdir?
Aşüftə könül tari-səri-zülfüvü istər,
Sünbül mənə sənsiz, səni tarı, nə gərəkdir?
Ətri-səri-zülfün mənə mətlubdur, ey gül,
Əttarların müşki-tətarı nə gərəkdir?
Hər gecə ki, ağuşi-xəyalımdadır ol mah,
Zahirdə olan busü kənarı nə gərəkdir?
Ey zahidi-xudbin, yeri, öz eybinə kur ol,
Xəlqin sənə bu eybü əvarı nə gərəkdir?
Bibadeyi-gülgun bizi məst eylədi saqi,
Minbəd meyin rəncü xumarı nə gərəkdir?
Qonşu toyuğu qaz görünür qonşuya, Seyyid,
Öz yarüvi tut, özgə nigarı nə gərəkdir?

O reyhani xətindən üzlərin kim,rəng tutmuşlar,
Qübar ilə iki ayinədir kim, jəng tutmuşlar.
Rüxü çeşmin alır hər gündə bir rəng ilə yüz min can.
Nə yüzdən bunlar, ey məh,şiveyi-nirəng tutmuşlar.
Tutan kimdir bərabər ləli-nabı səngi-xarayə,

Olar kim ləblərin yaqut ilə həmsəng tutmuşlar.
Eşitmişlər dəhanın vəsfini çün səhni-gülşəndə
Səbadən, qönçələr kim, özlərin diltəng tutmuşlar.
Müğənnilər şəbi-hicran xəyali-tari-zülfünlə
Atıb mizrabı əldən, cümlə zülfi-çəng tutmuşlar.
Görüb rüsvalığım zövqin, atarlar nəngü namusu,
Olar kim özləriyçün rəsmi-namü nəng tutmuşlar.
Yanında əndəlibin, Seyyida, zağü zəğənlərdir
Olar kim nəğmeyi-əşarüvə ahəng tutmuşlar.

Təsəvvür etmə fəğanım həlaki-candandır,
Kəman öpər əlüvi, ələmanım ondandır.
Könül, yaxıb oda döndərmə suyə peykanın,
Bu tir kim, mənə ol qaşları kəmandandır.
Əcəbmi çeşmeyi-xurşid dəhri rövşən edər,
Gözündə sürməsi ol xaki-asitandandır.
Könüldü lalәsifət dağdar sər ta pa,
Bu töhfələr mənə bir özgə gülsitandır.
Ziyanı yox, alıban canı verdilər qəmini,
Məhəbbətində bizim sudumuz ziyandandır.
Gedib, o mahı neçə gündü, mən genə görürəm,
Bu qüvveyi-bəsər ol gərdi-karvandandır.
Kəbudi camə ilə gəldi ol səhibala,
Bəla ki, Seyyidə nazildi, asimandandır.

Hər ləhzə kim, xəyalıma ol simbər gəlir,
Tanrı bilir ki, bu dili-zarə nələr gəlir!
Şövqi-rüxiylə çeşmimə aləm gəlir behişt,
Yadi-ləbiylə ağzıma təmi-şəkər gəlir.
Gəldikcə ömrüm, oldu füzun dərdü möhnətim,
Bu doğru sözdürür ki, il-ildən bətər gəlir.
Ey dil, getürmə navəki-ahi-səhərdən əl,
Bu oxların, olur ki, biri kargər gəlir.
Bu xali-müşkfam ki, ruyindədir
Kəbə qopub,ziyarətüvə həm həcər gəlir.
Novmid qılma zülfüvü üzdən kənar qıl
Kim, ruzü şəb nəzarənə şəmsü qəmər gəlir.

Əzbəs ki, sancılıb tənimə ox ox üstünə,
Seyyid, görən deyər ki, sənə balü pər gəlir.

Saralmış rəngimi atəşsifət cani-şərab eylər.
Əçəb iksirdir kim, kəhrübanı ləlixnab eylər.
Soruşdum kim, neçin ənguru dehqan paymal etdi,
Dedilər kim,pozub yüz kövkəbi bir afitab eylər.
Hicab oldu üzari-yarə xətti-ənbərəfşanı,
Görünməz şərmdən eşq əhlinə ol gül, hicab eylər.
Əgər daş olsa dözməz xublər bidadına, bilməm
Nə eylər kim, könül bunca cəfavü cövrə tab eylər.
Yetişmiş rəşkdən ol həddə halım kim, məni.ol şəo
Çəkib tiği-cəfa öldürsə,billah,min səvab eylər.
Yeyər mali-yetimi zahid, iymanın verər badə,
Əcəbdir kim, bu gül tək badədən ol ictinab eylər.
Xəyali-ruyi, Seyyid,qərü ənbiqi-dü çeşmimdən,
Sirişki-alımı təqtir ilə eyni gülab eylər.

Qıldı məni həlak bu bimehr mahlər,
Rəhm eyləməz gədayə məgər padşahlər?
Qurban olum sənə, qədəğən eylə çeşmüvə,
Etmiş qara günümü o çeşmi-siyahlər.
Gəh qəmzədən atar mənə yüz navəki-bəla,
Gəh işvədən çəkər dilə hər dəm sipahlər.
Ahi-səhərdən eylə həzər, tökmə qanımı,
Qorxum budur əsər qıla, ey şəh, bu ahlər.
Bir dadə yet ki, ərşə çıxıb ahü əlaman,
Yol üstə fövc-fövc durub dadxahlər.
Ta tövbə girməgə araya yer tapılmasın,
Peydərpey eylərəm gecə-gündüz günahlər.
Ol novxətə şikayət üçün dil açar təmam,

Seyyid, məzarın üstə bitən tər giyahlər.

Derlər ki, içmə badəni ümmül-fəsaddır.
Ari,fəsaddır ona kim, bədnihaddır.
Hər kəsdə Hər təbiət ola mey büruz edər,
Ərbabi-halə hal, fəsadə fəsaddır.
Piri-müğan edibdi bizə badəni həlal,
Qurban bu ictihadə, əcəb ictihaddır.
Bir şişə mey qoyun ləhədim içrə dəfn edin
Kim, bu cahandən mənə zadül-məaddır.
həqdən şərabxarı o kim, naümid edər,
Seyyid, o da sənin kimi bədetiqaddır.

Hər il ki, Kəbəyə hüccac tazə-tazə gedərlər,
Bilib ol evdə məgər xaliqi, niyazə gedərlər.
həcər o xal,üzün Kəbə,qarə örtügü zülfün,
Qoyub səni, niyə hüccaclər hicazə gedərlər.
Səfavü Mərvə o beytin ki, rükni-əzəmisən,
Əgər səni arayıb getməsə,güdazə gedərlər.
həqiqi Kəbəsi sənsən həqin, nə səngü gil, ey gül,
Qoyub həqiqəti aləm,rəhi-məcazə gedərlər.
Bu zövqü bilməyənin olma hiç halına münkir,
Həq əhli həq yoluna çəngü udü sazə gedərlər.
Gəlirdi cismə oxun,çıxdı can qabağına,ari,
Əziz dust gələn dəmdə pişvazə gedərlər.
Könül,sən ol sənəmin səc də qıl cəmaluna,bari,
O dəm ki,əhli-vərə məscidə nəmazə gedərlər.
Gələn ziyarəti-beytül-həramdən dəxi, Seyyid,
Yeməz həlal, məgər almağa icazə gedərlər.

Şərabi-nab ki, xurşidi-aləmaradır,
Cahanə feyzi onun gün kimi Hüveydadır.
Piyalə tut, elə cami-cahannümayə nəzər--
Ki, cümlə sirri-əzəl onda faşü peydadır.
Şərabi-nabdə yox eyb,eyləməz töhmət
O kəs ki, zatı onun eybdən mübərradır.
Ümidi-cənnət ilə taət eyləyir zahid,
Qəribə beyü şəradır, əcibə sövdadır!
Çıxıbdı minbərə vaiz,salıbdı taqə səda,
Məgər ki, xəbta-dəmağ etdi,bu na qovğadır!
həvayi-zülfi-çəlipayi-yari-tərsadən,
həmişə mənzilimiz guşeyi-kəlisadır.
Gülün gülabını əttar çəkdi, ey Seyyid!
Vəli cəfanı çəkən əndəlibi-şeydadır.

Könül ümmidi-vəslilə qəmi-hicranə səbr eylər,
əvayi-cənnət ilə atəşi-niyranə səbr eylər.
Muradı bir Əzizin olsa Yusif kimi sultanlıq,
Çəkər ixvan cəfasın, möhnəti-zindanə səbr eylər.
Könül xurşid rüxsarından, ey mahi-hilaləbru,
Dönüb bədr olmaq üçün zilləti-nöqsanə səbr eylər.
Düşüb sövdayi-eşqə tari-zülfi-tabdarından,
Əgər zəncirə bağlansa dili-divanə, səbr eylər.
Məni yandırdın axır atəşi-hicranə, yan durdun,
Dedin yan nari-eşqə, katəşə[1] pərvanə səbr eylər.
Gülüstani-cahanda gül sevən çəkməz xəzan qeydin,
Əgər bidad ilə könlü dönərsə qanə, səbr eylər.
Əzəldən lafi-eşq etdin, bəlayə səbr qıl, Seyyid,
Düşən dəryayə,ari,möhnəti-tufanə səbr eylər.

[istinad1:Ki atəşə]

Rumi-rüx üzrə fövci-xət etdi üburlər,
Rəxnə salıbdı mülki-Süleymanə murlər.

Etdi,hilali-yekşəbə əgri qaşınla bəhs,
Bu rast imiş ki,qürrələnir novzühurlər.
Mu sayə saldı yari-dilarə cəmalına,
Musayə məxfi oldu bu Tur üzrə nurlər.
Yarın mürurunu mənə çox sanma, ey rəqib
Bu iltifatı gözləmişəm çox mürurlər.
Eşqində bunca möhnətü nöqsanə düşmüşəm,
Ol mahın həqqi var mənə etsə qürurlər.
Eşqin yolunda qəm verə üz,aşiq inciməz
Kim, hər qəmində var neçə məxfi sürurlər,
Seyyid, həzar şükr ki, bəzmi-nigardə,
Saqi əlində var genə cami-bülurlər.

hər kimin camı var əldə gözünə cəm görünür,
Məni Cəmşid qılan pəs meyi-Dərqəm görünür.
Əgər ayineyi-İskəndərə vardır meylin,
Baxgilən cami-meyə gör ki, nə aləm görünür.
Daneyi-qurəni mən takdə gördüm deyəsən
hamilə ruhə olan İsiyü Məryəm görünür.
Vəsli-yarə yetişib qeyr,mən oldum məhrum,
Eydi-novruz mənə mahi-məhərrəm görünür.
Xəmi-əbrusu olub bəs ki,dilə nəqşi-zəmir,
Eyləsəm sərvə nəzər, indi mənə xəm görünür.
Seyyida, cənnəti-didardən oldun məhrum,
İndi aləm mənə,bir nari-cəhənnəm görünür.

Miskin könül genə özünü yarə göstərir,
Guya tapıb təbibini biçarə, göstərir.
Dövri-ləbində xət degil ol sərvi-gülrüxün,
Guya bənövşəşərbəti bimarə göstərir.
Ta rumi-ruyün etməyə pamali-zəngi-xət,
Xali-siyəh bu kişvər ara qarə göstərir.
Göz göstərir dilə xəmi-əbruyi-məhvəşi,
Guya hilali-eyd tapıb, yarə gestərir.
Əğyarı görcəgin mənə çox eylər iltifat,
Ol şuxi-dilfirib özün əğyarə göstərir.
Verdi nişan rəqib o məhi qeyrə seyrdə,
Əxtərşümarə.döndü ki,səyyarə göstərir

Göstərsə yarə könlünü var vəchi Seyyidin,
Öz xaneyi-xərabını memara göstərir.

Olsun günüm o gün ki, gələ yardən xəbər,
Badi-səba verə genə gülzardən xəbər.
Qıldı kənarə zülfünü rüxsari-yardən.
Verdi nəsimi-sübh dili-zardən xəbər.
Kuyində göz yaşımı görüb,tutub ol pəri,
«Cənnati-ədnin-təhtəhəl-ənhardən»[1]xəbər.
Balində yatmaq aşiqi-zarə həramdır,
Mənsuru axtaran kəs alır dardən xəbər.
Çeşmin cəfasını nə bilir məst olmayan,
Amma bu halı zahidi-huşyardən xəbər.
Turu dağıtdı yar təcəllası, ey könül;
Musa bilirmi dövləti-didardən xəbər?
Zülfi-siyahına olanı aşiq ol bütün.
Seyyid,varımdı rişteyi-zünnardən xəbər.

Ol sərkəşidə qəd kimi az sərvinaz olur,
Söz rast xoşdu,vəsfini qılsam diraz olur.
Pərvanə şəmə aşiq olub,mən cəmalüvə,
Məhmud könlü talibi-Hüsni-Əyaz olur.
Seyd etdi mürği-könlümü şahbaz gözlərin,
Az ruzgardə bu sifət şahbaz olur.
Kuyin müqimiyəm,nə qəm,eyməndi qətldən
hər seyd kim, dəxili-hərimi-hicaz olur.
Gər yar naz qılsa,niyaz eylə, eykönül,
Məşuqun aşiqə işi peyvəstə naz olur.
Oxşatma ahü nalәmi bülbül fəğaninə,
Mən yanmışam,təranələrim cangüdaz olur.
Cövrü cəfayi-yar ilə artar nəvazişim,
Bidadi-yar aşiq üçün dilnəvaz olur. -
Ey ləli gülşəkər, bu lətafətdə bir səhər.
Gər görsə ağzını,dəhəni-qönçə baz olur.
Sən ol hümayi-hüsnsən,ey sərvi-gülrüxüm,

Gər xarə sayə salsa qədin,sərfəraz olur.
Nəqqaşə aşiq oldu könül nəqşi-yardən,
Eşqi-həqiqət əvvəli,ari, məcaz olur.
Ən qəsd,Cürmiyə elədil iczü inkisar,
Məşhurdur kəpəklə köpək könlü saz olur.
Cürmilə çoxdu bu qəzəlin fərqi,Seyyida,
Gər simi-şerə bir məhəki-imtiyaz olur.

Rüxsari-yar zinəti xətti-qübarıdır,
Reyhan,şikəstə,sünbül bnun xaksarıdır.
Gördükdə,lalə dağını rəşk öldürür məni --
Kim,bəlkə bu mənim gülümün dağdarıdır,
Xət gəldi ruyi-yarə,füzun oldu rövnəqi,
Ey əndəlib,mürği-dilin novbaharıdır.
Pərtab edibdi tirin o əbrukaman gəlir,
Şad ol könül ki,meyli bizim canə sarıdır.
Məcnun bürəhnə seyr qılır cümlə aləmi,
Meyxaneyi-qəmin bu hələ.huşyarıdır.
Nərgis çəməndə göz açıb, heyrandı hüsnüvə,
Sünbül o zülfi-xəmbəxəmin tabdarıdır.
Candan siva dəhanüvə yox nəzri Seyyidin,
Olsun-qəsəm o canuva kim,yoxü varıdır.

Könlümü şurə salan püsteyi-xəndanındır,
Nəməki-zəxm ləbani-şəkərəfşanındır.
Qönçə tək bağdə hər xarə açıldın, ey gül,
Sinəmi çak edən ol çaki-giribanındır.
Ziri-ləb xəndəkünan,halımı sordun,sənəma!
Məni giryan edən ol xəndeyi-pinhanındır
Neçə illərdi ki,dil fikri-dəhanın eylər,
Xızrı sərgəştə qoyan çeşmeyi-heyvanındır,
Tutuban bağruva basdın o səri-zülfü,könül,>
Belə fikr eylədin ol müşk sənin canındır?!
Ey kəmanqaşlı,atıb ox,ürəgim yarələdin,
Aşiqi-zar genə talibi-ehsanındır.

Gördü,ruyin, sənəma,gəldi-bu gün iymanə,
Seylidi-zar sənin tazə müsəlmanındır.

Fərhad mənəm kim, belə şirinsüxənim var,
Bir arizi gülgun.ləbi şəkkər-şikənim var.
Yox məmləkəti-Reydə şəhi-Nasiridinin,
Bu gövhəri-nayab ki, Şirvanda mənim var.
Bəhreynə dönüb yar,qəmindən iki çeşmim,
Qallı sədəf içrə necə dürri-Ədənim var.
Ol zülfi-siyah.oldu mənim Darsəlamım
Şam içrə,şərif ölkədə ziba vətənim var.
Bəsdir,mənə xaki-qədəmi, xirqeyi-çakım,
Yox qəm ki, nə kafurü nə sidrü kəfənim var,
Batin üzümün şahididir hüsni-kəlamım,
Əlminnətü-lilləh belə vəchi-həsənim var.
Seyyid, nə,gərəkdir mənə ol ləli-Bədəxşan,
Yuz lələ dəgən tazə əqiqi-Yəmənim var.

Əgərçi həşrdə peyda o sərvqamət olur,
Fəzayi-məhşər ara özgə bir qiyamət olur.
Könüldə zəxmimi qanlı sirişkim etdi əyan,
Dənizdə qan balığın zəxminə əlamət olur.
Əgər o mahı Züleyxa görə bu surət ilə,
Həvayi-Yusif ona mayeyi-nədamət olur.
Məgər qiyamə gəlibdir qiyaməti-kübra,
Və ya ki, cilvəgər ol şuxi-sərvqamət olur.
Qədinlə fitneyi-axırzaman olur peyda,
Bu fitnədən özünü saxlayan səlamət olur.
Çəkibdi tiği-cəfa yar, əgər tökə qanım,
Kəmali-lütfdür ol, qayəti-kəramət olur.
Qədin xəyalını hər vəqt kim salır yadə,
Mizaci-Seyyidi-dilxunə istiqamət olur.

Çeşmində qəzəb yoxsa dili-zarım üçündür?
Qəhri o təbibin dili-bimarım üçündür?
Şadəm ki, salır qeyr məni yaduva hərdəm,
Hərçənd ki, yad etməgi azarım üçündür.
Rüsvalığım  oldu səbəbi-şöhrəti-dildar,
Tərki-vətən etdimsə əgər, yarım üçündür.
Hər gecə fəğanım yetişir gögdə hilalə,
Bu nalələr ol əxtəri-səyyarım üçündür.
Sən də gedibən ağla ez əhvaluva, Seyyid,
Fəryadü fəğanım mənim öz yarım üçündür.

Ey hurivəş ki, əksi-rüxün sağərimdədir,
Kövsər zülalı, badeyi-canpərvərimdədir.
İsgəndərəmmi zülmətə, ey Xızr, olam rəvan,
Abi-həyat ləli-ləbi-dilbərimdədir.
Sirri-dəhanı məndən eşit   kim, bu nöqtənin
Təlif olan kitabələri əzbərimdədir.
Ol şəmi-hüsnə yandığım axşamdan bəri
Pərvanələr gözü hamı xakistərimdədir.
Qorxutma, zahida, məni nari-cəhimdən,
Dəryayi-rəhmətin başı əşki-tərimdədir.
Ol qaşı Zülfüqar vuran zəxmi-möhlikin
Cibril tək hənuz əsəri şəhpərimdədir.
Dildən məhaldır ki, edə intiqal eşq,
Seyyid, bu bir ərəzdi ki, öz cövhərimdədir.

Üzün əgərçi behiştin baharına bənzər,
Mənim gözüm də onun cuybarına bənzər.
Edirdi dün ələmi-duzəxi bəyan vaiz,
Bu, aşiqin ələmi-intizarına bənzər.
Kənari-çeşmimə sancıldı oxların ney tək,
Sudan qəmiş bitirən Kür kənarına bənzər.
Görüb məzarımı ol şəhsüvari-hüsn dedi:

Bu, bir şəhidi-qəribin məzarına bənzər.
Tökər bəyazi-rüxə tudə-tudə müşk ol zülf,
Müsəvvirin qələmi-müşkbarına bənzər.
Əritməz atəşi-dil dildə növki-peykani,
Bu, ol kəmanqaşın yadigarına bənzər.
Çəməndə bülbül oxur, ya fəğani-Seyyiddir,
Genə bu nəğmə onun ahü zarına bənzər.

Bu namə kim mənə ol şux dilrubadəndir,
Bu bir ətiyyeyi-üzmadı kim, xudadəndir.
Şikayət eyləmə, biganədən səfa gəlməz,
Nə gəlsə başuva, ey xəstə, aşinadəndir.
Gətirməz arizi-alın baxanda tabi-nigah,
Gər aşiqin üzüvə baxmasa ziyadəndir.
O bağdən məni bir nəkhət ilə şad etməz,
Şikayətim mənim, ey lalərüx, səbadəndir.
Diriğ eyləmə xaki-dərin, gözüm nuri,
Gözüm ziyası mənim, çün bu tutiy adəndir.
Nə yar edərdi cəfa, nə rəqib, nə gərdun,
Zəmanədə bu cəfalər mənə qəzadəndir.
Nə səndə var vəfa, həm nə yardə, Seyyid,
Vəfa bu əsrdə, bil, cinsi-kimyadəndir.

Könül, əlində ki bir cami-xoşgüvarın var,
Büsati-işrətə sərf eylə,çünki varın var.
Nə mayil olmusan, ey dil, bu mülki-dünyayə,
Sənin nişiməni-firdovs tək diyarın var.
Könül, gəlib meyü məhbub ixtiyar eylə,
Bu gündə əldə sənin cüzi ixtiyarın var.
Yamanlıq eyləmə bir şəxsə, yaxşılıq var ikən,
Sənin o zahidi-xudbin ilə nə karın var?
Bahari-zahirin axır nədir tamaşası?
həmişə dildə sənin solmayan baharın var.
Yetişmisən ləbimə, çıxmasan nədən, ey can?

Cəmali-yarə məgər səxt intizarın var?
Məlalət ilə keçirmə səlamət əyyamın,
Bu ömri-kutəhə, Seyyid, nə etibarın var?

Qiyməti-ləli-ləbin sərraflər can etdilər,
Bilmədilər qədrini, billəh ki, ərzan etdilər.
Parə-parə könlümü əldən alıb keysulərin,
Hər biri bir parəsin bir yanda pinhan etdilər.
Közlərin hər qəmzəsi bir aşiqi məqtul edib,
Cansitanlıq rəsmini gör necə asan etdilər!
Bağlayıb zünnarlər zülfün töküldü ruyünə,
Gör ki, axır mülki-dini kafəristan etdilər.
Bir tərəf şanə dağıtdı zülfüvü, bir yan səba,
Hər tərəfdən hər biri könlüm pərişan etdilər.
Möhnəti-hicran, bəlayi-eşq, bidadi-rəqib,
Agəh ol, ey lalərüx kim, bağrımı qan etdilər.
Hər kəsi yazdıqca lövhə çün əzəl katibləri,
Seyyidi-məhzun məqamın beytül-əhzan etdilər. :

Rəmzi-rüxsarını yarın məni-müztərdən sor,
Yəni ayinə səfasini Skəndərdən sor.
Təlxü şirini-rəhi-eşqi nə bilsin Xosrov,
Onu Fərhadi-sitəmdideyi-müztərdən sor.
Zahid inkari-meyi-nab qılırsa, nə əcəb,
Gəl onun zövqünü bu pir-qələndərdən sor.
Ey soran abi-bəqa ləzzətini kim, necədir,
Tapmasan Xızrı əgər, get ləbi-dilbərdən sor.
Gər sual eyləsə zahid ki, nədir nəşeyi-mey,
Degilən, gəl onu meyxaiədə sağərdən sor.
Ey soran halımı kim, böylə pərişan niyəsən?
Sorma məndən, onu ol zülfi-müənbərdən sor.

Seyyida, şöleyi-şəmi-rüxünə yandığımı,
Gecələr şəmdə pərvanəni g ör, pərdən sor.

Yüz gunə mənə xəlq gər əfsanə desinlər,
Bakim nə mənim, tək səni mərdanə desinlər.
Aç silsileyi-zülfi kəcin, boynuma bağla,
Qoy kim, məni zəncirdə divanə desinlər.
Çoxlar özünü atəşə yandırdı qəmindən
Kim, şəmi-rüxü-alına pərvanə desinlər.
Gəl təşneyi-didarına peykan oxun at kim,
Zalimsə də su verdi bu ətşanə desinlər.
Aç silsileyi-zülfi-kəcin, boynuma bağla,
Məscidləri qoy şəhrdə viranə desinlər.
Görsə bu səfa ilə səni Kəbədə hüccac,
Qorxum budu kim, Kəbəni bütxanə desinlər.
Bu küfrnüma şerüvi, Seyyid, görüb aləm,
Kafər deməsinlər səni, aya nə desinlər?

Ruyin şüaı kim meyə, ey dilrüba, düşər,
Meydən cahanə pərtövi-nuri-xuda düşər.
Sormağa qönçədən dəhənin sirri-mübhəmin,
Hər sübhdəm çəmənlərə badi-səba düşər.
Müşki-Xəta dedim o siyəh zülfü kakilə,
Əhli-nəzər eşitsə, bu sözdən xəta düşər.
Vəsfi-səfayi-sinəni, ey Kəbeyi-ümid,
Təhrir qılsa kilk, Səfadən səfa düşər.
Filcümlə ahi-aşiqə bənzər təranəsi.
Ol vəqt əndəlib ki, güldən cüda düşər.
Olmaz mənə sənin təki bir padşəh, vəli,
Seyyid təki sənin əlinə çox gəda düşər

Ol üzü xurşid kim aşiqlərin cananıdır,
Gün təki rövşəndi kim, bu xəstə cismin canıdır.
Zülməti-zülfində, pinhan,ləlinə meyl etdi dil^.
Ol dəhani-təng Xızrın çeşmeyi-heyvanıdır.
Sirrimi aləm bilir, ey dil, nə pinhan eyləyim,
Aşkarə dil alan ol xəndeyi-pinhanıdır.
Ey təbib, əl çək əlacımdan, mənə etmə əlac,
Xaki-kuyi-dust kur olmuş gözüm dərmanıdır.
Nami-məşuqi nə hacət zahir etmək, ey könül,
El bilir, aləm bilir gülrüxlərin sultanıdır.
Sinədə peykanuva qıldım cikər qanın qida,
Canə minnətdir ki, bu cananımın mehmanıdır.
Namə gəldi yardən, istər cəsəddən canımı,
Böylə sandım ki, həqin gökdən gələn fərmanıdır.
Olma yarın, Seyyida, cövrü cəfasından məlul,
Aşiqə cövrü cəfası dilbərin ehsanıdır.

Bülbülün hali-dilin novgüli-gülzar bilir,
Yansa pərvanə, qəmin şəmi-şəbi-tar bilir.
Aşiqi-kamil olan dərdini yarə nə desin,
O ki dərd əhlin edib dərdə giriftar, bilir.
Razıyam ki, yana pərvanə kimi balü pərim,
Gər məni yanmağa ol şəm səzavar bilir.
Nə şikayət eləyim dərdi-dilimdən yarə,
Bilmişəm ki, dili-zarımda nə kim var bilir.
Şakirəm yanmağa, yox cürət edəm şikvə, əgər
Ol dilaram mənim cənnətimi nar bilir.
Görürəm ol gözü badam, o ləli şəkkər,
Eyləsə xahiş, əlaci-dili-bimar bilir.
Xunfəsa fövcünə göstərmə kəlamın, Seyyid,
Genə gül qədrini bu dəhrdə əttar bilir.

Bu pir  könül tazə bir əhli-nəzər  istər,
Əvvəlki keçibdir, bunu ondan bətər istər.
Göz yaşımı dil culərə döndərdi qəmindən,
Məlum olur nəxli-muradə səmər istər.
Ləli-ləbini istəsə dil, həqqi var, ey gül,
Bimar gözüm qüvvət üçün gülşəkər istər.
Peykanlarını xahiş edər dil iki yandan,
Uçmağa səri-kuyüvə bir balü pər istər.
Başdan keçibən eşqdə cövlan gərək olsun,
Meydani-məhəbbətdi bu, ey dil, cigər istər.
Bimar gözün istəsə qoy qanımı içsin,
Qurbandır ona, canımı məndən əgər istər.
Bir kimsənə yoxdur ki, sənə olmaya pabənd,
Ey xaliqi-bimisl, səni hər bəşər istər.

Hanı o mahə həmağuş olduğum gecələr,
Şərabi-vəsl ilə mədhuş olduğum gecələr.
Siyah zülfü töküb üstümə yatan dəmlər,
Bəsani-Kəbə siyəhpuş olduğum gecələr.
Zaman-zaman oxuyub yar ilə duayi-qədəh,
O lalərüxlə qədəhnuş olduğum gecələr.
Düşəndə yadə, düşər şölələr dilü canə,
O nari-eşqlə pürcuş olduğum gecələr.
Bəsani-seyl yetib bəhri-vəhdəti-yarə,
Atıb sədaları, xamuş olduğum gecələr.
Çıxanda sövtü o şirin kəlamuvun, Seyyid,
O sövtə başdan ayaq guş olduğum gecələr.

Hanı o mah ilə mən işrət etdigim gecələr,
Tülui-sübhə kimi söhbət etdigim gecələr.

Gedəndə yar, durub naz ilə kənarından
Alıb ələ ətəgin, minnət etdigim gecələr.
Düşəndə xatirimə gögləre çıxar ahım,
O mahparə ilə xəlvət etdigim gecələr.
Ayaq yalın, baş açıq, zəmzəmi-sirişk tekūb,
Təvafi-kuyi üçün niyyət etdigim gecələr.
Gəlib nihani dəri-yarə, üz qoyub xakə,
Qübarın öpməgə ol cürət etdigim gecələr.
Düşərmi bir də ələ, ey xudayi-həyyü əhəd,
O sərvqamət ilə ülfət etdigim gecələr.
Deyəndə yar mənə dərd, mən deyərdim can,
Məzaqə təlx sözün şərbət etdigim gecələr.
Mükərrər eyləyib ol acı sözlərin, Seyyid,
Özüm-özümə dönüb ləzzət etdigim gecələr.

Hərçənd xubrudə bu adətdi,. naz olur,
Sən tək, vəleyk, naz qılan yar az olur.
Ol sərvi sərfəraz elədim əşkim ilə mən,
Əğyar, sayəsində vəli sərfəraz olur.
Adət budur ki, dəhrdə görməz visali-yar.
Hər aşiqi ki, pakinəzər, pakbaz olur,
Görməz həqiqi aşiq olan vəsli-yarını,
Bəzmi-visal qisməti-əhli-məcaz olur.
Könlü gərəkdi qönçə kimi qan ola müdam,
Kim c ki, dəhani-yarı sorub, əhli-raz olur.
Fəqrü fənayə talib olan dövlət istəməz,
Bu kimiyanı hasil edən biniyaz olur.
Qoymaz kəbutəri-dili-üşşaqdə qərar,
Hər yerdə kim, gözün kimi bir şahbaz olur.
Xurşid edər tülu, yetər şəb nihayətə,
Bağlar sitarə çeşmi-həsəd, sübh baz olur.
Seyyid, şikayət eyləmə hicrani-yardən,
Bir gün olur ki, lütfi-xuda çarəsaz olur.

Alan qərarımı ol kakili-mütərradır,
Başımda, bilməyirəm hiç, bu nə sevdadır?
Dedim: nədir rüxi-müshəfvəşində xətti-siyah,
Dedi ki, sureyi «Vəşşəms» üçün bu mənadır.
Caharmixi-təbiətdən əl çəkən arif,
Çıxar səmayə ki, həmxaneyi-Məsihadır.
Buraqi-himmət ilə qıl üruc ərşi-həqə,
O quş ki, çərxi-çaharüm məqami-İsadır.
Görən xudayi-əhəd nurini bu kəsrət ara.
Deməz ki, hiç bu məsciddir, ol kəlisadır.
Təcəlliyat özünün, göz onun, cəmal ezünün,
Cahanda gəh özü Yusifdi, gəh Züleyxadır.
Rümuzi-şerdən aləmdə yox mənim xəbərim,
Zəbani-Seyyidi-şirinsüxənlə guyadır.

Yadə saldıqda səni, dideyi-xunbar ağlar,
Yar hicrin çəkən, əlbəttə ki, naçar ağlar.
Bülbüli-bidil əlindən üzülüb daməni-gül,
Gecələr sübhə kimi nalə çəkib, zar ağlar.
Şad ikən vəslin ilə könlümə qəm çəkdi hücum,
Oldu min gunə genə dərdə giriftar, ağlar.
Tabi-təb, zülməti-şəb, möhnəti-qürbət, qəmi-yar;
Eyləməz tab bu möhnətlərə bimar ağlar.
Bəs ki, şəb ta bəsəhər ağlamaq adətdi mənə,
Həmdəm olmuş mənə yeksər dərü divar ağlar.
Mən ki, hicr atəşinə yandı vücudum, billah,
Mənim əhvalıma duzəxdə yanar nar, ağlar. ,
O qədər ağladı Seyyid qəmi-hicran ilə
Ki, onun halına bu çərxi-sitəmkar ağlar.

0 kəs. kim, nazəninim, Kəbeyi-kuyin təvaf eylər,
Səfadə səy edib ayineyi-idrakı saf eylər.
Bu gün üşşaq üçün sən gögdən enmiş rəhməti-həqsən,
Səni, ey məh, bəlayi-din deyən, billah xilaf eylər,

Yanar, tab eyləməz, bir şöleyi-şəm ilə pərvanə,
O bitaqətligiylə bunca nə lafü kəzaf eylər?
İnanma gər desə rəmmal sirri-qeybə agahəm,
Dəhanın, sirrinə yüz kərrə əczin etiraf eylər.
Edərsən ömrlərdir, Seyyida, muyi-miyan fikrin,
Bu fikri-nazik axırda səni bir muşikaf eylər.

Ey məh, sənə bu ahi-dəmadəm nə üçündür,
Ayineyi-dildə kədərü qəm nə üçündür?
Batdın genə bəxtim kimi bilməm nə qəraya,
Qurban sənə, bu şiveyi-matəm nə üçündür?
Təcridi-lətafətlə sən İsayi-zamansan,
İsayə, nigarım, qəmi-Məryəm nə üçündür?
Dünyayə gələn getmək üçündür, bu nə qəmdir,
Bir fikr elə bu xilqəti-aləm nə üçündür?
Seyyid, əgər ol şəmə sənin yanmadı könlün,
Bəs pərdeyi-çeşmində olan nəm nə üçündür?

Gəhi çeşmin, gəh əbru, gah qəmzən qəsdi-can eylər,
Salır bir fitnə, canım, qorxuram axırda qan eylər.
Gəhi çeşmin alır can, tiri-qəmzəndən tutar pinhan,
Gəhi qəmzən tökər qan, çeşmi-məstindən nihan eylər.
Edərlər xubrulər qəsdi-can könlüm fəğanından
Cərəsdən necə rəhzənlər ki, qəsdi-karvan eylər.
Könül şövqi-rüxündən həlqeyi-zülfündə sakindir
O bülbül tək ki, hərdəm şaxi-güldə aşiyan eylər.
Gər, ey sərvi-rəvanım, bağ ara nagəh xüram etsən,
Qoparıb bağban sərvin, salıb suyə rəvan eylər.
Əgər mən ol güli-rüxsarə həsrət can verəm, Seyyid,
Məzarımdan çıxıb gül, onda bülbüllər fəğan eylər.

Kim ki, Seyyid, ezünə bir gözəli yar bilir,
Nə qədər cövr eləsə canə səzavar bilir.
Nə qədər cövrü sitəmdən edə məşuqu günah,
Genə aşiq özün eşqində günəhkar bilir.
Belədir qaidə gülzari-cahan içrə ki, gül
Bülbülü tərk qılıb, həmdəmini xar bilir.
Kimini Turi-təcəlladə yaxar bərqi-cəmal,
Kimini izzət ilə qabili-didar bilir.
Özüvü dilbərə laqeyd gərək gestərəsən,
Zülm bünyad edib ol vəqt ki, naçar bilir.

Sanma qəm dəfini dildən meyi-gülgun eylər,
Olsa hər kimsədə qəm mey dəxi əfzun eylər-
Etmişəm təcrübə kim, eşq ilə bimar olanın
Nə əlacın xümü sağər, nə Fəlatun eylər.
İctinab eyləmə meydən, bu o cövhərdir kim,
Əşəsi hatəm edər, müflisi Qarun-eylər.
Ol ki, bir şişə şərabı ala dünyanı verib,
Etiqadım budur ol kəs genə məğbun eylər.
Seyyida, söhbəti-zöhhadə həvəs eyləmə kim,
Təbi əfsürdə qılar, xatiri məhzun eylər.

Hər əhli-hüsn kim, məni-bədbəxtə yar olur,
Bilməm nə rəmzdir ki, dönüb şivəkar olur.
Hər mahi-sim-saqə ki, mən müştəri olam,
Səngi-məhəkdə qəlb çıxıb, kəm-əyar olur.
Yüz dəfə lütf ilə eləsə vədeyi-visal,
Qismət mənə haman ələmi-intizar olur.
Bunca cəfaların görüb ol binəva könül,
Ol bivəfayə, gör, genə ümmidvar olur.
Seyyid, təhəmmül et şəbi-hicranə, çəkmə ah,
Bir gün olur ki, kamincə ruzigar olur.

Kimin ki, sən kimi bir yari-sərvqaməti var,
Qədin fədası olum, gündə yüz qiyaməti var.
O vəqtdən ki, salıb başımı bəlayə könül,
Qılır ki, şükr, onun haləti-səlaməti var.
Təvəhhüm etmə ki, tiğindən etiraz edirəm,
Tökərsə qanımı, ey şux, canə minnəti var.
Zamani-hicrdə gah ağlayıb, gəhi gülürəm,
Bu eşq aləminin özgə növ haləti var.
Dəvam qılmadı bir tişəyə səri-Fərhad,
Onun təriqi-bəladə mənə nə nisbəti var?
Zəbani-hal qılır halımı özü təqrir,
Dilim kəsilsə, bəyanə bunun nə hacəti var?
Həmişə kəsrəti-qəm kəsrət içrədir, Seyyid,
Xoş ol ki, aləm ara kəsrət içrə vəhdəti var.

Bisati-eyşimiz hicrində, ey gül, bəzmi-matəmdir,
Zibəs ki, girye eylər gözlərim, guya məhərrəmdir.
Nolur kim gəlsə ol mahi-münəvvər bəzmi-üşşaqə,
Deyirlər ki münəccimlər, bu ayın səlxi çox kəmdir.
Başım zanuyi-qəmdə, olmuşam yüz dərdə piçidə,
Məni aşuftə-əhval eyləyən ol zülfi-pürxəmdir.
Özün yet, ya Əli, imdadıma bir yarü yavər yox,
Mənə düşmən rəhi-eşqində bu məcmui-aləmdir.
Babam Adəm behişti çün verib bir daneyi-xalə,
Həbibim, aşiqin himmətdə Adəmdən mükərrəmdir.
Başında pənbə mina göstərir kəşfü kəramətlər,
Əcəb rindi-xərabati, əcəb şeyxi-müəmməmdir.
Səninləndir fərəh eşq əhlinə, ey Seyyidi-ali,
Təsəvvür etmə kim, sənsiz könüllər şadü xürrəmdir.

Könül, ol mahliqa söhbətimiz ar bilir
Ki, özün ülfəti-əğyarə səzavar bilir.
Rudi-Nil oldu gözüm yaşı bu möhnətdən kim,
Yusifim hüsnünə hər  zalı xəridar bilir.
Hanı ol bərqi-təcəlla ki, yox etsin varın,
Kim ki, Musa tək özün qabili-didar bilir,
Əhli-dildən o məhin qəsdi dil almaqdı, vəli
Dilrübalıq rəvişin aşiqə azar bilir.
Bilmişəm ki, bu qədər cövrü cəfa etməkdən
Ol pəriçöhrə bizi eşqə giriftar bilir.
Hicrdə çəkdigim ol kafər əlindən gecələr,
Seyyida, mən bilirəm, dideyi-bidar bilir.

Dəşti-Xətada, şöhrəti var, çox qəzal olur,
Əmma gözün tək ahuyi-müşkin məhal olur.
Gər görsə nəxli-qamətüvi sərvi-pa-begil,
Billah, düşüb ayaqlaruva paymal olur.
Bilməm  nə  rəmzdir .ki,  bu sirri-dəhanuvi
Hər yerdə aşikar eləsəm, qilü qal olur.
Ol mahi-bizəvalə deməm afitabdır
Kim, hər gün afitabə fələkdən zəval olur.
Söz yox ki, badə şərdə olmuş bizə həram,
Zənnim budur ki, yar ilə içsən, həlal olur.
Təhqiq olub bu kim, meyi-gülgunda hal var,
Gər əhli-hal ilə içəsən, özgə hal olur.
Sənsən bu əsrin, ey büti-ziba, Məhəmmədi
Kim, Seyyid astanənə kəmtər Bilal olur.

Səbadən kim, üzündə türreyi-ənbərfəşan titrər,
Olur könlüm pərişan, xatirim aşuftə, can titrər.
Olur qərqi-ərəq gül şərmdən rüxsarüvi görcək
Xuraman qamətin gördükdə sərvi-bustan titrər.
Səbadən tari-zülfün tək, o sahir gözlərin vəsfin
Rəqəm qıldıqca əldə xameyi-möcüzbəyan titrər.
Nəzərdən yar getcək aşiqə lakin budur adət
Ki, məşuqin görən dəm aşiqi-bixaniman titrər.
Qəmim şərhini yarə hər zaman kim istərəm yazmaq,

Müjəmdə əşki-xunin, əldə xamə, təndə can titrər.
Visalında keçən günlər düşər yadıma, Seyyid tək,
Tökər çeşmim sirişki-xunü cismi-natəvan titrər.

Gəldi fikrin könlümə, ya rəb, ola can bixəbər,
Can çıxaydı cismdən əhvalə canan bixəbər.
Yandırır balü pərin pərvanə şəmə hər gecə,
Suzişi-pinhandan ol şəmi-şəbistan bixəbər.
Vaqif olsaydım qoyarmıydım çıxa xət ruyüvə,
Tutdu bu gülzarı ol xari-müğilan bixəbər.
Qafil oldun, ey münəccim, açmadın təqvimdə,
Gərdi-xət qondu, tutuldu mahi-taban bixəbər.
Olma qafil haləti-üşşaqdən, ey murxət,
Hiç hali-murdən olmaz Süleyman bixəbər.
Göz önün barmaqlarımla tutmuşam şamü səhər,
Qorxuram nagəh ola aləmdə tufan bixəbər.
Kamran idim visali-yardə Seyyid kimi,
Saldı şövkətdən məni axırda hicran bixəbər.

Xəyali-zülfü ruyin ruzü şəb könlümdə müzmərdir,
Mənə novruzdur, hər gün şəbü ruzum bərabərdir.
Üzündür, ey həbibim, aləm içrə möcüzi-baqi,
Edən kəs müshəfi-rüxsarını inkar, kafərdir.
Qubarı çox götürsün ta öpən dəm asitanından,
Bu vəchilə üzüm göz yaşım ilə müttəsil tərdir.
Çirağı-şəb mənə bəsdir cigərdə şöleyi-dağın,
Bihəmdillah ki, zülmətxaneyi-könlüm münəvvərdir.
Sənubər  bar verməz, verdi qəddin  barələr qəddə
Bu gülzari-behiştin meyvəsi bari-sənubərdir.
Bəlayi-təlxi-hicri-yarı könlündə sənubər tut
Məzaqi-xatiri-Xosrov ləbi-Şirinlə şəkkərdir.
Bəlayi-hicri-dilbər tirətərdir, ey könül, əmma

Rəqibi vəsldə yar ilə görmək xeyli bədtərdir.
Rəqib ol mahə həmdəm, şəmdir pərvanəyə məhrəm,
Sənə suzi-nihandan, Seyyida, ölmək müqərrərdir.

Ey gül, üzün müayinə Firdovs bağıdır,
Şəhdi-ləbindi, yoxsa bu Kövsər bulağıdır?
Rövşən qılıb cahanı cəmalın tələlöi,
Qürsi-qəmərdi, yoxsa ki, bu gün çirağıdır?
Vaiz, dedin behiştdə vardır əyaği-mey,
Başınçın, ol əyağ bu saqi əyağıdır.
Rüxsari-alın üzrə o xali-siyəhmidir,
Yainki mayeyi-dili-məcruh dağıdır?
Düşmüş qaşın xəyalı dili-Seyyidə, vəli
Viranələr cahanda hərami yatağıdır.

Sinədən guşuma fəryadi-dili-zar gəlir,
Dərdi artıbdı, genə naleyi-bimar gəlir.
Bildi, görsəm rüxi-alın fərəhimdən ölərəm,
Şad-mərg etməgə ez aşiqini yar gəlir.
Qəmi-hicranə dedin, səbr elə sən, ey naseh,
Sənə asan isə bu iş, mənə düşvar gəlir.
hansı bir üzvüvi tərifə edərsəm iqdam,
Əvvələn ağzıma ol ləli-şəkərbar gəlir.
Əsəri-badəni gör kim, yıxılıb məst oluram, •
Nə zaman fikrimə ol gözləri xummar gəlir.
Dil gəlir busə üçün dövri-xətində dərinə,
Şərm edən sailə bənzər ki, şəbi-tar gəlir.
Ölməgim xoşdu rəqib ilə səni görməkdən,
Gəzmə qeyr ilə, mənim qeyrətimə ar gəlir.
Seyyida, tari-səri-zülfü gözümdən getdi,
Masiva, tarı bilir kim, gözümə tar gəlir.

Qəsdi-can eylər, o fəttan gözlərin bidaddır,
Bir kəbutər qəsdinə, guya iki səyyaddır.
Öldürür, gahi dirildir aşiqi qəmzən oxu,
Türfə sahirdir ki, həm canbəxş, həm cəlladdır.
Ləhzə-ləhzə seyli-əşkim aləmə tufan salır,
Ta qəmindən hər gözüm bir Dəcleyi-Bağdaddır.
Başın üçün, kəsmə məndən ey büti-bidadgər
Cövrü zülmün kim, fərəhbəxşi-dili-naşaddır.
Ey məhi-namehriban, etməm təmənna vəslüvi,
Bəs ki, könlüm möhnəti-hicranuva mötaddır.
4
Qıldı hicran qəsdi-can, cananə bilməz halımı,
Lütf qıl, ey nalə, bu dəm kim, dəmi-imdaddır.
Yardən ta Seyyidi-müztər kimi düşdüm cüda,
Həmdəmim əfğan, ənisim naləvü fəryaddır-

Afitabi-zərfəşan, ya badeyi-yaqutdur,
Ruhi-ruhullahi-əzəm, ruh üçün ya qutdur.
Ləbmidir, ey Xızri-xət, ya çeşmeyi-abi-həyat,
Xaldır dövri-rüxündə, ya xəti-yaqutdur.
İki zülfün sərnigun çahi-zənəxdanə düşüb,
Çahi-Babildə məgər harut.ilə Marutdur.
Olmayıbdır, ey qəmər, gündə küsufi-afitab,
hüsnüvü görmüş qaçıb rəngi, bu gün məbhutdur.
Badeyi-gülfam ilə aludə olmuş caməsi,
Ya damıb pirahəni-dildarə qarə tutdur.
Gözlərin təlimi-sehr eylər sənin mərdümlərə,
Ey gözüm nuru, bular Harut ilə Marutdur?!
Bülbüli-gülzari-qüds idin əzəldən, Seyyida,
heyf kim, indi məqamın aləmi-nasutdur.

Eşq əhli ki, xali-ləbi-cananı öpərlər,
Ol Kəbə ara vermək üçün canı, öpərlər.
Öpsəm üzüvü, ey üzü müshəf, nə günahım,
Bu sünnəti-məşhurdu, Quranı öpərlər.
Ətşan cigərim yaraləri, bərqüvi görcək
Bağrına basıb navəki-peykanı öpərlər.
Sağərləri sındırmağımın vəchi budur kim,
Ləbrizi-mey olsa, ləbi-cananı öpərlər.
Mən ağlayıram, yatmaya ta mərdümi-aləm,
Şayəd yuxuda ol ləbi-xəndanı öpərlər.
Ətfali-dəbistan güli-ruyin həvəsindən,
Hərdəm açıb övraqi-«Gülüstanı» öpərlər.
Qəmzən oxu kuyün daşına qanımı töksə,
Əfvaci-məlaik gəlib ol qanı öpərlər.
Seyyid, məni uyquyə verib fikrü xəyalım,
Ləli-ləbüvi hər gecə pinhanı öpərlər.

Biz ol aludeyi-dərdik ki, cami-mey dəvamızdır.
Əsiri-möhnətik, meyxanələr darüşşəfamızdır.
Olan vaqif özündən, eşqdə biganədir bizdən
Özündən kimsə kim, biganədir, ol aşinamızdır.
Bizi rüsva görüb zahirdə, bizdən etmə nifrət kim,
Gədayi-kuyi-eşqik biz ki, sultanlar gədamızdır.
Haçan səndən vəfa gördük, biz etdik bivəfalıq kim,
Səni bunca vəfasız eyləyən xud öz vəfamızdır.
Əgərçi surəti-hadislərik kim, olmarıq baqi,
Fənayi-mütləqik, lakin fənayi-ol bəqamızdır.
Rəhi-cananə təslim olmuşuq, əl çəkmişik candan.
Şəhidi-xəncəri-xunrizi olmaq müddəamızdır.
Nə gunə müşkül olsa kamə yetmək dəhrdən, Seyyid,
Təvəhhüm etmə kim, piri-müğan müşkülküşamızdır.

Çün gəlir rüxsarə xət, hüsnün lətafətdən düşər,
Ləkkədar olsa əgər əlmas qiymətdən düşər.
Laleyi-ruyin edər çün daği-pinhan aşikar,
Sünbüli-geysulərin tabü təravətdən düşər.
Lal olur aşiq, gedər çün hüsnü əldən dilbərin,
Rəsmdir, fəsli-xəzan bülbül fəsahətdən düşər.
Xət gələndə, xəlq ara məşuq olur bietibar,
Filhəqiqət, hakimi-məzul hörmətdən düşər.
Ol qədər cövr etmə üşşaqə ki, çəksin səndən əl,
Şəh rəiyyətsiz ola, əlbəttə, şövkətdən düşər.
Bu qədü rüxsar ilə seyri-gülüstan eyləsən,
Gül giribançak olur, sərv istiqamətdən düşər.
Seyyida, gəldikcə ol rüxsari-atəşgunə xət,
Günbəgündən sineyi-aşiq hərarətdən düşər.

Könül təpidələnir,yoxsa nazlı yar, gəlir
Uçur gözüm,məgər ol sərvi-gülüzar gəlir?
Səba gətirdi genə mucdeyi-gülüstanı,
Şükufələr açılır,fəsli-novbahar gəlir
Zibəs ki, müntəzirəm hər ayaq sədasından
Təsəvvür eyləyirəm bəlkə nazlı yar gəlir.
Əyağı al ələ,saqi,mənə peyapey ver,
Amandı,qoyma,mənim başıma xumar gəlir
Şərari-tiğ ilə yandır məni, əgər məndən, "
həbibim,ayineyi-könlüvə qübar gəlir.
Məgər ki,rəhgüzəri-yardə açıb zülfün,
Məşamə ləxləxeyi-nafeyi-tatar gəlir.
Zibəs ki;arizüvün həsrətin çəkər Seyyid,
Açılsa yüz güli-tər gözlərinə xar gəlir.

Dedim:ey gül, niyə etdin məni zülfündə əsir?
Dedi:divanə olan şəxsə gərəkdir zəncir,
Dedim:ol turreyi-pürçində nədir rüxsarın?
Dedi:bu surəti.Çin içrə qılıblar təsvir.

Dedim:ol arizi-zibadə nədir xətti-siyah?
Dedi kim, mushəfi-rüxsarıma düşmüş təfsir.
Bu ümid ilə ki, qanımı tökə qəmzən oxu,
Ey gözün sədqəsi,əmdən qılıram yüz təqsir.
Xameyi-Seyyid əgər kim, ola yüz muyşikaf,
Sifəti-muy-miyanın edə bilməz təhrir.

Dil ki şəmi-ruyinə bir dilbərin pərvanədir,
Yansa ol şəmin odundan,bilməzəm pərva nədir.
Eybi yox,bağlansa könlüm,ey pərivəş,zülfüvə,
Layiqi-zəncir olur hər kimsə kim,divanədir.
Məsti-mey gördükdə zahid,tən qılma çox mənə
Kim,əzəldən sərnevіştim guşeyi-meyxanədir.
Xali-olmaz bir zaman çeşmin xəyalından könül,
Şükr,olub mərdümnişin,hərçənd kim viranədir.
Çıxdı can vəslində təndən,rəsmdir çıxmaq, bəli,
Aşinalər söhbətindən kimsə kim biganədir.
Gəndümi xalın görüb allanma yarın,ey könül,
Bu,bəlayi-Adəmə bais olan bir danədir.
Ol pərirüxsar fikrin salma,Seyyid,könlüvə,
Afəti-candır sənə, fikr etmə kim,cananədir.

Dəhənin dilbərimin çeşmeyi-heyvan dedilər,
Kim inanır bu sözə, göz görə böhtan dedilər,
Zülfünə söylədilər müşki-Xəta, nafeyi-Çin,
həqqini bilmədilər,hərfi-pərişan dedilər.
Gördülər qan içici gözlərini əhli-nəzər,
Bu sitəmgərləri axırda tutar qan,dedilər.
Gətdilər duzəx odun aşiq üçün dünyayə,
0 cikərsuz odun adını hicran dedilər,
hicr dərdinə dəva sordum ətibbalərdən,
Dəhənin vəslinə, Seyyid, genə dərman dedilər.

Mahi-nov bəhsi, eşitdim ki,o əbru ilədir,
İncəlib,vəchi budur kim,qəmü qayğu ilədir.
Nə şirin dağ çapırsan bu qədər,ey Fərhad,
Tələbi-vəsl məgər qüvvəti-bazu ilədir?
Olmasa əşk,çıxardıb atar idim gözümü,
Sədəfin izzəti,ari,düri-incu ilədir.
Asitanın daşına başını qoymaz zahid
Ki, onun rahəti bir balişi-pərqu ilədir.
Gözümün yaşını mən eyləmə kuyindən kim,
Zinəti cənnəti-firdovsi-bərin cu ilədir.
Xəttini ruyinə geysusu gətirdi o məhin,
Dəxi bundan sora hər büğzüm o keysu ilədir.
Görəni muy miyanın o pərinin Seyyid
İncəlib mu kimi,əşarı dolu mu ilədir.

Dövri-rüxsarında mişkin sünbüli-pürtabdır,
Ya salıbdır sayə xurşid üzrə müşki-nabdır.
Arizin dövründə ya pərvanədir ənbərfəşan,
Ya şikari-can üçün eşq əhlinə qüllabdır.
Ol məhi-rüxsarə zülfün kim düşər,bir vəchi var,
Ari, əksər cilvəgahı əqrəbin məhtabdır.
Çeşmi-xabaludü məxmurun nə bilsin halını,
Gözlərim hicrinlə.kim,şəb ta səhər bixabdır.
Məscidü minbər nə lazım maili-rüxsarüvə,
Qaşların vəqti-ibadət aşiqə mehrabdır.
Seyyida,əhli-vəfa derlər ki, bu aləmdə var,
Adı var,lakin özü ənqa kimi nayabdır.

Ənbər saçılır, qafileyi-ud gəlibdir.
Guya ki,genə çəngü dəfü ud gəlibdir.
Xurşid genə tale olub bürci-həməldən,
Beytüş-şərəfə əxtəri-məsud gəlibdir.
Əyyami-bahar oldu,açıldı gülü lalə,
Dünyayə məgər cənnəti-mövud gəlibdir?

Bütxaneyi-Şirvanə genə bir büti-ziba,
Ya surəti-insanə o məbud gəlibdir
Ol qaşı hilalım yetişib həddi-kəmalə,
Bildirki ziyanın eləyib sud, gəlibdir.
Seyyid,gəlib ol gövhəri-nayab səfərdən,
Gövhər saçılır,lölöi-mənzud gəlibdir.

Şükr eylə,könül,söhbəti-canane yolun var,
Ey tutiyi-şeyda,şəkəristanə yolun var.
Məhrum degilsən hələ kuyindən o şuxun,
Ey bülbüli-şuridə,gülüstanə yolun var.
Ey səbzeyi-xət,sən ki ləbi-yarə yetişdin,
Bir Xızrsan,ol çeşmeyi-heyvanə yolun var.
Ey şanə,bu könlüm kimi sədçak neçinsən,
Ol silsileyi-zülfi-pərişanə yolun var?
Bu bisərü padən niyə bidadüvi kəsdin,
Ey şux, sənin kim, belə ehsanə yolun var?!
Bu ülfəti-zahirdən əgər mən olursan,
Qurbanın olum,ülfəti-pinhanə yolun var
Seyyid,dəxi bu tale əlindən nə şikayət,
Ey mur,sənin bəzmi-Süleymanə yolun var.

Ol iki zülfdə rüxsareyi-canan görünür,
Genə xurşid bu gün daxili-Mizan görünür.
Düşməyən eşqə nə bilsin ki, nədir müşkülümüz,
Ari,qəm çəkməyənə qəm yükü asan görünür,
Sənsiz,ey gül,gözümə mövsimi-hicranında
Gər gülüstanə baxam xari-müğilan görünür.
Dəhənin bir səri-mudur,buna söz yox,amma
Bir müəmmadı ki,yüz nükteyi-pinhan görünür.
Görünür zülfün arasında məhi-rüxsarın,
Şükr-lilləh ki,genə küfrdə iyman görünür.
Necə mən badə içim ləli-ləbindən ayrı,

Sənsiz,ey gül,meyi-gülgun gözümə qan görünür.
Dövri-rüxsarüvi tutmuş genə ol zülfi-siyah,
Əcəba, bir mələkə yar iki şeytan görünür.
Dəhənin sirrini sordum--dedi,yoxdan nə deyim
Seyyidin nöqtəcə yox əqli, nə nadan görünür.

Nə zəxmi-qəmzəsi,nə tiri-dilsitanımdır,
Salan bu rəngə məni çeşmi-xunfəşanımdır.
Nə gül-şüküftədi çeşmimdə əşki-alə səbəb,
Nəvayi-mürği-çəmən baisi-fəğanımdır.
Əlimdə badeyi-gülgun,yanımda yarım yox,
Bahar fəslidir,əmma mənim xəzanımdır.
Görüb üzarını zülfi-kəcində ol şuxün,
Dedim:bu gün qəmər Əqrəbdədir, qiranımdır.
Dedim: cahanda nədir bunca qilü-qalə səbəb,
Dedi:arayə düşən məbhəsi-miyanımdır.
Diyari-yarə bu gün etmişəm səfər əzmin,
Bu tazə şerlər əhbabə ərməğanımdır.
Mənəm o tairi-qüds-aşiyanə kim,Seyyid,
Behişti-Ədn mənim köhnə aşiyanımdır.

Xəlqin iymanını gər məkr ilə şeytan aparır,
O pəriçöhrə nədəndir ki,bəs iyman aparır?
Ey kəman qaşlı,məni yarələdi qəmzən oxu,
Zülfünü bas yarama, qoyma, məni qan aparır.
Dil çəkər canı səri-kuyinə zibh etmək üçün,
Sanki hüccac Mina dağına qurban aparır.
Eşqdir əldən alan din ilə iymanı, vəli,
Xəlqdən töhməti-bihudəni Sənan aparır.
Zahid ol zülfdə rüxsarını gördükdə dedi:
Bu o hindubeçədir məktəbə Quran aparır.
Kimsə kim, geyməyə meydani-məhəbbətdə kəfən,
Onu məşuqi-əzəl məhşərə üryan aparır.

Çəkməyin Seyyidi-laməzhəbi meyxanə sarı,
Kafəri Kəbə ara hansı müsəlman aparır?

Hər dəm ki, meydən ol büti-tənnaz məst olur,
Dərdi-təğafül ilə könüllər şikəst olur.
Gər mey bu isə, saqisi ol qarə gözlü yar,
Zahid satıb əmaməsini, meypərəst olur.
Aşiq degil əgər üzüvə gün, nədəndi bəs,
Hər gün düşüb ayağuvun altında pəst olur?
Bu qarə zülfü kakili-mişkin ki, səndə var,
Gər Cəbrəil görsə onu paybəst olur.
Seyyid kimi cahanda ayılmaz xumardən,
Hər kim ki, məsti-badeyi-cami-ələst olur.

Eşq əhli yarsız ki meyi-ərğəvan içər,
Zahirdə meydir içdigi, mənadə qan içər.
Gözdən rəvan olur çigərim qanı rəşkdən,
Qeyr ilə mey kim, ol büti-namehriban içər.
Kövsərdən əl götürrəm, əgər olsa hasilim
Ol dürdi-badə kim, onu piri-müğan içər.
Pirahəni-fələkdə şəfəq sanma, ey könül,
Üşşaq qanıdır ki, tökər, asiman içər.
Sanmın ki, tövbə eylədi Seyyid şərabdən,
Vaiz məzəmmətin görüb eldən nihan içər.

Ta ki dil nükteyi-mövhumdən inkardədir,
Bilməz ol rəmzi ki, müzmər dəhəni-yardədir.
Hər «ənəl-həq» söləyən aşiqə Mənsur demin,
Aşiq oldur ki, onun başı səri-dardədir.
O təcəlla ki, olub Turdə Musayə əyan,
İndi gəl gör ki, onu xaneyi-xümmardədir.

Şəmə pərvanə özün vurmağını sanma əbəs --
Kim, həyatı var onun şəmdəki nardədir.
Kəbənin örtügünü tikməyə xəyyati-qəza
İstəsə verməném ol riştə ki, zünnardədir.
Səbhə təklifini etmə mənə, ey Seyyidi-xam,
Sən xəyal etdigin iş zahidi-küffardədir.

Ol xanə kim, ol Kəbeyi-ərbabi-səfadır
Meyxanədi kim, məzhəri-əsrari-xudadır.
Qurban belə meyxanəyə kim, fərq olunmaz,
Gər sakini sultani-cahan, ya ki gədadır.
Oxşatma onu məscidə, zahid, səni tarı,
Onda nə əməl kim ola, bireybü riyadır.
Biz çakəri-ol piri-müğanik ki, şərəfdən,
Xaki-qədəmi dideyi-xurşidə ziyadır.
Ol xaceyi-lövlakü tərazəndeyi-əflak--
Kim, zati-şərifinə tüfeyl ərzü səmadır.
Hər badə ki, qiymət tapa feyzi-nəzərindən,
Caminə Cəmü badəsinə əql fədadır.
Xaki-dəri-meyxanəni çək çeşmüvə, Seyyid --
Kim, dideyi-qəmdidənə ol xak dəvadır.

Ol İsiyi-şeşmahə ki, xurşidliqadır,
Bir mühyiyi-əmvatü müinüz-züəfadır.
Ol mayeyi-iksir ki, xümdür ona məva,
Dərvişə qina, xəstəyə can, pirə əsadır.
Öz cövhəri-zatindədi bu nəşə şərabın,
Zati gərək əşyadə səfa, yoxsa həbadır.
Minayi-meyi aldım əba altına, zahid,
Gəl tökmə bunun qanını kim, Ali-Əbadır.
Tökmə meyi-nabı yerə, ey zahidi-gümrah,
Bu xuni-xuda, xuni-şəhi-Kərbübəladır.
Meydən qərəzin bilməsə, bak eyləmə, nadan,
Zövq əhli bilir kim, bu nə meydir, nə səfadır.
Seyyid, səni kafər desə zahid nə qəmin var,

Məhşərdə sənin dadrəsin şiri-xudadır.
Əl çəkmə meyi-nabdən, ey Seyyidi-müztər
Kim, dürdi onun daruyi-dərdi-şüəradır.

Hanı ol guşeyi-meyxanədə şad olduğum günlər,
Şərabi-nabə dildar ilə mötad olduğum günlər..
Mənə təlx oldu eyşim pirlikdən, hanı, ey tale,
Ləbi şirinlərin zövqilə Fərhad olduğum günlər.
Məni az qaldı səyyadi-əcəl seyd eyləsin, ey dil,
Hanı ol ahuyi-rənayə səyyad olduğum günlər.
Əsir oldum sənə, ey tifl, əmma həsrətim artar,
Düşəndə yadə ol məktəbdən azad olduğum günlər.
Məni Seyyid kimi yandırdın, ey bidadgər, əmma,
Yanar könlün məni-biçarəyə, yad olduğum günlər.

Ta qeydi-dil ol silsileyi-pürxəm olubdur,
Ol silsilə tək hali-dilim bərhəm olubdur,
Ol tifl ki, gəhvarədə olmuşdum əsiri,
Bir ruhi-rəvan, şuxi-Məsiha-dəm olubdur.
Ol qaşı hilalım yetişib həddi-kəmalə,
Rövşən edib aləmləri, bir aləm olubdur.
Nöqsanımı gördün sənə ixlasdə, bizdən
Lütfən nə səbəbdən belə, ey məh, kəm olubdur?Q
Məskən eləyib cənnəti-kuyini o hurün,
Seyyid də gəlib, gör dəxi, bir adəm olubdur.

Əbr niysan suyunu takə gər əfşan eylər,
Dürr olan qətrələrin ləli-Bədəxşan eylər.
Mən əsiri-qəmi-hicranı, o gül qeyr ilə yar,

Məni dərdiylə qoyub, özgəyə dərman eylər.
Məgər ol mahi-təmam ömrdə bir yarı gecə
Çıxıban busə verə, can ala, nöqsan eylər?
Xəlqdən ta bu firib ilə könül almaq üçün
Qeyr yanında mənə lütfi-firavan eylər.
Yoxsa sultani-qəmin məmləkəti-canə gəlir
Ki, könül dağ ilə sinəmdə çirağan eylər.
Mənə öz vəslini, zöhhadə verir baği-behişt,
Lütfi-həq hər kəsə dilxahını ehsan eylər.
Yarsız seyri-çəməndən nə bitər, ey Seyyid,
Bağban eşşəgi də gəşti-gülüstan eylər.

Saqi ki əldə badeyi-mərcan dolandırır,
Canlar fəda o canə ki, bir can dolandırır.
Ol zülfə vermə yüz ki, onun yüz xətası var,
Cənnətdən axır Adəmi şeytan dolandırır.
Canan dolandırır məni rüxsarı dövrünə,
Pərvanəni o şəmi-şəbistan dolandırır.
Zülmati-xətdə görsə ləbi-yarı, rəşkdən
Xasiyyətini çeşmeyi-heyvan dolandırır.
Gahi dəhanı könlüm edər aşikarə qan,
Gəh canı nöqteyi-ləbi pinhan dolandırır.
Bənzər cəmalı mərkəzi-xurşid dövrünə,
Səyyarələr tək, aşiqi hər yan dolandırır.
İstər o afitab ləbi-ləlin öpməgə,
Dilxun olubdu Seyyidi gör qan dolandırır.

Deməк hali-dili-zarı o gülrüxsarə müşküldür,
Məbadə inciyə qəlbi, bu dərdə çarə müşküldür.
Desəm yar öldürür, dərdim deməzsəm dərdi-pinhani,
Əlaci-çareyi-dərdi-dili-sədparə müşküldür.
Əgər bürqə üzarə salmasan, ey çeşmeyi-xurşid,
Şüai-arizindən hüsnüvə nəzzarə müşküldür.
Ümidi-Kəbeyi-didarın ilə olmuş avarə,

Yetişməzsə əgər dil dövləti-didarə, müşküldür.
Sirişkim meyli-kuyin eyləmiş, verməz rəqibim yol,
Məxuf olsa əgər yollar, güzər zəvvarə müşküldür.
Rəqiba, şöleyi-nari-fərağından hərasım yox,
Təsəvvür etmə kim, pərvanə yanmaq narə müşküldür.
Qəmi-dildarı pinhan saxla dildə candan, ey Seyyid
Ki, məhrəm eyləmək biganəni əsrarə müşküldür

Göstərir məscidi zahid ki, bu iyman yoludur,
Bunu da bil ki, könül, meykədə ürfan yoludur.
Kəbəyə əhli-həqin batini-dildəndi yolu,
Qeyri yol getsən əgər, quli-biyaban yoludur.
Qorxuram getməyəsən Kəbəyə, ey ərabi!
Getdigin rah müxalifdi, bu şeytan yoludur.
Tut könül, ali-Əli damənini, eyləmə qəm,
Get bu yoldan ki, bu yol Buzərü Səlman yoludur.
Demə meyxanə yolun rahi-zəlalət, vaiz!
Oğlun ölsün, bir ayıl, bu Şəhi-mərdan yoludur.
Kuyi-canana yetişməksə muradın, Seyyid,
Tərki-can eyləmək ol mənzilin asan yoludur.

Gərçi dil seydinə, ey gül, xət ilə xalın var,
Leyk ondan bu gözəldir ki, gözəl halın var.
Genə kimlər ürəgin qan edəcəksən, ey məh,
Bu rüxi-al ilə çıxmaqda bu gün alın var.
Çox baxırsan dəhəni-yarə, könül, yoxsa genə
Məbhəsi-nükteyi-mövhumdə əşkalın var.
Zahida, sən ki, bilirsən özüvü hal əhli,
Bir öz əhvalüvi bilməzsən, əcəb halın var.
Tut ki, ey mürği-dil, oldun bu qəfəsdən azad,
Uçmağa cənnəti-kuyinə məgər balın var?
Açıram müshəfi, yüz dəfə, «əlif-lam» gəlir,

Qamətü zülfdə, ey dil, nə gözəl falın var.
Seyyid, ol hurvəşin vəslin edərsən xahiş,
Olmağa cənnətə şayistə nə əmalın var?

Gözün qurbanı saqi, dur mənə ritli-giran doldur,
Səbükruh et məni, mey camın, ey ruhi-rəvan, doldur.
Saralmış zəfəran tək arizim bir gül fərağından,
Qızart rüxsarımı, camə şərabi-ərğəvan doldur.
Nə.müddətdir əyağım, başın üçün xalidir meydən,
Əlim tut, dadə yet, mey camın, ey arami-can, doldur.
Əyaği badədən xali görən dəm qan olur könlüm,
Gözüm, gər badeyi-gülfam yoxdur, camə qan doldur.
Visali-yar biəğyar, məclis xali, mey hazır,
Nədir ehmalə bais, saqiya, öldüm, aman, doldur!
Muradınca dönə dövri-fələk, ey saqiyi-məhru,
Hilali-sağəri xurşidi-meydən dur, dolan, doldur.
Əgər məşuqə mənzurundu, get bir şahibaz istə,
Bu məşhur bir məsəldir, Seyyida, «qaz vur, qazan doldur»

doldur»..

Qətlimə meyl əgər ol dilbəri-növşad eylər
Qəm əlindən qutarır, könlümü həm şad eylər.
Neçə illərdi qılıb silsileyi-zülfə əsir,
Nə məni öldürür ol sərv, nə azad eylər.
Gər o Şirin ləbi-ləlini şəkərbar etsə,
Gətirir şurə, cahan əhlini Fərhad eylər.
Mələkülmovt əgər qəmzənə şagird olsa,
Az zamanda onu can almağa ustad eylər.
Afərin navəki-xunrizüvə kim, sinəmdən
Çəkməgə cani-həzini, mənə imdad eylər.
Ta ki, zülmün eşidib etməyələr meyl sənə,
Sitəmindən, görə hər kimsəni dil, dad eylər.
Meyi-gülfamə dönən ol ləbi-ləlin həvəsi,
Səni mey şürbünə ey müğbeçə, mötad eylər.
Seyyida, yar eşidib naleyi-zarimi dedi:

Bu nə itdir ki, gəlib kuyimə fəryad eylər.

Xət gəldi ruyi-dilbərə, ey dil, hicabı var,
Zülfi-siyahı tək o gülün piçü tabı var.
Hərçənd hüsnə yazdı qəzəl kilki-süni-xət,
Amma rümuzi-nazə hələ yüz kitabı var.
Gəldi xəti əgərçi üzə xari-xüşk tək,
Gülbərgi-tərdi ləli, hələ abü tabı var.
Bu şərmdən ki, dil -- üzün ayinədir -- demiş,
Simab kimi lərzə edər, iztirabı var.
Yadi-ləbi-nigarım ilə vurduğuna laf
Oldu həram badə, dilin ictinabı var.
Rəncidə eyləyib gülü bülbül fəğan ilə,
Başın çəkib qanadına, güldən hicabı var.
Bülbül, keçirmə bağdə qəflətlə ömrüvü,
Gül açılıbdı, getmək üçün çox şitabı var.
Hərdəm ölür görəndə rəqib ilə yarını,
Öldürsə Seyyidi o şahə çox səvabı var.

Sanma ki, çeşmdən üzümə əşki-tər gəlir,
Bu çeşmə xüşk olub, dəxi xuni cigər gəlir.
Ey mövci-əşk axma, dəxi tutma yolların,
Bir rəhgüzar ver, o büti-simbər gəlir.
Gəh yad zülfün eyləyirəm, gah kakilin,
Bir fikri etməmiş, dilə fikri-digər gəlir.
Kəsmə ümid vəsldən əyyami-hicrdə,
Ey dil, bu şam kim gedər, axır səhər gəlir.
Gər mücdeyi-visalı gələ, yoxdu faidə,
Canım çıxar fərəhdən, əgər bir xəbər gəlir.
Dünyayə gəlməyir nə səbəb bir vəfalı yar,
Bais nədir ki, biri-birindən bətər gəlir?
Seyyid gedər, dedim, səri-kuyündən, ey pəri,
Güldü ki, könlü məndədir anın, gedər, gəlir.

Əhli-eşqin, zahida, cismindəki can özgədir,
Aləmi-mənadə, bil, can özgə, canan özgədir-
Aşiqin hərçənd xoşdur yarı olmaq bəzmdə,
Lakin, ey şeyda könül, yari-zəbandan özgədir.
Küfrü iymanı nə bilsin zülfüvə bənd olmayan,
Mülki-iyman özgədir, bu kafəristan özgədir.
Ey ləbi-dildardən qafil olan Xızri-fəqir,
Ləli-dildar. özgədir, ol abi-heyvan özgədir.
Ey könül köhli-Sifahan sanma xaki-payını,
Tutiya bir özgə şey, köhli-Sifahan özgədir.
Ney-şəkərdən, hind ara, tuti tapar zövqü səfa,
Bilməyir ləli-ləbində şəkkəristan özgədir.
Seyyida, xubani-Xülləxdən nədir övsaflər,
Mülki-Xülləx özgə, xaki-paki-Şirvan özgədir.

Ey gül, sənə hali-dili-şeydanı deməzlər,
Hali-dili-zari-məni-rüsvanı deməzlər.
Gördüm o siyəh türrəni rüxsaruva düşmüş,
Yandım oda, bu atəşi-suzanı deməzlər.
Xəttin bilirik müshəfi-hüsnündə, nə məna,
Ləfzi oxudurlar bizə, mənanı deməzlər.
Sirri-dəhəni-yarı, könül, axtar, özün tap,
Söz yox ki, açıb şəxsə müəmmanı deməzlər.
Ləlin qəmi öldürdü məni, kimsə inanmaz,
Can qatili aləmdə Məsihanı deməzlər.
Bimar məni etdi gözün, ikki dodağın
Dərdimi.bilirlər, mənə dərmanı deməzlər.
Qafildi gər ol şəm qəmindən, nə məzəmmət,
Seyyid, ona suzi-dili-şeydanı deməzlər.

Aşiq əgərçi yarı görüb könlü şad olur,
Amma ki, çərx cövrü ilə namurad olur.

Mane olullar aşiqə kim, mehri az ola,
Qafil ki, mən olsa məhəbbət ziyad olur.
Şiddət edincə mən olur suzi-dil füzun,
Dəryadə mövcə bais olan tünd bad-olur.
Zail olurmu pənd ilə aşiqdən eşqi-yar,
Damən çalanda şöleyi-nar izdiyad olur.
Bazari-hüsnə aşiqi-miskindi müştəri,
Aşiq ki yoxdu, hüsn mətaı kəsad olur.
Məşhur qıldı eşqi-Züleyxa o Yusifi,
Aşiqdə hüsn şöhrətinə ictihad olur.
Seyyid, rümuzi-eşqdə sən də çıxartdın ad,
Ta kim, zəmanə var, sənə eşq ilə ad olur.

Yüz sərvi-xuraman ola, könlüm səni istər,
Yüz baği-gülüstan ola, könlüm səni istər.
Yüz zöhrəcəbin, mahliqa, mehri-dilara,
Yüz min məhi-taban ola, könlüm səni istər.
Bu zülməti-zülfündə ləbin abi-bəqamız,
Yüz çeşmeyi-heyvan ola, könlüm səni istər.
Ey xublərin şahı, könüldür sənə talib,
Aləm hamı xuban ola, könlüm səni istər.
Ey dust, bizə huriyi-qılman nə gərəkdir,
Yüz huriyi-qılman ola, könlüm səni istər.
Seyyid degiləm bənd olam hər bir güli-alə,
Yüz qönçeyi-xəndan ola, könlüm səni istər.

Ləbini açsa o gül məhfilə şəkkər tökülür,
Ləfzi təkrar eləsə qəndi-mükərrər tökülür.
Nəkhəti-ənbəri-sara bürüyər afaqı,
Hər zaman kim, üzüvə zülfi-müənbər tökülür.
Surətin əksi əgər düşsə, sənin, ayinəyə,
Həşrədək ayinədən laleyi-əhmər tökülür.
Eyləsəm arizi-zibasına bir oğru nigah,
Qəmzəsindən o bütün üstümə xəncər tökülür.
Bu gecə içmisən, ey lalərüx, ol qədr şərab,

Məstü məxmur gözündən meyi-Xüllər tökülür.
Vermisən dil gecə sən hansı ləbi-mərcanə,
Seyyida, şeri-tərindən dürü gövhər tökülür.

Alan qərarımı ol zülfi-ənbərin-mudur,
Salan bəlayə məni xalü xətti-gülbudur.
Mücən, gözün, nigəhin, əbruvani-xunrizin,.
Cahanı qarət edən ləşkəri-hülakudur.
Dedim ki, kimdi tökən eşq əhlinin qanın
Göz üstə qaşını oynatdı kim, bu əbrudur.
Xəyali-baliş edib üstə başımı qoydum,
Süreyni sanki o gülçöhrənin pəri-qudur.
Sanır görən gözüvü zülfi-çin arasında
Kəməndi-pürxəmi-xaqan ara bir ahudur.
Yəqin ki, şaxi-gül üstündə aşiyanə tikib,
O qarə zülf cəmalında bir pərəstudur.
Əcəb yox əksi-qədi zahir olsa çeşmimdə
Məqami-sərvi-rəvan, Seyyida, ləbi-cudur.

Həmdəm şitadə gər mənə ol gülüzar olur,
Fəsli-şita dönüb mənə bir novbahar olur.
Ey göz, bu qədr ağlama, tökmə sirişki-xun,
Dildə nihani zəxmlərim aşikar olur.
Peykanların gəlibdi könüldə əyadətə,
Bimari-eşqə gör nə gözəl qəmküsar olur.
Ey zülfü qarə, tökdü qaşın qanımı mənim,
Olsa Əli əlində belə Zülfiqar olur.
Şəhmari-tari-zülfüvü üzdən kənarə çək,
Mehri-rüxün tutulsa, günüm tar-mar olur.
Qoyma piyadə dəşti-bəladə tutub əlim,
Bu ərsəgəhdə sən kimi az şəhsüvar olur.

Seyyid, rəqibi yar ilə gördükdə incimə,
Hər bir çəməndə, rəsmdi, gül olsa, xar olur.

Qönçənin bağrını əzzəldə fələk qan eylər,
Sonra könlünü açıb dəhrdə xəndan eylər.
Səltənət təxtinə bir payədi zindan, ey dil,
Yusifi izzət üçün sakini-zindan eylər.
Çəkməsə rənc kişi gəncə olurmu vasil,
Rəsmdir, rənc çəkən karını asan eylər.
Səbri-Əyyub gərək aşiqi-dilsuxtədə,
Aqibət lütfi-xuda dərdinə dərman eylər.
Olmasa kar pərişan, ona saman olmaz,
Hər pərişanlığa tanrı özü saman eylər.
Bir düşəydi əlimə vəsl, deyəydim bir-bir
Bu cəfalər ki, mənə möhnəti-hicran eylər.
Seyyida, qorxma ki, aləmdə xudavəndi-əhəd
Səni izzətlə dəri-dövlətə dərban eylər.

Dersən mənə kim, huriyi-qılman olacaqdır,
Qismət sənə ol Kövsəri-rizvan olacaqdır.
Bəsdir mənə bu saqi ilə badeyi-gülgun,
Mənzilgəhimiz səhni-gülüstan olacaqdır.
Dünyada gərək yari-pərivəş, meyi-biğəş,
Üqbayə baxan kimsə pəşiman olacaqdır.
Bu nəqdi qoyub nisyə dalına nə gedim mən,
Nəqdini verən nisyəyə nadan olacaqdır.
Saqi mənə qılmandı, şərabım meyi-Kövsər,
Vaiz çigəri həsrət ilə qan olacaqdır.
Fövt eyləmə bu fürsəti,ey aqilü huşyar,
Ömrün gedəcək, dəhr özü viran olacaqdır.
Seyyid degiləm nisyə sözə bavər edəm mən,
Nəqdi-hünərim camə girovgan olacaqdır.

Dünyadə eşq qədrini huşyar olan bilir,
Azadəlik səfasını bidar olan bilir.
Xurşid qədrini nə bilir huşi kurlər.
Bu feyzi-nuri sahibi-əbsar olan bilir.
Qədri-kəmali-hüsnü bilir aşiqi-həzin,
Əlbəttə, qədri-zərri xəridar olan bilir.
Qal əhli bilməsə dəhənin sirrin, eybi yox,
Sərbəstə sirri məhrəmi-əsrar olan bilir.
Aşiq çəkən qara günü əyyami-hicrdə,
Sevdayi-zulfün ilə günü tar olan bilir.
Çeşmindən özgə hali-dilim kimsə bilməyir,
Bimarlər bəlasını bimar olan bilir.
Mən çəkdigim bəlaləri, ey Seyyidi-həzin,
Dərdi-fəraqi-yarə giriftar olan bilir.

Çün xakə təcəlla elədi xaliqi-cəbbar,
Öz surətini xaki-siyəhdən edib izhar.
Çün oldu bəşər əhsəni-təqvimdə təxmir,
Bu xak təcəllayi-həqə oldu səzavar.
İstərdi mələk, adəmi kim, tapmıya xilqət,
Hüsni-bəşəri gör ki, mələk oldu giriftar.
Harut ilə Maruta edim mən nə məzəmmət,
Cibrili-əmin düşsə bu sevdayə, olur xar.
Nə çarə edim eşqimə bəs mən evi viran,
Yüz Zöhrəyə mən müştəriyəm, valehi-didar.
Yüz göz görürəm ki, hamısı sehrdi, cadu,
Bimar qılıbdır məni bir gözləri bimar.
Yox məndə hələ nəfsi-mələk qüvveyi-qüdsi,
Axır bəşərəm, rəhm qıl, ey xaliqi-qəffar.
Gər etməz idin arizi-dilbərdə təcəlla,
Seyyid bu qədər olmaz idi yarə tələbkar.

Dəllak pəsər kayineyi-əhli-nəzərdir.
Bir surəti-bimisldi, bir şəkli-digərdir.
Əbruləri bir tiğdi, müjganları nəştər,
Rəgdən açılan nəştərinə xuni-çigərdir.
Cam ilə hicab oldu onun tiğinə başım,
Başıma bəla oldu mənim də, bu nə sərdir.
Bir əldə tutub tiğini, bir əldə tutub səng,
Dəvayə gəlirsə ona canım nə sipərdir.
Əl vursa əgər çərxə, çıxar göglərə ahım,
Ey çərxi-cəfakar, sənə cayi-həzərdir.
Miqrazi-cəfa ilə əgər rişteyi-ömrüm
Qət eyləsə billəh deməzəm kim, nə xətərdir.
Şanə kimi_sədçak idi könlüm bu həsəddən
Kim, şanəkəşi-türreyi-hər şebədəgərdir.
Ey gül, nə rəvadır dura hər xarə müqabil
Ruyin ki, gülüstani-səfadə güli-tərdir.
Ey kaş, olaydım qayış ol muymiyanə,
Vəh-vəh, nə gözəl muymiyanü nə kəmərdir.
Tas öpdü əlin, bağrını su eylədi Seyyid,
Gözdən tökülən əşk degil, xuni-cigərdir.

Qadan alım, ay qara göz, sənə bu əda neçindir,
Nə üzüqaralıq etdim, mənə bu iza neçindir?
Sənə al don yaraşır, niyə geymisən qəra sən,
Məgər aşiqin ölübdür, sənə bu əza neçindir?
Yanağındı lalə nisbət, dodağın əqiq manənd,
Bədənin səfidi-safi, bəs adın qara neçindir?
Mənə ad Qara gərəkdir ki, mənim günümdü qarə,
Bu ad ay vəfalı dilbər, de görüm sana neçindir?
Sənə aşiq olsa hər kəs, olu qarəbəxt billah,
Yox isə bu ad səninçün sənəma, şəha, neçindir?
Dili zəxmdar Seyyid yetə gər o qarə zülfə,
Dəxi qarə lazım olmaz, ona bəs dəva neçindir?

Qəbr evinə o ki, bir şişə meyi-nab aparır,
Atəşi-düzəxi söndürməgə seylab aparır.
Abidin səhvini eyb etmə, qaşın şövqü ilə
O qədər fikr qılır, əqlini mehrab aparır.
Güzərim kuyüvə düşcək ayağım toprağını
Tutiya etmək üçün çeşminə, əshab aparır.
Şəbi-hicran mücələr tutmasa çeşmim önünü,
Giryədən sübhə kimi aləmi seylab aparır.
Şərhi-zülfün gecələr Seyyidi qoymuş bidar,
Gərçi əfsanə uzandıqca gözü xab aparır.

Hüsndə Yusifə düşməz edə canan ilə bəhs,
Ey əzizim, nə rəva qul edə sultan ilə bəhs.
Səcdə qıl yarə, könül, baxma o zahid sözünə,
Adəm ol, mətləbi qan, eyləmə şeytan ilə bəhs.
Dəhənin nöqtə bilib əhli-dəqayiq o məhin,
Bunda söz çox, nə edim bir neçə nadan ilə bəhs-
Payi-cananə fəda qılmaq üçün vəsl günü,
Sibqət etməkdə edər xəstə könül can ilə bəhs.
Sünbülün halı pərişan görünür, yoxsa edib
Ol üzü qarə bu geysuyi-pərişan ilə bəhs.
Hüccəti-qatei yox, qönçə, vəli, ağzın açıb,
Bilməm eylər dəhəni-yarə nə bürhan ilə bəhs.
Şeri-möcüz əsəri-Seyyid ilə bəhs qılan,
Elədir kim, eləyə ayeyi-quran ilə bəhs,

Görək meydən nə fitnə oldu hadis
Ki, zahid söylədi ümmülxəbais?!

Kəmali-cəhli gör kim, söyləmişlər:
Olur mey fitneyi-ürfanə bais.
Şəfaətdən olum üqbadə məhrum,
Əgər bunlarsa elmi-şərə varis.
Ərəqlə badədir ol iki cövhər
Ki, yoxdur onlara dünyadə salis.
Biçərsən məzrəi-üxradə, zahid,
Nə töxmə olmusan əvvəldə haris.
Fəsad əhli qoyub adın müfəssir,
İnad əhli özün söylər mühəddis.
Dəhən şövqilə, gər, yox etdi varın,
Olur hər nüktəyə Seyyid mübahis.

Könlümün zövqinə bir qönçədəhəndir bais,
Ləzzəti-ruhuma ol təlxsüxəndir bais.
Şövqi-kuyinlə işim ahü fəğandır, ey gül,
Bülbülün naləsinə yadi-çəməndir bais.
Simgun seyli-sirişkim ki, gözümdən saçılır,
Bir büti-ləli-ləbü simbədəndir bais.
Dil ki, zülfündə qara gün çəkibən səbr eylər,
Onda mu qədri olan hübbi-vətəndir bais.
Ney təki dil ki, nəvalər yetirir üşşaqə,
Bir hüseyni-nəsəbü vəchi-həsəndir bais.
Dil ki, nadidə olub aşiqi-didar sənə,
Ey ləbi ləli-Yəmən, Veysi-Qərəndir bais.
Ləbi-şirinini vəsf et o gulün kim, Seyyid,
Şuri-əşarüvə aləmdə bu fəndir bais.

981

Qızardı ləblərin, ey gül, şərabi-nabdır bais,
Cilayi-lələ, ari, mehri-aləmtabdır bais.
Qaşı tərhində görcək etmişəm mehrabə xəm qamət,

Nə kim, ey zahidi-kəcbin, mənə mehrabdır bais.
Dəmadəm saf edər qanımı təndə buseyi-ləlin,
Bəli, təltifi-xuni-cism üçün innabdır bais.
Könüldə cünbüş artar, ey düri-tər, ahü əşkimdən,
Neçün ki, cuşi-bəhrə bad ilə seylabdır bais.
Üzün üz verməsəydi üzdə zülfün cilvə etməzdi,
Bu rövşəndir ki, seyri-əqrəbə məhtabdır bais.
O kuyin itləri avazəsindən şad olur Seyyid,
Bəli, zövqi-dili-əhbab üçün əhbabdır bais.

Eylər şərab ləli-ləbinlə müdam bəhs,
Gün tək bu rövşən oldu ki, eylər həram bəhs.
Napüxtədir deyən tənüvə simi-xamdır,
Sərraflər yanında nə lazım bu xam bəhs.
Əhli-kəlamə sirri-kəlamın açılmadı,
Bir nüktə üstə etdilə malakəlam bəhs.
Hərdəm qılıb vücudi-ədəmdən hekayələr,
Rəmzi-dəhanın ilə edər xasü am bəhs.
Zülfü rüxün hekayəti yetməz nəhayətə,
Gər etsələr səfidü siyəh subhü şam bəhs.
Mən kuyi-yari, zahid, əgər Kəbədir dedim,
Fərz olmadı ki, sən edəsən biməqam bəhs.
Seyyid, o məhdən ötrü çox etmə mübahisə,
Naqis qalır zəmanədə, olmaz təmam bəhs.

Dil etsə nolar sineyi-sədçakə təşəbbüs,
Suyə batan eylər xəsü xaşakə təşəbbüs.
Təngə gəlib ahi-cigərim atəşi-dildən,
Dud ilə çıxıb eyləyir əflakə təşəbbüs.
Dil əksi-rüxün atəş ilə xakdə görmüş,
Gahi eləyir atəşə, gəh xakə təşəbbüs.

Şayəd ki, edə dərk səni qüvveyi-idrak,
Sultani-xəyalım edib idrakə təşəbbüs.
Çəng ur o kəsə, ricsdən etmiş onu həq pak,
Pakizə olan gövhər edər pakə təşəbbüs.
Fitraki-nigarımda mənim seyd olan ahu --
Bu bismili-dil eylər o fitrakə təşəbbüs.
Seyyid gözüvün bəs ki, görüb cövrü cəfasın,
Bundan eləyib qəmzeyi-bibakə təşəbbüs.

Ey könül, ləli-ləbi-cananə eylərsən həvəs,
Məxfi qalsın söz, nihani canə eylərsən həvəs.
Gəh sözün meyxanədir, gahi xəyalın saqidir,
Cənnət istərsən, yəqin qılmanə eylərsən həvəs.
Yox işin sirri-dəhani-yari sormaqdan siva,
Sən məgər hər nükteyi-pinhanə eylərsən həvəs.
Ey dili-məcruh, yox müşk ilə zəxmin sazişi,
Bəs neçin ol zülfi-müşkəfşanə eylərsən həpəs.
Gəh təmənna tiğin eylərsən, gəhi peykanını,
Yardən hər ləhzə bir ehsanə eylərsən həvəs,
Ey xəyali-yar, çıxmazsan könüldən, bilməzəm
Sən neçün bu mənzili-viranə eylərsən həvəs?
Seyyida, sal boynuva zünnari-zülfi-yarı sən,
Eşqdə gər rütbeyi-Sənanə eylərsən həvəs.

Oldu sənsiz çəmən, ey gül, məni-şeydayə qəfəs,
Nə çəmən, cümlə cahandır məni-rüsvayə qəfəs.
Aşiq azadə gərəkdir ki, dönər zindanə
Bərgi-güldən ola gər bülbüli-şeydayə qəfəs.
Ağladı bülbül əgər mən kimi hicran gecəsi,
Nə üçün dönmədi bir mövclü dəryayə qəfəs?
Əndəlibi-çəmənü güldə olan zati-şərif,

Nə əcəbdir dəgə gər cümleyi-dünyayə qəfəs.
Seyyida, aləmi-surət əgər olsaydı fəna,
Ləfzlər olmaz idi dəhrdə mənayə qəfəs.

Qəndü nəbati-Misrə edibdir məgər həvəs,
Ləli-ləbi-nigarə qonub bəxtəvər məkəs,
Ey şanə, sinəçak neçünsən, bəyan qıl,
Səndən sivayi kim olub ol zülfə dəstrəs,
Könlündə olmasaydı əgər məxfi üqdəsi,
Etməzdi bunca naləvü fəryadlər cərəs.
Səhni-çəməndə lalə degil, dilbərim gəlib
Əgnində səbz caməsi, başında al fəs.
Cənnətdə sənsiz olsa əgər hur həmdəmim
Guya qəfəsdə bülbül olub zağə həmnəfəs.
Ey əndəlib, növhələr etmək zamanıdır;
Taracə getdi bağdə gül, qaldı xarü xəs.
Seyyid görüb üzarımı xunin sirişk ilə,
Söylər ki, laləzarə dönüb sahili-Ərəs.

Tavusdə şərab idi, ya dideyi-xürus,
Xuni-kəbutər idi və ya atəşi-məcus.
Rəxşan sitarələrmidir övci-sipehrdə,
Ya mahrulər əldə tutub sağərü kəus.
Rüxsarın üzrə xətmi, əfəndim, zühur edib
Ya kim, diyari-Rumu tutubdur sipahi-Rus.
Ta şanəsində zülfünə olsun münasibət,
Nəşvü nümadə kəsbi-səvad etdi abnus.
Səndən rəvadır eyləsələr iddəa əgər
Cəmşid cam, ayinə fərzəndi-Filiqus.
Şad ol bu halə, çəkmə sən ayəndənin qəmin,
Əlbəttə kim, güzəştə üçün eyləmə füsus.
İçdim ki, ərğəvani ola meydən arizim,
Seyyid, fərağdən üzümü qıldı səndərus.

Niqabın üzdən aç, ey gül kim, olsun dilguşa məclis,
Məqami-nitqə gəl, ey Kəbə kim, tapsın səfa məclis.
Səhabi-zülf ara etmə nihan xurşidi-rüxsarın,
Qoy olsun, ey hilaləbru, üzündən pürziya məclis.
Nə dil qaldı, nə dildə taqətim, dün şəb eşitdim kim,
Edibdir ta səhər əğyar ilə ol dilrüba məclis.
O məclis kim, ziyası olmaya şəmi-cəmalından,
Nə məclis, eyni zülmət, əhli-eşqə bir bəla məclis.
Hər ol məclis ki, olsun onda rəngin badəvü sadə,
Odur cənnət gər Adəmsən, əfəllah, mərhəba məclis!
Ol ahu gözlü dildarın pərişan eyləyin zülfün
Ki, olsun müşki-tərdən səfheyi-dəşti-Xəta, məclis.
Tökübsən kövkəbi-əşk ilə, Seyyid, hər gecə nalə,
Nə nöqsanı, qoy etsin qeyr ilə ol məhliqa məclis.

Axır öldürdü məni bu qəmi-hicran, əfsus!
Bilmədi halımı bir ol şəhi-xuban, əfsus!
Vermişəm sən təki bimehrə könül, qafil olub,
Olmuşam indi yaman yerdə peşiman, əfsus!
Dil ki, sərmənzili-sultani-xəyalındır, onu
Seyli-qəm hicr günü eylədi viran əfsus!
Qoymadı canımı canənə verim vəsl günü,
Aldı yüz dərd ilə məndən onu hicran, əfsus!
Qasidi-yarə fəda canımı qıldım, xəciləm
Ki, yoxumdur bu təni-zardə yüz can, əfsus!
Yar bimehrü sitəmkar, könül maili-yar,
Seyyida, qalmışam öz halıma heyran, əfsus!

Ah, səd ah ki, dildardən oldum məyus.
Soldu gül, gülşənü gülzardən oldum məyus.
«Ləntərani»- dedilər Turdə Musayə genə,
Ah kim, dövləti-didardən oldum məyus.
Ey təbibim, dili-bimarə əlac etmə dəxi,
Mövtə müşrifdi, bu bimardən oldum məyus.
Rəf qıl dərdimi, tut bir neçə cam ilə əlim,
Saqiya, ol gözü xummardən oldum məyus.
Bəli, dərd əhlinin əhvalını dərd əhli bilər,
Kimsə bilməz ki, necə yardən oldum məyus.
Öpdülər ləli-ləbindən o gülün, amma mən
Buseyi-ləli-ləbi-yardən oldum məyus.
Seyyida, indi nə kafər, nə müsəlmanəm mən,
Getdi dinim, dəxi zünnardən oldum məyus.

Çağırdı yarımı əğyar, qaldı ülfətim naqis,
Driğa, qaldı ol mahi-tamamə söhbətim naqis.
Fələk qoymaz ki, ol mahə verim canımı bir gün,
Xudavənda, bilirsən kim, degildir hümmətim naqis,
Ərit bu qalibi-fərsudəmi, qıl tazədən iycad,
Qəbuli-feyzüvə hərgəh düşübdür xilqətim naqis.
Göründü bir üzü, məstur qıldı bir üzün zülfü,
Bu şəb ol mahrudən düşdü, ey dil, qismətim naqis.
Mənə biqədrlik aləmdə qəhti-müştəridəndir,
Əgər sərrafım olsa, olmaz idi qiymətim naqis,
Cəmali-batinim kamildi, yox bir zərrə nöqsanı,
Nə qəm, ey mahi-bimehrim, gər olsa surətim naqis.
Nə hikmətdir ki, bilməm kəsdigincə ülfətin məndən,
Mənim ol mahə, Seyyid, hiç olmaz rəğbətim naqis.

Dil olmasın o zülfi-girəhgirdən xilas,
Divanə xoş degil ola zəncirdən xilas.
Çeşmin, qəzalı seyd edər asan təriq ilə,
Bir seydi-pürhünər kim, ola şirdən xilas.
Bənzər xədəngi-Rüstəmi-dəstanə kiprigin,
Müşkül ki, Əşkəbus ola bu tirdən xilas.
Zülfündən ötdü dil, qaşına oldu mübtəla,
Ol rusiyah olurmu bu şəmşirdən xilas.
Geçdim ridavü səbhəvü əmmamədən bu gün,
Oldum əsasi-hiyləvü təzvirdən xilas.
Bir kəlmədir miyani-fələkdə vücudumuz,
Olmaz bu gün bəlayi-zəbər-zirdən xilas.
Seyyiddə küfr zərrəcə yoxdur, əcəb degil
Hər yerdə oldu, olmadı təkfirdən xilas.

Dürri-mənayə olub bəhri-süxəndə qəvvas,
Tapdım ol gövhəri vəsf etməgə bir məniyi-xas.
Olacaq axırı şəmşiri-dü əbruyə düçar,
Dil kəməndi-səri-zülfündən əgər olsa xilas.
Əqrəbi-zülfi-kəcin rəğminə saət-saət,
Dövri-rüxsarüvü dil seyr qılır çün rəqqas.
Canı cananına bəzl etməyən aşiq, məsələn,
Bənzər ol zahidə kim, olmaya sahib-ixlas.
Müxtəlif feyz rüxü çeşmü ləbindən gördüm,
Var hər sureyi-qurandə bir növ, xəvas.
Nə xətərnak idi sərmənzili-eşqin ki, sənin,
Nə əvam oldu o sərmənzilə vasil, nə xəvas.
Seyyid, avarəligi tərk elə kim, saliki-eşq,
Ya gərək kafəri-mütləq ola, ya mömini-xas.

Səni əhli-vəfa bilmişdim, ey gül, bivəfasənmiş.
Bağışla, bilmədim biganələrlə aşinasənmiş.

Səni ayineyi-məqsud sandım rubəru durdum,
Göründü əksi-surət, annadım kim, kəcnümasənmiş.
Səni Yusif bilib, verdim könül mülkündə sultanlıq,
Əzizim, nuri-eynim, sən gəda oğlu gədasənmiş.
Səni üşşaq üçün söylərdim əvvəl rəhməti-həqsən,
Vəli, ey mahru, sən kökdən enmiş bir bəlasənmiş.
Kimin zülfünə bənd oldunsa, Seyyid, bivəfa çıxdı,
Şikayət etmə bir kəsdən, özün bəxti qərasənmiş.

Fəqrü fənanı bilməz idim kimiya imiş,
Səngi-sitəm şikəstə dilə mumiya imiş.
Mülki-fənavü fəqrdə sultan imiş fəqir,
Övci-səriri-izzdə sultan gəda imiş.
Mən zəhr bildigim məni-misginə nuş imiş,
Biganə sandığım mənə xüd aşina imiş.
Ta sayə saldı başıma, yetdim səadətə,
Mən cüğdə nisbət eylədigim quş, hüma imiş.
Çin söz budur ki, nafeyi-Çindən ziyadədir,
Müşki-Xəta o zülfə demək bir xəta imiş.
Könlüm olurdu rəşklə sədçak şanədən,
Kəc getmişəm ki, zülfüvə məhrəm səba imiş.
Seyyid düşəndə möhnətə «Nadi-Əli» oxur,
Müşkülgüşa cahanda şəhi-Lafəta imiş.

Eşitdim ol qəra göz dilbərim sağərpərəst olmuş,
Mey içmiş məclisi-əğyardə bihuşü məst olmuş.
O, səngindil əlində, söylənir kim, şişə görmüşlər,
Bu mənadən pozulmuş xatirim, könlüm şikəst olmuş,
Nə əfsun eyləmiş, bilməm, rəqib ol sərvi-rənayə
Ki, düşmüş dami-təzvirində möhkəm paybəst olmuş.
Nigara, öldürür bu dərd, billah, aşiqi-zarı

Ki, söylər mərdümi-aləm: filani meypərəst olmuş.
Şərab almağə səndən ötrü təndə nəqdi-canım var,
Güman etmə ki, bu biçarə Seyyid təngdəst olmuş.

Məni canandan edən dur, bu canü tən imiş,
Tərkin etdim, mənə bu hər ikisi düşmən imiş.
Xublər kim, bu qədər könlümə bidad eylər,
Bir usanmaz çəkə əl, dil degimiş[1], ahən imiş.
Bu üzü qarə könüldür məni rüsva eləyən,
O ki, mən dust deyib tutmuş idim, düşmən imiş.
Gəşti-gülşən dedilər rəfi-qəmi-hicr qılır,
Yarsız seyr qılıb gördüm onu gülxən imiş.
Mənə rüsvalığımı eyb qılır zahidi-xüşk, y
Eşqdən yox onun axır xəbəri, kövdən imiş.
Seyyid, aşiq olanı bilmişəm aşiqlər işin,
Ah imiş, nalə imiş, giryə imiş, şivən imiş.

[İstinad1: Deyilmiş]

Neçə məhru gözəl Şirvanda könlümdən qərar almış,
Tənimdən tab, gözdən xab, əldən ixtiyar almış.
Edibdir hər birinin qəmzeyi-xunxarı seydi-dil,
Sanırsan şahbazi-ahəninmixləb şikar almış.
Birisi almağa canım götürmüş xəncəri-bürran,
Birisi tökməgə qanimi tiği-abdar almış.
Biri zahir nigah ilə alıbdır canımı pinhan,
Birinin qəmzeyi-pinhanı könlüm aşikar almış.
Nə din qoymuş, nə iyman məndə, na ayinü nə məzhəb,
Bu kafərbeççə dilbərlər əlimdən hər nə var almış.
Xüsusən ol nigari-sərvqamət, yari-məhsima
Ki, tabi-türrəsindən rəngü bu müşki-tatar almış.
Görənlər səfheyi-ruyində, Seyyid, xəttin ol şuxün
Sanır kim, kişvəri-Rumu sipahi-Zəngbar almış.

Sarı gül tək libas əgninə ol sərvi-rəvan geymiş,
Bahari-gülşəni-eyşim əcəb rəngi-xəzan geymiş.
Alıb cismi-lətifi əks ruyi-zərdi-aşiqdən,
Və ya kim, əsfəri don ol nigari-dilsitan geymiş.
Pəri görmüş kimi rəngim pəridə, əqlim azmışdır,
Bu gün kim, ol pəri-şənim libasi-pərniyan geymiş.
Saralmış arizi-xurşidi-nurəfşan təhəyyürdən
Ki, nə üzdən bu gün sari o mahi-mehriban geymiş?
Yəraqani kimi rəngim saralmış, qan verir yarəm
Ki, şaxi-ərğəvanım nişə bərgi-zəfəran geymiş.
Nişani-eşqdir, rüxsari-zərdi-əhli-sevda tək,
Bu sarı camәni kim, Seyyid, ol arami-can geymiş.

Zülfüvə zülməti-dövran dedilər, gerçək imiş,
Ləbüvə çeşmeyi-heyvan dedilər, gerçək imiş.
O dəhən fikri ilə cümlə yox oldu varım,
Dəhənin nöqteyi-pinhan dedilər, gerçək imiş.
Hər gələn adəm edər canü könüldən təsdiq,
Kuyüvi rövzeyi-rizvan dedilər, gerçək imiş.
Alışıb, şölə çəkib suz ilə yandım, gördüm,
Hicrüvi atəşi-niyran dedilər, gerçək imiş.
Qaşların nuni-qələm, qəddin əlif, zülfün lam,
Üzüvi sureyi-quran dedilər, gerçək imiş.
Yerü göy, ərşü mələk nurüvə eylər səcdə,
Səni kim, aləmə sultan dedilər, gerçək imiş.
Sənəma, səndə təcəlla eləyib həzrəti-həq,
Surətin surəti-rəhman dedilər, gerçək imiş.
Hüsnüvə aşiq olan oldu mələkdən əla,
Münkiri-fəzlüvə şeytan dedilər, gerçək imiş.
Seyyidin zahir olub şeri-şəkərbarından
Ləbi-ləlin şəkəristan dedilər, gerçək imiş.

Çəməndə nərgisi-şəhla gözün yadilə məst olmuş,
Olub bimari-hicranın onunçun paybəst olmuş.
Kəməndi-zülfi-müşkinə düşən afətdən eyməndir,
Bu zənciri-cünun ərbabi-halə tazə bəst olmuş.
O səngindil əlində gördüm, ey dil, şişeyi-badə,
Dürüstün söyləyim kim, xatirim ondan şikəst olmuş.
Ləbindən sordum ol püstədəhanın sirri-pinhanın,
Dedi: bilməz ədəm sirrin olar kim, meypərəst olmuş.
Ləbin istərdi töksün qanımı yüz rəngi-al ilə,
Çəkib şəbxunə xəttin, ey sitəmgər, pişdəst olmuş.
Gəlib göftarə, ey gülrux, nişan göstər dəhanından,
Bu rəmzi fəlsəfi görsün, desin: mədum həst olmuş.
Hümayi, eyb qılma Seyyidi məxmur gördükdə,
Ayılmaz, çünki məsti-badeyi-ruzi-ələst olmuş.

Alışdım odlara, aldım dili-divanədən atəş,.
Düşübdür aləmi-imkanə bu kaşanədən atəş.
Dedim: xəttin dişərdi, könlümü ver, ey məhi-taban,.
Dedi: axşam vermək xoş degildir xanədən atəş.
Əgər dil yanmasaydı yaxmaz idi qəlbi-cananı,
Əcəb halətdi kim, şəmə düşüb pərvanədən atəş.
O xali-filfilin, ey gülbədən, yandırdı üşşaqı,.
Düşübdür xirməni-əhli-dilə bir danədən atəş.
Şitadır, saqiya, məclis ara qəlbi-şita xoşdur,
Büsatı kərm qıl, göstər bizə peymanədən atəş.
Gəhi hicrin, gəhi vəslin vurar od qəlbi-suzanə --
Ki, heç əskik degil bu guşeyi-viranədən atəş.
Müradın xatiri-cananı yandırmaqsa fəryad et --
Ki, Seyyid, xali olmaz süfreyi-məstanədən atəş.

Kəsmək olmaz arizuyi-ləli-canandan təmə,

Hansı bir kəsdir ki, aləmdə kəsə candan təmə.
Xakə dönsəm kəsmərəm ümmid ləli-yardən,
Sanma İskəndər kəsibdir abi-heyvandan təmə.
Ey ki, sərvin buseyi-ləlin təmənna eyləyən,
Meyvə bir kəs etməyib sərvi-xuramandan təmə.
Zəxmimə mərhəm xədəngin istəsəm eybim degil,
Eyləyibdir hər gəda ehsanı sultandan təmə.
Əqlimin, gör eşqi-yar ilə, pərişan olduğun,
Eylərəm cəmiyyət ol zülfi-pərişandan təmə.
Ta könül zənciri-zülfi-yarə  oldu mübtəla,
Döndü bir Məcnunə, kəsdim aqibət ondan təmə.
Xaki-kuyi-dilbəri eylə nişimən, Seyyida,
Tərki-cənnət eylə, kəs seyri-gülüstandan təmə.

Ətri, səri-zülfündən edər şanə təvəqqö,
Dnvanədən eylər genə divanə təvəqqö.
Yandırsa pərü balını şəmin nə günahı,
Öz yanmağını eylədi pərvanə təvəqqö.
Sən xirməni-hüsnün dolanıb başına hərdəm,
Eybim nədi, quş tək eləsəm danə təvəqqö.
Tərlanımı bir zaği-siyəh seyd qılıbdır,
həqqim var, əgər etsəm Əmircanə təvəqqö.

Görcək cəmali-yarımı gəldi zəbanə şəm,
Suzi-dilin bəyanına çəkdi zəbanə şəm.
Aşiq olubdu mən təki bir atəşin rüxə,
Gözdən tökər sirişki-tərin yanə-yanə şəm.
Yandırdı cismü canını, gördü fəğanı yox,
Pərvanəni çəkirdi məgər imtəhanə şəm?
Zəxmi-dilində hər gecə işlər fətiləsi,
Peykani-çeşmi-yarə olandan nişanə şəm.
Hər gecə mum tək əridim, yandım odlara,
Ta durdu qarşı mahi-rüxi-dilsitanə şəm.

Qilmanü hur xülddə görməz ziya üzün,
Ruyi-münirin olmasa b.aği-cinanə şəm.
Gəh yandı, gəh yıxıldı, çıxıb dud başın
Suzi-dilini etdi əyan aşiqanə şəm.
Ey bəxtimin sitarəsi, bu sübh açılmasın,
Mahi-rüxün yetər bu gecə karivanə, şəm.
Mən zülmət içrə, yarım olub şəmi-bəzmi-qeyr,
Seyyid, ziya yetirməz imiş şəmdanə şəm.

Etdim axır nəfəsimdə ləbi-cananə təmə,
Ölürəm, eybi nədir gər eləsəm canə təmə.
Gəh könül nazını istər o şəhin, gəh sitəmin,
Bu təməkar qılır gündə bir ehsanə təmə.
Fəqr mülkündə olan dövləti bilsəydi əgər
Hiç kəs etməz idi rütbeyi-sultanə təmə.
Qaralıb rəngi-rüxü, sinəsi sədçak oldu,
Etdi çün şanə səri-zülfi-pərişanə təmə.
Yetmək istər ləbüvə, gizlənib ol zülfdə dil --
Xızr zülmətdə edib çeşmeyi-heyvanə təmə.
Sipəhi-xətti-siyəh tutdu rüxi-cananı,
Etdi, bu kafəri gör, mülki-Süleymanə təmə.
Yanacaq balü pəri suz ilə pərvanə kimi,
Seyyid etdi genə ol şəmi-şəbistanə təmə.

Dil olmadı o sirri-ləbi-yarə müttəle.
Nüktəşinaslər olur əsrarə müttəle.
Hər bir dəqiqə hikmətini fəhm edən həkim,
Hikmət budur ola dəhəni-yarə müttəle.
Bilməz xətin ol ayeyi-rüxsar şərhini,
Zülmat olurmu məniyi-ənvarə müttəle?!
Musayi-qəlbə qıldı təcəlla cəmali-yar,

Oldum rümuzi-dövləti-didarə müttəle.
Seyyid, yetər bu nalə ki, sübh eylədi tülu,
Yar olmadı fəğani-şəbi-tarə müttəle.

Ta kirib meyxanə içrə başıma çəkdim əyağ,
Söhbəti-əhli-riyadən qət edib, kəsdim əyağ.
Düxtəri-rəzdən niqab açdı çü piri-meyfüruş,
Başə düşdüm nəqsimi, dərhal ələ aldım əyağ.
Gördü, ey qönçədəhən, ta kim, güli-rüxsarüvi,
Bülbüli-şeydayə guya bir qəfəsdir səhni-bağ.
Arizindən almağa bir buy badi-sübhdəm
Bağdən-bağə sərasimə gəzər, eylər sorağ.
Güllər açıldı, dəmağı çağ oldu dilbərin,
Saqiya, ver badeyi-gülgun ki, çağ olsun dəmar.
Badeyi-gülfam ilə seyri-gülüstan çağıdır,
Fürsəti fevt etmə, ey qafil, qənimətdir bu çağ.
Bildim Adəm çəkdigincənnət qəmindən, Seyyida,
Novbahar əyyamı ta ol kuydən düşdüm irağ.

Ayrıldı məndən ol güli-bixar, ey diriğ!
Qıldı məni cəfayi-fələk xar, ey diriğ!
Düşdü fəraq aramıza ol mumiyan ilə,
İncəldi mu təki təni-bimar, ey diriğ!
Qaldım zəmanədə belə biyarü qəmküsar,
Əğyarə oldu yar, gedib yar, ey diriğ!
Xərmöhrə qədri olmadı aləmdə qiyməti
Dürlər ki, tökdü dideyi-xunbar, ey diriğ!
Göz yaşım ilə nəşvü nüma verdigim gülün,
Çəkdi gülabın aqibət, əttar, ey diriğ!
Çeşmimdə pərdə içrə nihan idi çün gülab,
Gül kimi oldu şahidi-bazar, ey diriğ!
Çeşmi-xumarı oldu nəzərdəi nihan, mənə
Dərbəstə oldu xaneyi-xummar, ey diriğ!
Erabilər kimi xəti tutdu üzarını,
Getməz dəxi o Kəbəyə zəvvar, ey diriğ!

Ağzı qəmində oldu vücudum ədəm mənim,
Bu yoxdan ötrü getdi nə kim var, ey diriğ!
Seyyid, üzari-dilbərə gəldi o qarə xət,
Oldu hicab şəmsə şəbi-tar, ey diriğ!

Etdigim nalələr olmazdı bu sevdadə tələf,
Sinəm olsaydı gər ol navəki-müjganə hədəf.
Bu ümid ilə ki, qəmzəndən ala kami-dilin,
Düzülüb gözlərivün dövrünə müjgan səf-səf.
Yazdı «Vəlleyli iza» səfheyi-rüxsarüvə xət,
O bəyazə bu səvad ilə füzun oldu şərəf.
Almamış abi-dü çeşm ilə vüzu aşiqi-zar,
Baxa bilməz üzüvə, ey üzü rəşki-müshəf!
Dürri-əşkimə nola yar xəridar olsa
Ki, bu dürdanəyə bəhreyni-dü çeşmimdi sədəf.
Rədə lazımdı Rübab, etmə müğənni, dəfə zur
Ki, könüldən qəmimi dəf eləməz nəğmeyi-dəf.
Çəkdilər Yusifi-mənanı genə bazarə,
Seyyida, saxlama canı, nə gərəkdir bu xəzəf.

Eşqdə Məcnun kimi aləmdə çoxlar vurdu laf,
Leyk Leyladən götürdu dəst, görcək etisaf.
Eşq özü üç hərfdir: «ey»ni onun -- eyni riza,
«Şin» -- işarə şükrünə, «qaf»ında müzmər kuhi-Qaf.
Müstətiəm, var idi ikki qərabə vəchi-mey,
Kəbeyi-meyxanəni ləbbeykgu etdim təvaf.
Zülf bir gün tövf edər ruyini, bir gün kakilin,
San bu il hüccaclər içrə düşübdür ixtilaf.
Zülfüvü eylə kənar, olsun əyan əbrulərin,
Yengi ay rövşənlənir, mahım, hava olduqda saf,
Vəsmə ol əbruyi-xunrizə, şəhim, hacət degil,
Zülfüqari-Heydəri-Kərrar xoşdur biqilaf.
Qaşların taqinə baxmaz xeyli müddətdir, məgər,
Kafər olmuş qiblədən Seyyid edibdir inhiraf?!

Verdi könlüm özün ol türreyi-tərrarə tərəf,
Genə bu düzd özün verdi şəbi-tarə tərəf.
Rəşkdən ki, düşübən sayə dalımca gələcək,
Yar kuyində gedə bilməyirəm yarə tərəf.
Özünü zülfn-siyəh arizi-gülgunə salıb,
Sanki Qənbər çəkilib Heydəri-Kərrarə tərəf.
Gördü ki, şəm rüxi-alinə bənzər o məhin,
Verdi pərvanə özünü gecələr narə tərəf.
Ta ki, təqrib ilə bir dəfə rüxi-yarə baxam,
Baxıram bəzmdə yüz dəfə mən əğyarə tərəf.
Baxıram zülfi-çəlipasına tərsabeçənin,
Erməni sanki baxır şövq ilə zünnarə tərəf.
Yandırır atəşi-ahilə gülü gülzarı,
Çəkməyin Seyyidi, yar olmasa, gülzarə tərəf.

Bica degil ki, ruyüvi zülfün edər təvaf,
Kafər tutubdu barmaq, edər dinə etiraf.
Rəsmi-vəfa göreydi əgər ruzigardən,
Ənqayə mənzil olmaz idi hiç kuhi-Qaf.
Saqi, şərab yoxsa, mənə dürdi-mey gətir,
Məstəm, yanımda birdi bu halətdə dürdü saf.
Zahid bilirmi zövqi-meyi-nabı, ey könül,
Biçarə harda gördü, o məzurdur, müaf.
Hər tari şami-hicrdə yüz murü-mar olur,
Dibadən olsa aşiqi-miskin üçün lihaf,
Versəydi gər cavab açılıb ağzı dilbərin,
Düşməzdi kim, vücudi-ədəmdən bu ixtilaf.
Seyyid, bu çarmixi-ənasirdəsən hələ,
Etməz pəsənd eşqdə isə ləbin gəzaf.

İsm özü bir ismdir, amma müsəmma müxtəlif,
Gövhəri-şəhvar birdir, leyk dərya müxtəlif.
İxtilafi-rəy ilə hər kimsə bir məna verib,
Ləfz özü bir ləfzdir, amma ki, məna müxtəlif-
Aləmi-pirü cavan oldu müqəyyəd rəng ilə,
Ol səbəbdəndir olub, ey dust, əsma müxtəlif.
Bəhri-vəhdət mövc edib, tişrə dağıldı qətrələr,
Oldular ol qətrələrdən dürri-lala müxtəlif.
Vəhdətə eylə nəzər kim, çizi-vahiddir haman,
Gərçi surətdə olub Fironü Musa müxtəlif.
Nur --,eyni-nardır, həm nar -- eyni-nurdur,
Duzəxü cənnət olub surətdə, cana, müxtəlif.
Hüsnü eşqü aşiqü məşuq birdir, ey könül,
Seyyida, hərgiz degil aləmdə əşya müxtəlif.

Gədayi-kuyi-yarəm, eylərəm afaqə sultanlıq,
Məni sultani-aləm qıldı yarə bəndə-fərmanlıq-
Könül, dana bilir zahid özün, meyli-şərab etməz,
Ələ al mey əyağın, başə çək, sən etmə nadanlıq.
Keçib cəmiyyətindən, ver könül zülfi-pərişanə,
Pərişanlıqda cəm ol, cəmidə vardır pərişanlıq.
Pəşiman etmədi dilbər məni ümmidi-qətlimdən,
Görüm, ya rəb, o mahın görməsin könlü pəşimanlıq.
Demişdim yarı gerçək eylərəm, ey dil, şikayətlər,
Vücudi-zarımı məhv etdi, görcək yarı, heyranlıq.
Tutubdur ləşkəri-küffari-xət rüxsari-cananı,
Həzər qıl, qalmadı Rum içrə, ey dil, bir müsəlmanlıq.
Büsati-səltənət zövqindən əhli-eşqə əfzundur
Cahan mülkündə, ey Seyyid, dəri-dildarə dərbanlıq.

Bəladır hal bilməz yarə, ey dil, mübtəla olmaq,
Cahanda dilbəri-biganə-vəzə aşina olmaq.
Fənadır aləmi-həstinümanın axırı, ey dil,
Nə sudi var sənə mədum ikən həstinümaolmaq!
Cahan yox, cismü canın yox, əlində ixtiyarın yox,
Təəllüqdən çəkib əl, xoş degildirmi fəna olmaq?
Hünər amizişi-xəlq içrə, zahid, xəlvət etməkdir,
Nə sudi məscid içrə guşəgiri-inziva olmaq.
Çəkilmiş xəlvətə zahid vurar dəm parisalıqdan,
Hünərdir dilbəri-tərsanı görmək, parisa olmaq.
Həsiri aləti-təzvir edib, aldanma, ey könlüm,
Riyadır cəbheyi-zahiddə nəqşi-buriya olmaq.
Ümidi-novbaharı olsa idi bir də aləmdə,
Degildi bülbüli-şeydayə qəm güldən cüda olmaq.
Bəladən xali olmaz aləm içrə aşiqi-sadiq,
Gərək aşiq olan amadeyi-dərdü bəla olmaq.
Sipehri-bivəfadən arzuyi-lütf etməkdir,
O şuxi səngdildən talibi-mehrü vəfa olmaq.
O fəğfuri-nəcadın möhnətindəndir mənə qismət
Şikəstə kaseyi-çini misali bisəda olmaq.
Töküldü bərgü barim, bir nihali-xüşkə döndüm mən,
Bu həm lazımdı yar eşqində bibərgü nəva olmaq.
O qarə xəttü xalü zülfə vermə könlüvü, saxla,
Əgər kim, istəməzsən, Seyyida, bəxti qəra olmaq.

317

Bu bəzmi-canfəzayə badeyi-gülfamdır layiq,
Büsati-Cəmdə, ari, dövrə gəlmək şamdır layiq.
Xətin dövründə istər təşnə könlüm buseyi-iəlin,
Sualə şərm edən gün olmaq üçün şamdır layiq.
O əgri qaşların gördükdə zahid gəldi iymanə,
Qılıncla olsa da, bəs kafərə islamdır layiq.
Xədəngin atəşi-ahinlə yaxma, ey dili-məcruh,
Gələn mehmanə, kafər olsa da, ikramdır layiq.
Dua etdim sənə, düşnam verdin, ey güli-rəna,
Məgər ol şəkkərin ləli-ləbə düşnamdır layiq?,

Zəmani-vəsldə eyb etmə öpsəm ləli-gülfamın,
Bəli, bu sünnəti-peyğəmbərə bayramdır layiq.
Yetişdin kamə, yazdın aşiqanə şerlər, Seyyid,
Nisar olsa bu dürlər kim, düri-gümnamdır layiq.

Ta dəhanın sirrinə pinhan tələbkar olmuşuq,
Yox olubdur varımız, dərdə giriftar olmuşuq.
Nəbzimizdən çəkməz əl, ey mah, bir saət təbib,
Həsrəti-çeşminlə ol gündən ki, bimar olmuşuq.
Var idik ol ləhzə kim, yox idi ərzü asiman,
Ey dəhanın sədqəsi, yoxdan məgər var olmuşuq?
Çəkdilər bazarə ol gün kim, əmanət gövhərin,
Canü dildən əl çəkib bizlər xəridar olmuşuq.
Bizdə istehqaq yox, bu nə kərəmdir bilmirəm,
Xilqəti-icadə biz hardan səzavar olmuşuq?
Yoxdur, ey arami-can, sənsiz vücudə bir əsər,
Fel özün, fail özün, biz nə günəhkar olmuşuq?
İçmişik xümxaneyi-əhbəbtü camından şərab,
Seyyida, sərməst ikən aləmdə huşyar olmuşuq.

Nə xoşdur bir zaman bir dilbərin eşqində zar olmaq,
Ümidi-vəsl ilə hicrində müddət biqərar olmaq.
Diyari-hicrdə seylabi-dərdü qəm hücumundan,
Zəlilü zarü bimiqdarü xarü xaksar olmaq.
Eşitmək gündə yüz min sərzənişlər dustü düşməndən,
Nəzərlərdən düşüb göz yaşı tək bietibar olmaq.
İraqdan yarını görcək əsib könlü, qaçıb rəngi,

Qalıb surət kimi, dildən düşüb biixtiyar olmaq.
Yetib nagəh visalə, kamə yetmək çərxi-kəcrövdən,
Dolanıb başına şayəsteyi-busü kənar olmaq.
Hücumi-şövqdən zülfü kimi öpmək yanağından,
Gəhi dişlib ləbindən, gəh ləbi tək zəxmdar olmaq.
Vüfuri-şövqdən əzbəs qılıb bu növ çox işlər,
Ədəb nagah olub qalib o işdən şərmsar olmaq.
Dönüb öz üzqəralıq üzrün etmək ol siyəhmudən,
Günahın keçmək üçün ilticası səd həzar olmaq.
Yetib Seyyid kimi vəslə, genə əğyar zülmündən
Düşüb dərdü-fəraqə vəslinə ümmidvar olmaq.

Ey eyləyən cahanda məni biqərar eşq,
Ey binəvaları eləyən xaksar eşq.
Çox şahlar səninlə düşübdür gədalığa,
Sən çox gədaları elədin tacdar, eşq.
Mənsur paydar idi çün eşqi-yardə
Kim, mənzilini etdin onun payi-dar eşq.
Aşiq olan fərar eləməz payi-dardən,
Əlbəttə payi-darlədir paydar, eşq.
Rüsvayi-aləm etdi Züleyxanı eşqi-yar,
Gülzari-Misr novgülünü etdi xar, eşq.
Oldu rəvanə əşki-Züleyxa çü rudi-Nil,
Qıldı o bikəsin gözünü əşkbar eşq.
Eşqin rəvacı hüsnlərdir, hüsnün-- eşqlə,
Ruzi-əzəldə hüsnə olub, ari, yar eşq.
Eşq olmasaydı, olmaz idi hüsn üçün rəvac,
Verdi ərusi-hüsnə əcəb iştihar, eşq.
Hər bir könüldə eşq ola, şadan edər onu,
Eylər xəzan olan çəməni novbahar eşq.
Hər kəsdə yoxdur eşq, onun bir kəmalı yox,
Kamil olan vücudlər eylər şüar eşq.
Məcnun idi bu mərhələnin piri-kamili --

Kim, qaldı ondan aləm ara yadigar eşq.
Fərhad dağə qaçdı, körüb eşq seylini,
Çün açdı közlərindən iki cuybar eşq.
Axırda gör ki, bidilü bidin edib məni,
Aldı əlimdən aləm ara hər nə var eşq.
Yar ejləməz o göydə məni bir itə hesab,
Seyyid, edib məni belə bietibar eşq.

Gətirdi təngə məni ruzgar, ey xalıq,
Cəfa edər fələki-kəcmədar, ey xalıq.
Qərayə batdı könül, keçdi iş qərarından,
Məni fəraqın edib biqərar, ey xalıq.
Yox oldu səbrü sükun həsrəti-dəhanından
Qəmində qarət olub hər nə var, ey xalıq.
Dedin ki, qoymaram aləmdə intizar səni,
Di gəl, di gəl ölürəm intizar, ey xalıq.
Deməm nəsimi-səbayə, bilirsən əhvalım,
Qəmi-nihan sənədir aşkar, ey xalıq.
Nə meyli-bağ edər xatirim, nə fikri-çəmən,
Əgər ki, sənsiz ola novbahar, ey xalıq.
Sənə ki, Seyyid olub qaibanə aşiqi-zar,
Onu visalə qıl ümmidvar, ey xalıq.

Ey sariban, qətarımızı kuyi-yarə çək,
Rəhm et, bu dağidarləri laləzarə çək.
Ey badi-şürtə, lütfü mürüvvət zamanıdır,
Bu bəhrdən səfinəmizi bir kənarə çək.
Ey naxuda, xudayə qəsəm, bu səfinəni,
Yarım olan diyarı soruş, kuyi-yarə çək.
Ol Xızri-xət gedib Xəzərilər diyarına,
Xızri-rəh ol, bizi dəxi sən ol diyarə çək.
Ey çərx, edib o mah ilə rövşən məqamımız,
Beytüşşərəf həvaləsinə bir sitarə çək.
Əğyar ilə şərab içib ol sərvi-lalərüx,
Az dağ tazədən bu dili-dağdarə çək.

Seyyid, qübari-məqdəmi ol sərvqamətin,
Bir tutiyadı, dideyi-ümmidvarə çək.

Gərəkdi kim, sala hal əhlini bəlayə fələk,
Verir həzar bəla mərdi-mübtəlayə fələk.
Əgər ki, bir-birinə mehriban ola iki kəs,
Salar bəlavü qəmü firqəti arayə fələk.
Həmişə gərdişi kam əhlini edər nakam,
Nə şahə kam verib, nə kəmin gədayə fələk.
Gərəkdi Yusifi Yəqubdən cüda qılsın,
Diyari-Misrdə satsın kəmi-bahayə fələk.
Həsədlə aşiqi məşuqdən cüda eylər,
Keçirdi başını eşq əhlinin cidayə fələk.
Gülü əlindən alıb biqərar şüğl, və leyk
Gətirdi bülbüli-şeyda kimi nəvayə fələk.
Fələk cəfası bu gündə degil sənə, Seyyid,
Əzəldə adət edib cövr ilə cəfayə fələk.

Zülfüvü ta şanə əfşan etdi, mən oldum həlak,
Cəm ikən halım pərişan oldu, sinəm çak-çak.
Yarə vurdun qeyrə, ey zalım, mən öldüm rəşkdən,
Sən iki biçarəni bir zəxmlə qıldın həlak.
Bavücudi ki, ləbin ehya qılırdı mürdələr,
Eylədi qan bağrımı, oldum həlak, ey ruhi-pak!
Ləzzəti-dünyəvü mafiha sənin camındadır,
«Ya həbibi əsqini min rahikə ruhi fədak»[1].
Eşqdə qəm çəkməz aşiq təneyi-əğyardən,
Kəştiyi-Nuhə o şuriş mövci-tufandan nə bak.

[istinad1: Sevgilim, canım sənə fəda olsun, məni şərabınla sirab et.].

Dürdi-mey ta vardır, biz dərdi-aləm çəkmərik,
Dövləti-piri-müğandan möhnətü qəm çəkmərik.
İbtilayi-fəqrdən yüz zövqü ləzzət görmüşük,
Biz bu aləmdə səfanı şahdən kəm çəkmərik.
Guşeyi-meyxanədə bəsdir bizə sınmış sifal,
Minnəti-Cəmşidü fikri-sağəri-Cəm çəkmərik.
Gər nihali-arizumuz rişəsindən xüşk ola,
Minnəti-baranü feyzi-çeşmi-pürnəm çəkmərik.
Yansa dil, xak olsa tən, ey şəm, suzi-eşqdən.
Dudumuz çıxmaz bizim, ahi-dəmadəm çəkmərik.
Gəndümi-xalın görüb cənnətdən əl çəkməz o kim,
Biz onun adını bu aləmdə adəm çəkmərik.
Üz əgər verməz bizə, bir vəchi vardır, ol pəri,
Seyyida, biz sən kimi rüxsari-dərhəm çəkmərik.

Yüz feyzin olsa xəlqə əgər afitab tək,
Dövran salar ayağa səni mahtab tək.
Bilməz rümuzi-söhbəti-həmraz dərdini,
Nadanə əhli-dil açıla gər kitab tək.
Olma məlali-xatiri-ərbabi-mərifət,
Hər vardığın büsatə səfa ver şərab tək,
Yox eybi kimsədən sənin ehsan qəbuluvun,
Ehsan edərsən aldığuvu gər səhab tək.
Məmlüvv ikən həvayi-məhəbbətlə sinəmiz,.
Seyli-həvadis ilə yıxıldıq hübab tək.
Ol afitabrüxlə keçən günlərim mənim,
İndi gəlir xəyalıma hicrində xab tək.
Başın yetər səmayə şərafətlə, Seyyida,

Eşqilə payimal ola bilsən türab tək.

Bir zaman biz dəxi ol mah ilə həmxanə idik,
Şəmi-rüxsarəsinə yanmağa pərvanə idik.
Şuri-mey başda, əyağ. əldə, səbu zanudə,
Məclisi-eyşdə həmkaseyi-cananə idik.
Rəşki-səd aqilü fərzanə idik gərçi ki, biz,
Həlqeyi-silsileyi-zülfdə divanə idik.
Hüsnünə məzhər idik ol büti-siminbədənin,
Üzünə ayinə, geysulərinə şanə idik.
Uzadıb başımızı xümdən içərdik meyi-nab,
Məst meyxanədə, biminnəti-peymanə idik.
İndi bir qeyri sayaq ilə ötürsən bizdən,
Biz məgər kim, sənə, ey gül, belə biganə idik?
Ol büti-leylivəşin aşiqi-məcnunu olub,
Şöhrəti-eşq ilə Seyyid kimi əfsanə idik.

Əl üz, ey dil, vəfadən, bəsdi, kuyi-yardən pa çək,
Nə yad et ol vəfasız dilbəri, nə cövri-bica çək.
Könül, bəsdir, usan eşqindən ol uxi-pərizadın,
Nə rüsvalıq şüar eylə, nə təni-pirü bürna çək.
Nə qıl hər nanəcibə ol pərivəşçün təməllüqlər,
Nə hər nakəsdən ol mahın səri-kuyində iyza çək.
Nə şami-hicrini sal yadə ol şuxi-dilazarın,
Nə sübhi-vəslinə ol mahi-bimehrin təmənna çək.
Nə vəslin arizu eylə, nə gör ənduhi-hicranın,
Nə ümmidi-behişt et, nari-duzəxdən nə pərva çək»
Eşit ərbabi-daniş pəndini, fərzanə ol, Seyyid,

Nə kuyi-yarə get, nə ahü fəryad et, nə qovğa çək.

Şərabi-vəslüvü qıldı mənə həram, fələk,
Məni fərağın ilə etdi təlx-kam, fələk.
Visalın ilə fələk barrın eyləmişdim qan,
Bu gündə çəkdi əcəb məndən intiqam fələk.
Məqami-qürbdə dil şad ikən visalından,
Ayırdı məndən o məhruni biməqam fələk.
Diyari-qürbət ara ol qəzali-rənayə
Həzar məkr ilə axırda qurdu dam fələk.
Gecəm, günüm bir olub ol məhin fərağından,
Görüm qərayə bata beylə sübhü şam, fələk!
Əgər o şəh deyə Seyyid mənim qulamımdır,
Bu fəxrdən sənə, seyyid olur qulami-fələk.

Can tazələnir ləli-dürəfşanını görcək,
Dil xürrəm olur sərvi-xuramanını görcək.
Dağlarə çıxıb saldı başın sünbül aşağə,
Ol lalərüxün zülfi-pərişanını görcək.
Püstə dəhəni açıla qaldı həsədindən,
Ol sərvqədin qönçeyi-xəndanını görcək.
Yəqub neçin elmədi, bilməm, fərəhindən,
Can nəqdi olan Yusifi-Kənanını görcək?
Cananı görən ləhzədə can düşdü ayağə,
Yalvardı gəda əcz ilə sultanını görcək.
Bu xaki-siyəhdən başımız çərxə ucaldı,
Ol mahrüxün gündə bir ehsanını görcək.
Seyyid, elə bildim ki, bəqa suyunu içdim,
Ol səbz-xətin qətlimə fərmanını görcək.

Ey söyləyən: ol türreyi-tərrardən əl çək!
Allahı sevirsən dilə azardən əl çək!
«Əl çək», demə, tərsabeçənin zülfi-kəcindən,
Sənanə demə: rişteyi-zünnardən əl çək!
«Vəşşəms» üzün eyləmə inkar o mahın,
Qurandı bu, iqrar elə, inkardən əl çək!
Verməzlə, könül, Yusifi bir dəstə kəlafə,
Can nəqdini tərk eylə, bu bazardən əl çək!
Qalmaz nə sənə vəsli-güli-tazə, nə xarə,
Bülbül, bir usan, sərzənişi-xardən əl çək!
Yar olsa əgər yar, nə eylər sənə əğyar,
Hər zülmü qılır yar özü, əğyardən əl çək!
Piçidə olub dərdə, qara günlərə qaldın,.
Bax tanrıya, Seyyid, o siyəh tardən əl çək.

Yarımı yar eylədin əğyarə, ey fələk,
Etdin gülü nəsib genə xarə, ey fələk.
Saldın şüai-mehrüvi rüxsari-yarıma,
Etdin zəmanədə günümü qarə, ey fələk.
Hər nisfi-şəbdə səndə degildir sitarələr?
Açdın o mahə dideyi-nəzzarə, ey fələk.
Saldın səfər havasına yari-əzizimi,.
Etdin o mahi-sabiti səyyarə, ey fələk.
Yaxdın fəraqi-yar ilə könlümü, həqqi var .
Ahım şərarı yaxsa səni narə, ey fələk.
Bidərdlərdə dərd görüb çarə eylədin,
Yoxdur bu dərdi-hicrə məgər çarə, ey fələk?
Seyyid şikayət eyləsə səndən əcəb degil,
Yarımı yar eylədin əğyarə, ey fələk.

Şadəm ki, könlüm oldu ol zülfü xalə mail --
Kim, qarəbəxtlikçün candan olubdu qabil.
Ey xoş o gün ki, tiğin çak eyləyə vücudum --
Kim, çöhreyi-visalə, oldur aradə hail.
Əzbəs ki, tutmuşam xu hicrinlə, ey cəfacu,
Olmaz dili-həzinim hərgiz visalə mail.
Rəmzi-dəhanın, ey gül, əhli-dəqayiq içrə,
Nə sirrdir ki, salmış yüz bəhsü yüz məsail.
Oldu qübari-rahım mərdüm gözünə sürmə,
Ta kuyin itlərindən kəsb eylədim fəzail.
Ağzın məbahisində nəfyi-vücud edənlər,
Göftarə gəl ki, görsün isbatına dəlail.
Qıldı əsiri-qürbət bu Seyyidi-həzini,
Bir sərvi-mahpeykər, bir şuxi-xoşşəmail.

Həzar şükr gəlib novbahar, ey bülbül,
Gül etdi çöhrəsini aşkar, ey bülbül!
Yetişdi izzətə gül, xeyli-xar xar oldu.
Dəxi nədir bu qədər xar-xar, ey bülbül!
Səfadə səfheyi-kəşkulə dendü səhni-çəmən,
Verir dilə fərəhi-bişümar, ey bülbül!
Yetişdi xosrovi-gül gülşənə cəlal ilə,
Çəlali-xaliq olub aşkar, ey bülbül!
Açıb üzün səni  gül vəslinə qılır təklif,
Mənim təki degisən intizar, ey bülbül!
Gülün vüsalını gülzardə qənimət bil --
Ki, bir də ömrüvə yox etibar, ey bülbül!
Nə nalələrdi bu, ey xəstə bülbüli-dilriş,
Nə nəğmələrdi bu leylü nəhar, ey bülbül!
Gülün gülabını axır günü çəkər əttar,
Qalır sənə bu əbəs ahü zar, ey bülbül!
Mənim gedibdi gülüm, qoy mən eyləyim nalə,
Səbəb nə, Seyyid olub biqərar, ey bülbül!

Müddətdi zülfi-yardəsən mübtəla könül,
Halın nə növ ilə keçir, ey binəva könül!
Şəmşir çəkdi qətlin üçün gəldi ol pəri,
Sandın ki, rəhm edər sənə ol dilrüba, könül.
Məndən kənarəsən dəxi biganələr kimi,
Ol zülfi-pürxəmə olanı aşina, könül.
Sən oldun aqibət rüxi-dildar məhrəmi,
Bir yadə salmadın məni, ey bivəfa könül.
Ol zülfi-rusiyah ki, mən görmüşəm onu,
Axırda başuva gətirər yüz bəla, könül.
Ol çini-zülfə etdi əsir aqibət səni,
Seyyid, gətirdi başuva yüz min xəta könül.

Hər könül kim, xətti-səbzindən əsiri-qəm degil,
Qəm onundur kim, riyazi-eşqdə xürrəm degil.
Ruzi-hicran gər şümar olsa hesabi-ömrdən,
Əhli-eşqin emrü Xızr ömründən, ey gül, kəm degil.
Gəndümi-xalın görüb bir kəs ki, mail olmaya,
Zənnim oldur ki, o kəs töxmi-bəni-Adəm degil.
Aləmi-taətdə ömrün keçdi zövqi-eşqsiz,
Gər bu isə aləm, ey zahid, bu bir aləm degil.
Başın üçün, alma əldən gəl, əyaği-badəmiz
Bu sifali-köhnədir, ey şux, cami-Cəm degil.
Nola tökdisə gözün cövr ilə Seyyid qanını,
Ey gözün qurbanı mən, aşiq səninçün kəm degil.

Gəl ey cəmalı olan zibi-canü zivəri-dil,
Gedibdi qarətə sənsiz təmam kişvəri-dil.
Dili-sənubərimiz bid tək olub lərzan

Bəlayi-badi-fərağınla, ey sənubəri-dil!
Könüldə kaş olaydın nihan xəyalın tək,
Açılmayaydı dəxi ruyi-aləmə dəri-dil.
Yetişdi bir yerə bikəsligim bu aləmdə,
Qəmin tərəhhüm edib axır oldu yavəri-dil.
Zülali-ləli-ləbin Xızri-xalə oldu nəsib,
Və leyk zülməti-zülfün çəkib Skəndəri-dil.
O, şahbaz dalınca uçardı kəbk misal,
Və leyk səngi-cəfa ilə sındı şəhpəri-dil.
Fəraqi-Yusifə oldun düçar, ey Seyyid,
Gərəkdi səbr edə bu qəmlərə peyəmbəri-dil.

Çü məndən oldu o məhbubi-dilrüba qafil,
Yəqinim oldu olur bəndədən xuda qafil.
Olurmu qabili-təmir bir vilayət kim,
Ola rəiyyəti halında padişa qafil.
Adın fədası olum, hiç gör rəvadırmı
Ki, ümmətindən ola xətmi-Ənbiya qafil.
Sənin təki büti-birəhmə olmaz idim əsir,
Kəməndi-zülfüvə saldı məni qəza qafil.
Təğafül adəti-xubandır, incimə, Seyyid,
Qəmindən olsa əgər yari-bivəfa qafil.

Sərv hərçənd rüunətdə qədin tayı degil,
Bu qədər var, sənin kimi o hərcayi degil.
Eyləyən sineyi-çaki hədəfi-tiri-bəla,
Kiprigin oxları, yainki qaşın yayı degil?
Görüb əbrusunu şəmşirə baxırsan əgri,
Zahida, başın üçün bu ramazan ayı degil.
Kimdi bəs sineyi-suzandə fəryadə gələn,

Dil gedib zülfi ilə, bu dili-şeydayi degil.
Vayımı yar eşidib, vay könül, söylədi kim,
Seyyidim çoxdan ölübdür, bu onun vayı degil.
Badeyi-sağərimi alma əlimdən, ey şeyx,
Qismətimdir bu mənim, bu atovun payı degil.
Sinədə yaralərim saydı, dedi: «min»--cərrah,
Səhv edib bu, hələ mindən birinin sayı degil.
Demə, zahid nəzər etməz görə gər ol ayı,
Seyyida, getmə kəc, axır bu qədər ayı degil.

Ta ki, sən oldun əsiri zülfi-yarın, ey könül,
Qarə oldu yar əlindən ruzigarın, ey könül.
Yüz cəfa gördün, vəli, bir gəz şikayət etmədin,
Hansı lütfündən xəcilsən nazlı yarın, ey könül.
Nə ümid ilə, genə dilbər sənə vermiş firib
Kim, fərəhnak olmusan, yoxdur qərarın, ey könül.
Yoxsa əğyar ilə görmüşsən genə məhparəni?
Bənzəməz hərgünkünə bu ahü zarın, ey könül.
Gər o ahugöz düşə aləmdə bir gün damüvə,
San qəzali-çərx olur yerdə şikarın, ey könül,
Aldı əqlü huşüvi şövqi-dəhanı dilbərin,
Getdi əldən yox yerə məcmu varın, ey könül.
Xublər zülfinə qoymazdım səni bənd olmağa,
Məndə olsaydı əgər kim, ixtiyarın, ey könül.
Ol pəridən çək dedim əl, pəndimi guş etmədin,
Nalədir Seyyid kimi indi mədarın, ey könül.

Vaizi-şəhr özü iqrarına etsəydi əməl,
Düşməz idi bu qədər din ilə dünyayə xələl,
Qovli-zahidlə əməl etməmişəm, həşr günü
Var ümidim ki, mənə dadrəs olsun bu əməl.

Bir əyağ ilə dəmağın edə tər zahidi-xuşk,
Kafərəm çəksə əgər badeyi-gülfamdən əl.
Oğlun ölsün, bu qədər məscidə getdin bəsdir,
İmtahan etmək üçün bircə də meyxanəyə gəl.
Xum ayağına qoyub başuvi, al dəstüvə cam,
Ta ola kəşf sənə nükteyi-əsrari-əzəl.
Şövqdən köhli-Sifahan kimi dürtər gözünə,
Seyyida, yetsə əgər Zuiyi-zarə  bu qəzəl.

Açıbdı çöhrə güli-gülsitanın, ey bülbül!
Nə vəchdən tutulur bəs lisanın, ey bülbül!
Gəhi dilin tutulur, gəh fəğan edərsən sən,
Nədir, bəyan elə dərdi-nihanın, ey bülbül!
Xəzan qəmilə məgər xatirin pərişandır,
Bahari-fəsldə artar fəğanın, ey bülbül!
Baharım oldu xəzan, qoy mən eyləyim nalə,
Sənin ki, döndü baharə xəzanın, ey bülbül!
Vücudi-Məryəmi-gülbündə gəldi İsiyi-gül,
Yəqindi tazələnir indi canın, ey bülbül!
Sənin zəbanələrin yandırır zəmanələri,
Əcəb ki, ol oda yanmaz zəbanın, ey bülbül!
Həzar mərtəbə şirindi nöqlü şəkkərdən,
O xosrovani əda dasitanın, ey bülbül!
Zaman-zaman fərəhin var təbəssümi-güldən,
Xoşa, bu gunə gecə hər zamanın, ey büblül!
Sənin təranələrin şerinin nəzirəsidir,
Münifü xoşsüxənü nüktədanın, ey bülbül!
Həvayi-xar ilə sən tutmasan qərarü şəkib,
Qızıl qəfəs ola gər aşiyanın, ey bülbül!
Qədəm gül üstünə qoymaq nədir, səzadır əgər
Tökülsə xəncəri-xar ilə qanın, ey bülbül!
Gərək ola qədəmi-yardə səri-aşiq,
Həsən degil bu rəviş dasitanın, ey bülbül!
Kitabi-güldən oxursan Rəsul mədhini sən,
Rəvadı Seyyid ola mədhxanın, ey bülbül!

Vəsli-yar ilə yetişdi hamı bayramə, könül,
Yetmədin dövləti-didar ilə sən kamə, könül.
Daneyi-əşk töküb etmə təmənnayi-visal,
Gəlməz ol mürği-hümapişə bizim damə, könül.
Xəlqə eyd oldu,.vəli, mahi-məhərrəmdi mənə
Ki, fəraq ilə günüm döndü bu gün şamə, könül..
Göz qərasın həll edib xameyi-müjgan ilə,
Yeri vardır yazasan dilbərə bir namə, könül.
Ruzi-eyd oldu, mənim yari-güləndamım yox,
Nə həvəs eyləyim ol badeyi-gülfamə, könül.
Yetmək olmaz bu gün ol dilbəri-siminbədənə,.
Düşmə bica yerə sən bu təməi-xamə, könül.
Seyyida, ol məhi-bimehr fərağında bu gün
Nə edər badəyə rəğbət, nə baxar camə könül.

Nədəndir gec açarsan ruyi-rənadən niqab, ey gül!
Məgər ki, xuni-bülbüldən varındır bir hicab, ey gül!
Degil badi-səbadən cünbüşün, lərzanü tərsansan,
Xəzani-biamandan eyləyirsən iztirab, ey gül!
Kitabi-mərifətdir əhli-həqqə hər vərəqparən,
Çəməndə eyləyir təqrir bülbül bab-bab, ey gül!
Kitabi-asiman sənsən, sənə kəşşafdır bülbül;
Amandır, açma hər nadanə əsrari-kitab, ey gül!
Mübarək vəqt, xürrəm fəsldə izharə gəldin sən,
Qüdumündən olubdur əhli-aləm feyzyab, ey gül!
Bu gunə tökmə gözdən bülbülün əşkin gülab asa,
Çəkər əttar səndən intiqam ilə gülab, ey gül.
Hesabə almadın, hər dəmdə tökdün bülbülün qanın,
Mükafati-əməldən xoşdur olmaq sərhesab, ey gül!
Müənbərsən, müəttər, şeri-Seyyid tək bir eybin yox,
Vəlakin eyləməzsən xarü xəsdən ictinab, ey gül!

Mənə hicrində o növ ilə degil surəti-hal
Ki, sual etsən ola qüvveji-təqrirə məcal.
Gər elən vəqt sənin adını zikr ejləməsəm,
Gəlməsin kəlmeji-tovhidə dilim, ej güli-al!
Nəfəsim qətdir, ajineji-rüxsarüvi tut,
Ta müşəxxəs ola, ej gül, sənə kejfijjəti-hal.
Ej dejən, bal deməklə ağız olmaz şirin;
Nijə bəs zikri-ləbijlə mənə var ləzzəti-bal.
Sənəma, xali-tərindirmi zənəxdanında,
Ja durubdur tərəfi-çeşmeji-Zəmzəmdə Bilal?
Bilməz ol tifl hələ şiveji-məşuqəligi,
Şiri-madər təki qanını bilir, lejk, həlal.
Katibi-sün çəkər tərhi-qaşın pejvəstə,
Ja hər aj başı düşər çərxə qaşından bu misal?
Sejjida, çəkmə əbəs bari-əmanət qəmini,
Çək əjağ, iç meji-gülfamı, degilsən həmmal.

Gülşənlər içrə gər açıla səd həzar gül,
Sənsiz, gülüm, gəlir gözümə nişi-xar gül.
Sənsiz, təsəvvür etmə, gedim sejri-bağə mən,
Səhni-çəməndə gər açıla hər bahar gül.
Döndərdi bülbülün ürəgin qanə, aqibət
Öz tutduğu işindən olub şərmsar gül.
Gər kəsməsəjdi bülbüli-zarın qərarını,
Olmazdı aqibət özü həm biqərar gül.
Aşiq çəkərdi gülşənə müjgan ilə həsar,
Gər göstərəjdi bülbülə bir etibar gül.
Gör zülm pajəsin ki, şəhi-müstəqil ikən,
Təxtindən oldu beş gün içində kənar gül.
Bir gülüzar toprağıdır kim, nümüvv edər
Hər xakdən ki, çöhrə qılır aşkar gül.
Zülfü rüxün xəjalı ilə zövqlər edər,
Həmdəm olubdu Sejjidə lejlü nahar gül.

Şükr lillah ki, cəmadı veribən can aldım,
Fərrux, ey bəxt ki, bu canı nə ərzan aldım.
Müştəri oldum o xurşidvəşü mahrüxə,
Bir büti-Zöhrəcəbinü məhi-taban aldım.
Şükr kim, nüsxeyi-tədbiri gətirdim ələ mən;
Hicr bimarı idim, vəsl ilə dərman aldım.
Ləbü zülfü xətinə oldu mənim dəstrəsim,
Yetdi innabə əlim, sünbülü reyhan aldım.
Ağlaya-ağlaya yetdim ləbinin busəsinə,
Gövhəri-əşk töküb, ləli-Bədəxşan aldım.
Pak qıldım xətini yetdi gözüm arizinə,
Mur əlindən, əcəba, mülki-Süleyman aldım.
Seyyida, şadlığı möhnəti-qəmdə görəni,
Veribən şadlığı mən qəmi-canan aldım.

Xoş ol zaman ki, ol şəh ilə həmzəban olam,
Hər sözdə bir.dilim tutulub, natəvan olam.
Ta sənsiz özgələr üzünü görməsin gözüm,
Gözlərdən istərəm dəhənin tək nihan olam.
Guya qəfəsdə bülbül olur zağə həmnəfəs --
Sənsiz əgər ki, həmdəmi-huri-cinan olam.
Bir zəxm urub ötüşmə səni tari, ey sənəm,
Qorxum budur bu zərbət ilə nimcan olam.
Ya rəb, nəsib qıl mənə Seyyid tək ol günü --

Kim, növki-tiri-qəmzeyi-yarə nişan olam.

Qübari-məqdəmüvə dün ki, tutiya demişəm,
Gözüm çıxaydı ki, səhv etmişəm, xəta demişəm.
Mənim ki, könlümü qan eylədin, vəfadəndir,
Qələtdir ol ki, səni yari-bivəfa demişəm.
Əgər muradın isə can, təvəhhüm eyləmə kim,
Əzəl günündə onu mən sənə fəda demişəm.
Məni bu əhli-nəzər təni öldürür, Seyyid,
Neçin ki, yar üzünə «Şəms vəzzüha» demişəm.

Ta aşiqi-o şuxi-cəfagüstər olmuşam,
Cismim yanıbdı odlara, xakistər olmuşam.
Xovfum budur rəha qıla səyyadi-səngdil,
Künci-qəfəsdə indi ki, mən bipər olmuşam.
Məndən səvayə cövr eləməz ol pəricamal,
Ancaq onun bu lütfünə mən çakər olmuşam.
Şayəd ki, bir öpəm o şəhin asitanəsin,
İllərdi pasibanına xidmətkər olmuşam.
Ol sərzəniş ki, Seyyidə eylərdim eşqdə,
Seyyiddən indi xeyli ezüm bədtər olmuşam.

Yoxdur əlac, çoxdu bu könlümdə həsrətim,
Nə vəslə dəstrəs, nə-fərağında taqətim.
Çox həsrətəm dübarə görüm bir cəmalüvi,
Vahəsrəta, könüldə qala gər bu həsrətim,
Yetməz əlim nə çarə düşəm xaki-payüvə,
Bir-bir deyim sənə ələmü dərdü möhnətim.
Eşqin məriziyəm, məni eylər bu qəm həlak,

Darüşşəfayi-vəslüvə var indi hacətim.
Əzbəs ki, vəsl təşnəsiyəm, çeşmeyi-bəqa
Şəhdi-zülalın olmasa etməz kifayətim.
Bilməm nədir fəqih deyən məhşəri-əzim,
Hər gün ki, görməsəm üzün, oldur qiyamətim.
Duzəx səninlə xüldi-bərindən ziyadədir,
Sənsiz behişt içində olur çox üqubətim.
Qurbanın eylə, qoy dolanım başuva məni,
Bundan ziyadə hicrüvə yox istiqamətim.
Bir qəmzə ilə Seyyidi qıl şöhrəti-cahan,
Yetsin səmayə ta əsəri-cahü rüfətim.

Çıxıban şəhrdən, ey mah, cigərqan gəldim.
Bu səfərdən tapıban ay kimi nöqsan, gəldim.
Həsrəti-silsileyi-zülfi-pərişanın ilə
Piçü xəmlər çəkib, ey şux, pərişan gəldim.
Sanma kim, əbri-siyəhdən tökülürdü baran,
Mən idim, ey güli-rəna, gözü giryan gəldim.
Nə üçün verməmişəm vəsl günü canı sənə,
Gərçi gəldim, bu xəyal ilə pəşiman gəldim.
Yoxdu bir kimsə ki, qəmdə edə halımı sual,
Məni-bidil ki, belə bisərü saman gəldim.
Muri-avarə idim, daməni-səhranı gəzib,
Bildim Aqabəgi aləmdə Süleyman, gəldim,
Şükr, Seyyid, gedirəm kami-dil ilə bu səfər,
Gərçi bu dərgəhə hər sal firavan gəldim.

Gedibdi qeyr ilə gülzar seyrinə yarım,
Qılıbdı dağ məni yari-lalərüxsarım.
Səfa ilə olanı zairi-səri-kuyin,
Olubdu Müştəriyü Mehrü Mah zəvvarım.

Bəsani-şişeyi-fanus bəs ki, mən safəm, .
Cahanı rövşən edir pərdə içrə əsrarım.
Yüzünü görməgə yarın, eşitməgə sezünü,
Həmişə göz-qulaq ol, ey dili-tələbkarım.
Mətaim olmasa idi mətai-fəzlü hünər,
Mənim də müştəridən gərm olurdu bazarım.
Su üstə misli-hübabəm həva ilə məmlüvv,
Həvadən özgə mənim yoxdu bir həvadarım.
Həvayi-türreyi-pürçini-yar ilə, Seyyid,
Cəhanə ətr verir müşk kimi əşarım.

Dün ki, bir fürsət tapıb yar ilə göftar eylədim,
Dərdimi təqrir edib, ərzi-dili-zar eylədim.
Dərgəhində müttəsil fəxrim gədalıqdır mənim,
Mən haçan, ey şəh, gədalıqdan sənə ar eylədim?
Ta ki, bildin aşiqəm, etdin mənə cövrü cəfa,
Dad o gündən kim, sənə eşqimi izhar eylədim.
Göz yaşımdan verdim, ey nəxli-vəfa, nəşvü nəma,
Arizi-alın alıb bir rəşki-gülzar eylədim.
Zülməti-hicrində qaldım şami-qəmdə mən özüm,
Arizin əğyar üçün şəmi-şəbi-tar eylədim.
Xəlqə göstərdim hilal əbrulərindən bir nişan,
Ey dəhanı Kövsərim, yoxdan səni var eylədim.
Çox Züleyxalər sənə can ilə oldu müştəri,
Yusifim, didarını mən ərzi-bazar eylədim.
Eyləyib bülbül kimi şamü səhər fəryadlər,
Kəndimi ol gül yanında, aqibət, xar eylədim.
Badeyi-ləli-ləbin övsafın etdim aşikar,
Məsti-qəflətkən cahan əhlini huşyar eylədim.
«Qül hüvəllahü əhəd» mənasını qıldım bəyan,
Cümlə sirri-vəhdətə xəlqi xəbərdar eylədim.
Zati-xaliq çün olub zati-Əlidən cilvəgər,
Xaliq övsafında mədhi-zati-Kərrar eylədim.
Vəhdət idi məqsədim, çünki ibarət oldu təng,
Seyyida, naçarlıqdan ləfzi təkrar eylədim.

Meyli-meyi-gülfam ki, axır nəfəs etdim,
Meyxaneyi-vəhdətdə mən əxzi-qəbəs etdim.
Bisövt gərəkmiş ola bu mahi şikarım,
Damimi qırıb getdi o mahi çu səs etdim.
Şayəd gələ bir şaxi-gülə bülbüli-bidil,
Öldüm, çürüdüm, cismimi manəndi-xəs etdim.
Şayəd düşə dalımca o Leyli əli daşlı,
Divanəligə canü könüldən həvəs etdim.
Dadimə yetə ruzi-bəla, hiç kəsim yox,
Bikəsligi axır özümə dadrəs etdim.
Ol qafiləsalarə səsim yetmədi axır,
Hərçənd ki, mən nalə bəsani-cərəs etdim.
Nakəsligin izhar elədi axırı, Seyyid,
Səhvim var imiş tərbiyəti-səgməgəs etdim.

O novnihal ki, sərvi-rəvanımızdı bizim,
Onun fədası ki, cism içrə canımızdı bizim.
Biz ol piyadeyi-bipalərik bu ərsədə kim,
Vəzirü şahü gəda pasbanımızdı bizim.
Əgərçi xakdənik, yoxdu xakə siqlətimiz,
Səbuk edən bizi ritli-giranımızdı bizim.
Nə qəm cahanı edə ləşkəri-bəla qarət,
Səvadi-meykədə darül-amanımızdı bizim.
Fəzayi-qüdsdədir seyrgahi-vəhdətimiz,
Bu kəsrət aləmi ədna məkanımızdı bizim.
Güli-cəmalımızın vəsfini qılan Seyyid,
Şikəstə bülbüli-şirinzəbanımızdı bizim.

Xilqətdə Fəlatun ilə gər mən tən olurdum,
Ol arif olub, mən nə üçün kovdən olurdum?
Təklif ilə olsaydı əgər vəzi cahanın,
Zər olmayıban mən nə üçün ahən olurdum?
Lütf ilə mənim sarı da düşsəydi nigahın,
Xar olmaz idim, mən dəxi bir gülşən olurdum.
Versəydi əgər dəstimə tir ilə kəmanın,
Seyd olmaz idim, mən dəxi seydəfkən olurdum.
Xilqət günü hərgah mənim bəxtim olaydı,
Kəttan olub ol mahıma pirahən olurdum.
Olsaydı mənim rəyim ilə xilqəti-aləm,
Bir ol büti-simintən olub, bir mən olurdum.
Etsəydi qəza gər məni Seyyid kimi şair,
Bu dürri-giranmayələrə məxzən olurdum.

Məni hər kim edib ol mahliqadən məhrum,
Görüm olsun onu əltafi-xudadən məhrum.
Qönçeyi-dil nə vəsaitlə guşayiş tapsın,
Gülşəni-eyşim olub badi-səbadən məhrum.
Qoydu suzan, edib ol saiqeyi-hüsnü cəmal
Nəxli-ümmidimizi nəşvü nəmadən məhrum.
Tutmayan aləm ara piri-müğan damənini,
Vadiyi-qəmdə qalır rahnümadən məhrum.
Sındı səndən, dəxi dil naləvü fəryad etməz,
Çini olmazmı şikəst, olsa sədadən məhrum?»
Gəlmişəm kuyüvə yüz səy ilə can vermək üçün,
Məni qaytarma, Xəlilim, bu Minadən məhrum.
Qədrini bilməsən ol Kəbeyi-hüsnün, Seyyid,
Eyləsin həq səni aləmdə səfadən məhrum.

Girib həmmam ara dildarı gördüm,

Təcəlladən əyan didarı gördüm.
Bədən su içrə, baş sudən kənarə,
Su içrə şölə çəkmiş narı gördüm.
Dağıtdı kakilini şanə hər yan,
Pərişan nafei-tatarı gördüm.
Nəhan oldu pəri tək xəlvətində,
0 xəlvətdə olan əsrarı gördüm.
Gözüm düşdü o badami-düməğzə,
Dolu badamdən anbarı gördüm.
Sulandı şərbəti-şəkkərdən ağzım,
Bürəhnə çün süreyni-yarı gördüm.
O zülfü, Seyyida, qıldı həmayil,
Sənin boynunda mən zünnarı gördüm.

Bica degil ki, hicrdə ey afət, ağlaram,
Bu ağlamaq verir mənə bir halət, ağlaram.
«Qədqamətissəlat» müəzzin deyən zaman,
Ey gül, düşər xəyalıma ol qamət, ağlaram.
Bica degil bu ağlamağım Seyyida, mənim,
Biganələrlə yarım edib xəlvət, ağlaram.

Qəzələ tam halda məlum mənbələrdə təsadüf edilmədi.

Ta girib meyxanəyə mey sağərin nuş eylədim,
Göftüguyi-kövsərü xüldi fəramuş eylədim.
Bağə girdim vəsfi-rüxsari-güləfşanın edib,
Mədhi-güldən bülbüli gülşəndə xamuş eylədim.
Ta qəra zülf içrə gerdüm Kəbeyi-rüxsarüvi,
Kəbə-asa xaneyi-qəlbi siyəhpuş eylədim.
E1ami-hicran bu dili-qəmgin təsəlli tapmağa,
Ta səhər, ey məh, xəyalın zibi-ağuş eylədim.
Laf edib guya ki, biz dəryaləri nuş etmişik,
Seyyidi bir cam ilə mən məstü mədhuş eylədim.

Yar ilə fürsət tapıb bir dəm ki, göftar eylərəm,
Zövqdən gülləm, onu yüz dəfə təkrar eylərəm.
Qoy rəqib etsin mənə əfzun cəfa kim, hər zaman
Bir şikayətçün gedib yar ilə göftar eylərəm.
Padşahım, sən məni tək qıl qəbuli-xidmətin,
Mən gədayi-kuyin olmaqdan məgər ar eylərəm?
Qeyr ilə görmək düşər yadimə, ölləm rəşkdən
Hər zaman kim, kuyi-yarə əzmi-didar eylərəm.
Sordum əsrari-dəhanın dün o şəkkərləb dedi;
Seyyida, aləmdə mən yoxdan sözü var eylərəm.

Aşiqəm, aşiqəm nigarə qəsəm,
O siyəhçeşmi-pürxumarə qəsəm.
Ruzgarım qaraldı zülfün tək,
0 səri-zülfi-muşkbarə qəsəm.
Eşqüvə, ey nigar, məcburəm,
0 gedən əldən ixtiyarə qəsəm.
Çəkmərəm hiç damənindən əl
Verməsən kam, kirdgarə qəsəm.
Ağlaram ol qədər ki, qərq olusan,
Lücceyi-çeşmi-əşkbarə qəsəm.
Mənə təlx etdi ömrü hicranın,
Ləzzəti-zövqi-vəsli-yarə qəsəm.
Qaşın, ey zülfü qarə, qətlim edər,
O ikibaşlı Zülfüqarə qəsəm.
And içib Seyyid aşiqin oldu,
Müshəfi-hüsnüvə dübarə, qəsəm.

Bir mahı sevib, çərxə təmənnadən usandıq,

Bu düşməni-kəcbinə müdaradən usandıq.
Ol laləruх olmaz bizə nə dust, nə düşmən,
Əğyar ilə bihudə bu qovğadən usandıq.
Bülbül, sənin olsun dəxi gülzari-məhəbbət,
Bu bağdə biz ol güli-rənadən usandıq.
Divanə olub daməni-səhralərə düşdük,
Biz silsileyi-zülfi-çəlipadən usandıq.
Başdan yerə qoyduq həvəsi-badeyi-nabı,
Atdıq ayağ əldən, meyi-səhbadən usandıq.
Biz qisseyi-Şirin ilə Fərhadı unutduq,
Əfsaneyi-Məcnun ilə Leyladən usandıq.
Əl çək, dedik, ol mahdən, əl çəkmədi Seyyid,
Biz əl çəkib, ol aşiqi-rüsvadən usandıq.

Degildir eyb əgərçi xublər təbində naz olmaq,
Vəli ondan gözəldir əhli-eşqə dilnəvaz olmaq.
Fələk, bari, cəfalər eyləyib, sən bir qəm artırma,
Əlindən gəlmədisə əhli-dərdə çarəsaz olmaq.
Əsiri olmayan bir zərrə yox ol mahi-bimehrin,
Mənə nöqsanmıdır dilbəsteyi-hüsni-məcaz olmaq?
Nə şeydən qismətim az olsa, şadəm, ruzi-məhşərdə
Məni dilxun edər amma, meyi-gülgunum az olmaq.
Dönüb, ey qurə, axır zahidin həlvası olmaqdan,
Kənari-süfreyi-meyxarədə xoşdur piyaz olmaq.
Ağardı muyi-sər, qəddin xəm oldu, taqətin getdi,
Sənə layiq degil, Seyyid, dəxi məşuqəbaz olmaq.

Nə bu gün bağdə yarım, nə meyim var mənim,
Seyri-gülzardə bihudə nəyim var mənim?
Sizi tari yetirin piri-xərabətə məni
Ki, bu gün saqi əlindən gileyim var mənim.

Mənə məcuni-meyi-ləli dəvadır, saqi,
Ki qəmi-hicr ilə cismimdə geyim var mənim.
Can sənin, cism sənin, əmr sənin, fel sənin,
Cümlə sənsən, bu arada nə şeyim var mənim?
Məni Seyyid təki çək guşeyi-meyxanələrə;
Artırır qəm dəxi məsciddə nəyim var mənim?

Bülbüli-şuridəyəm mən, fəsli-gülzar istərəm,
Könlümü ta eyləyə qovğayi-gülzar istərəm.
Bir Süleymanəm ki, mən Bilqeysə aşiq olmuşam --
Kim, onu mülki-Səbadən Qudsə səyyar istərəm.
Sihhət istər xəlq öz bimarına, amma ki, mən
Dideyi-bimari-yarı, vəh ki, bimar istərəm.
Bəzmi-aşiq rövşən olmaz afitabü mah ilə;
Əksi-ruyin bəzmimə şəmi-şəbi-tar istərəm.
Tutiyi-könlüm nəbati-Misrə etməz etina,
Müxtəsər kim, mən ləbi-ləli-şəkərbar istərəm.
Aç ləbi-ləlin, təkəllüm qıl, «kəma fiha» yəqin,
Ey büti-İsa-təkəllüm, mən yoxu var istərəm.
Olmaram Seyyid təki hər bivəfanın aşiqi,
Sahəti-aləmdə bir yari-vəfadar istərəm.

Ta o mahın xətü xalinə nigah eyləmişəm,
Günümü eşqlə aləmdə siyah eyləmişəm.
Lərzə eylər bədənim kureyi-simab kimi
Ki, baxıb ayineyi-hüsnünə ah eyləmişəm.
Göz yaşilə ləbi-dildardən aldım busə,
Su qatıb badeyi-gülfamə günah eyləmişəm.
Çox da nadan degiləm, anlamayım xeyrü şərim,
Meyə sərf etməyən ovqatı təbah eyləmişəm.
Neylərəm ayü günü, tək meyim olsun, ərəqim
Ki, bunu mehri-dirəxşan, onu mah eyləmişəm.

Öpmüşəm gün kimi mən xaki-dəri-dildarı,
Hər zaman kim, tələbi-rüfətü cah eyləmişəm.
Aləmin dərdü qəmindən xəbərim yox, Seyyid,
Mən ki, meyxanəni illərdi pənah eyləmişəm.

Dedim ki, yarə qəmi-hicr dasitanı yazım,
Məlalü dərdi-dili-zarü natəvanı yazım.
O şahbazi-büləndaşiyanə bir dil ilə,
Bu hali-bismili-viranəaşiyanı yazım.
Gözüm qarasını həll eləyib midad içrə
Bu intizari-dilü çeşmi-xunfəşanı yazım.
Yazım o səngdilə şərhi-firqətin, yoxsa
Zəmanə dərdimi, ya qüsseyi-cahanı yazım.
Nə firqətin, nə zəmanə qəmin, nə qüssəsini,
Nələr ki, başıma hicrində gəldi anı yazım?
Fəraqi-ləli-ləbində o sərvi-lalərüxün,
Qəmində gözdən axan qətrə-qətrə qanı yazım.
Zibəs təpidələnir mübtəla könül, qoymaz
Ki, ol pərivəşə mən hali-cismü canı yazım.
Məbadə can çıxa, Seyyid, gedə bu namə ilə,
Gərək bu naməni candan ona nihani yazım.

Səndən ey Kəbeyi-üşşaq, səfa görmüş idim,
Əhli-eşqi səri-kuyində fəda görmüş idim.
Kəbeyi-kuyin idi səcdəgəhi-əhli-səfa,
Taqi-əbrulərüvi qiblənüma görmüş idim.
Kimə sən qəhr ilə düşnam verəydin, ey şux,
Əvəzində sənə mən xeyr-dua görmüş idim.
Mənim ol hüsni-cahansuz ki, məşuqumdur,
Səndən, ey dilbəri-xurşidliqa, görmüş idim,
Çini-zülfündə ki, bənd idi dili-pürxunum,

Nəkhət ilə onu mən müşki-Xəta görmüş idim.
Məzhər olmadı yüzün pərtövi-şəmsi-əzələ,
Mən səni məzhəri-ənvari-xuda görmüş idim.
Hüsni-yari-əzəl olmuşdu çü səndən zahir,
Seyyidin eşqini ol hüsnə rəva görmüş idim.

Hər zaman kim, həlqeyi-zülfi-kəcin yad eylərəm,
Qıvrılıb əfi kimi yüz ahü fəryad eylərəm.
Qayəti-rəşkim təmaşa qıl ki, qanımdan keçib,
Qeyri qanın tökməgə ol şuxi mötad eylərəm.
Son, könül, fürsət tapıb ol yarə qurban kim, sənə
Gər əlimdən gəlsə, billah mən də imdad eylərəm.
Mətləbim bir gecə əfğanım yetirməkdir sənə,
Bunca kim, ey mah, cövründən sənin dad eylərəm.
Cövrlər kim, eyləmişdin birbəbir yad eyləyib,
Şami-hicran könlümü bu növ ilə şad eylərəm.
Seyyidi-bəxti-qəranı gər «Bilalımdır» desən,
Ey adın qurbanı, mən aləmdə bir ad eylərəm.

Şəbi-hicran o qədər naləvü əfğan etdim,
Ta ki, çeşmi-fələki halıma giryan etdim.
Görcək ol surəti-zibanı özümdən gedibən,
Surəti-halıma surət kimi heyran etdim.
Bu təmənnadə idim kim, ola can qurbanın,
Şükr lillah ki, axır sənə qurban etdim.
Eylədim dərdü qəmi-hicrə ölümdən çarə,
Gör nə asan bu qədər müşgülə dərman etdim.
Ta dedim aşiqinəm qəhr ilə tökdün qanım,
Aşiq oldum sənə, ey mah, məgər qan etdim?!
Oldu qətlimdə peşiman, peşimanəm kim,
Nalə ilə özüm ol mahı peşiman etdim.
O qədər ağladım ol mah qəmindən, Seyyid,

Aqibət Nuh kimi aləmə tufan etdim.

Ta səhər şami-fərağın kövkəbəfşandır gözüm,
Əşki-gülgun içrə, ey bimehr, pinhandır gözüm.
Gəh gözün yadilə könlüm dərd ilə bimardır,
Gəh ləbi-ləlin xəyalindən dolu qandır gözüm.
Gəh gözüm əhvalına könlüm qılır fəryadlər,
Gah könlüm dərdinə suz ilə giryandır gözüm.
Dövri-çeşmi-əşkbarımda səfi-müjgan degil,
Ol pərinin oxlarından dolu peykandır gözüm.
Yardən ayrıldı, bilməz şami-hicran halını,
Seyyidi-biçarə əhvalinə heyrandır gözüm.

Siyah zülfün olub ruyüvə niqab dedim,
Bu gün genə tutulub, ey məh, afitab dedim.
Dəhani-yar ki, bir nöqtədir, nədir sirri,
Vücuda gəldi, bu yox vəsfi bir kitab dedim.
O xətti-ruyinə zülfi əlaqəsi gətirib,
Həbəş sipahına rəhbər olub qürab dedim.
Dedim şərab ləbi-ləlüvi, zəhi xiclət,
Nə məstlikdi bu kim, mən şərabə ab dedim-
Rəvadi qan ola dil, ey cəmalı xurşidim,
Ləbi-lətifüvi nisbətdə ləli-nab dedim.
O ruhi-əzəmi kəmtər cəmada bənzətdim,
Məsihə töhməti mən xanimanxərab dedim.
Həvəslə şərh elədim arizin gülüstanın,
Behişti-həşt-dəri xəlqə bab-bab dedim.
Xəyali-vəslin ilə pür görüb dili-zarı,
Dolub həvayi-məhəbbətlə bir hübab dedim.
Rəqibi yar ilə görməkdən ölməgim xoşdur,
Amandı qanımı tək, eylə bir səvab, dedim.
Ləb üstə xalını gördüm o növsərin, Seyyid,
Qonubdu şəkkərə bir bəxtəvər zubab, dedim.

Neçə rədifi-qəzəl etdim intixab, dedim,
Nəzireyi-şüərayi-fələkcənab dedim.
Olar ki, hər biri bir afitab-rəxşandır,
Bu zərrə ta ola xurşidə intisab, dedim.
Nəzireyi-qəzəli-Cürmiyə edib iqdam,
Həzar cürmü qüsur ilə bir cəvab dedim.
Hicab eyləmədim göfteyi-Sürəyyadən,
Cəvab ol əxtəri-tabanə bihicab dedim.
Müniri nəyyiri-əzəmdi çərxi-nəzm üzrə,
Nə eybi, gər onu nisbətdə afitab dedim.
Cigərdə daği-nihan bir cavab Dilxunə,
Xəcalət atəşinə dil olub kəbab, dedim.
Könüldə var nihan iştiyaq Müştaqə,
Olur ki, bir gün ola vəslə fəthi-bab, dedim.
Ümid var ki, edə əfv cürmümü Cürmi,
Xətalərimi bilib, Seyyida, cəvab dedim.

Əl çatsa fəda canımı cananə edərdim,
Şəmi-rüxünə könlümü pərvanə edərdim.
Ey zahidi-bizövq bu məscid ki, sənin var,
Olsaydı mənim, mən onu meyxanə edərdim.
Minbər əvəzi onda qoyardım xümi-badə,
Vəqf ol xüm üçün bir neçə peymanə edərdim.
Bir tarə düzərdim neçə yüz daneyi-əngur,
Anı əvəzi-səbheyi-səddanə edərdim.
Meydən ötürü əkmək üçün tak yerində,
Hər yerdə ki, var mədrəsə viranə edərdim.
Düşsəydi nəhani əlimə bəççeyi-zahid,
Heç onda bilirsənmi ki, aya, nə edərdim.
Seyyid tək edib vəsf pərilər xətü xalın,
Bu vəzlə aləmləri divanə edərdim.

Neylirəm gülzarı kim, sən gülüzarımsan mənim,
Sünbülüm, sərvim, gülüm, bağım, baharımsan mənim.
Dolsa aləm xublərdən istəməm, zira ki, sən
Xublərdən, sevdigim, ziba nigarımsan mənim.
Gah alırsan canımı, gahi verirsən can mənə,
Sən məgər kim, ey büti-tənnaz, tarımsan mənim.
Gəlmə nəşim üstə versəm həsrətindən can əgər,
Qeyrilər ta olmasın agəh ki, yarımsan mənim.
Başımın tacı qübari-məqdəmindir, ey sənəm,
Sən səriri-izzət üzrə tacdarımsan mənim.
Seyyidi-sərgəştə tək miskin gədayəm, leyk sən,
Sərvərim, şahım, pənahım, hər nə varımsan mənim

Zamani-ehtirazımdır bu gün, meyli-şərab etdim,
Bihəmdilləh ki, axır ömrdə mən bir səvab etdim.
Pəşimanəm ki, bir müddət qılıb vaiz sözün bavər
Bahari-ömrdə mey ülfətindən ictinab etdim.
Meyi-nab ilə abad eylədim, səd şükr, can mülkün,.
Əgərçi xaneyi-təqvamı aləmdə xərab etdim.
Ləbin şövqilə, ey məh, asitanın daşların hər gün
Töküb xunabə gözdən hər birin bir ləli-nab etdim.
Şəhid oldun könül, axırda ol xunxar tiğindən,
Bihəmdilləh ki, Seyyid tək səni həm kamyab etdim.

Əgərçi sənsiz olur əhli-eşqə badə həram,
Ləbin xəyalı ilə vacib oldu şürbi-müdam.
Həmişə dildə ləbin şövqidir, gözün fikri
Ki, rindi-meykəşə lazımdı şəkkərü badam.
Səfayi-kuyüvə ehram bağlayan aşiq,
Yeri var etməsə, ey şux, Kəbə içrə məqam.

Hədisi-rövzə bəyan eyləyirsən, ey vaiz,
Cəmali-yarıma bir bax, sözün miyani-kəlam,
Özünü bir gecə oxşatdı arizi-yarə,
Bu vəchdəndi ki, nöqsanə düşdü mahi-təmam..
Görüb üzarını zülfi-siyəh civarında,
Dedim səvadi-İrəmdir, bu ol Həvaliyi-Şam.
Yetişdi cənnəti-kuyinə axır ol hurün,
Qutardı Seyyid özün, vəssəlam, vəl-ikram!

Şərhi-zülfündə nə lazımdı ki, itnab eləyim,
Piçü tab olsa da könlümdə, gərək tab eləyim.
Cami-mey məzhəri-rüxsarın imiş, ey güli-tər,
Nə üçün mən dəxi bəs tərki-meyi-nab eləyim.
Bağı-qəm güllər açıb, indi cünunum dəmidir,
Göz yaşımdan gərək ol gülləri sirab eləyim.
Bülbül ağlar gecələr sübhə kimi bir gül üçün,
Quş gözündə yuxu yox, mən niyə bəs xab eləyim?
Əridər mum kimi daşı fəraqın, ey gül,
Mən necə atəşi-hicranuva bəs tab eləyim?
Yar bəzmində gərək tarə çəkib rişteyi-can,
Səfi-müjganımı bir-bir ona mizrab eləyim.
Seyyida, bu qəzəli-tazə-bəyanı yazıban,
Yeri vardır ki, əgər töhfeyi-əhbab eləyim.

Ey gül, sənə əvvəldə xəridar mən oldum,
Axır nəzərində hamıdan xar mən oldum.
Aldım səni can nəqdinə, ey Yusifi-sani,
Eşqində Züleyxayi-diləfkar mən oldum.
Eşqim məni əngüştnüma qıldı cahanə,
Ey qaşı hilalım, sənə ta yar mən oldum.

Verdim, sənəma, ayineyi-hüsnüvə seyqəl,
Aləmdə sənə rövnəqi-bazar mən oldum.
Bir Kəbə idin, hiç ziyarət edənin yox,
Gəldim, dolanıb başuva zəvvar mən oldum.
Sinayi-səri-kuyüvə gəldim «ərini» gu,
Ey nuri-xuda, talibi-didar mən oldum.
Hər bülhəvəsə indi nəsib oldu visalın,
Seyyid kimi hicranə giriftar mən oldum.

O gün olsun ki, səni məclisi-səhbadə görüm,
Genə dəstində qədəh, meylüvi minadə görüm
O gün olsun ki, səri-kuyüvə düşsün güzərim,
Özümü izzət ilə cənnəti-məvadə görüm.
Gecə baxmaq nə qədər ayinəyə şum isə də,
Tək üzün ayinəsin zülfi-şəb-asadə görüm.
Bu təmənnadəyəm, ey gül ki, şəhidin mən olum,
Ölərəm qeyrini gər mən bu təmənnadə görüm.
Səndən ötrü, nə qəmim, düşsə başım qovğayə,
Təki mən sağ olum, öz başımı qovğadə görüm.
Hər gün əğyarə nəsib oldu cəmalın, ey mah,
Olmadı bir gecə kim, mən səni röyadə görüm.
Məqsədim, şəşəeyi-mahi-cəmalındı sənin,
Xah məsciddə onu, xah kəlisadə görüm.
İki zülfün arasından görünə mehri-rüxün,
Genə ol əxtəri-rəxşəndəni Covzadə görüm.
Seyyida, doğranı narinc kimi bu dili-zar,
Əgər ol Yusifi mən bəzmi-Züleyxadə görüm.

Rəşki-ləbinlə badə içir xuni-dil müdam,
Hər ayda mahı röyəti-ruyin qılır təmam.
Qəmzən imamına elədim iqtida, vəli,
Bilmən səhihdirmi bu kim, məstdir imam.

Məzmuni-xətti-yarımı inkar edər fəqih,
Quranə bavər eyləməz ol, hasili-kəlam!
Mülki-cahanə nuri-xuda düşdü camdən,
Ta əksi-mahi-arizüvə məzhər oldu cam.
Əğyarı eşqə salmağa ol şuxi-dilfirib,
Qeyr ilə görcəgin mənə çox eylər ehtiram.
Həsrətdən axdı göz yaşımız döndü culərə,
Ey sərvi-naz, bəsdi dəxi, qıl bizə xüram.
Ey afitab, sənsiz olub qarə günlərim,
Ləli-ləbindən ayrı mənə badədir həram.
Seyyid haman qədimi olan bütpərəstdir,
Ey şeyx, inanma Kəbədə gər eyləsə məqam.

Saqi, mey ver, genə bir tazə günah istəyirəm,
Qara göz, nameyi-əmalı siyah istəyirəm.
Nədi xətdən bu hicabın, götür ol bürqəni kim,
Etməgə nameyi-əmalı təbah, istəyirəm.
Bikəsü dərbədərəm püştü pənahım yoxdur,
Özümə lütfi-xudavəndi pənah istəyirəm.
Asitanən itinə istəyirəm həmdəm olam,
Maşallah, nə gözəl rütbəvü cah istəyirəm!
Qərəzim xaki-dəri-yarə gədalıqdı mənim,
Mən gədazadəyə bax, rütbeyi-şah istəyirəm.
Mehrim artar sənə rüxsarüvə gəldikcə xətin,
Daim ol bağdə mən mehrü giyah istəyirəm.
Çağırın Qeys ilə Fərhadı yığılsın başıma,
Seyyidəm, ərseyi-eşq içrə sipah istəyirəm.

Canan yoluna verməgə mən can genə gəldim,
Bu Kəbə ara olmağa qurban genə gəldim.
Bir gəlmiş idim verməgə can, olmadı qismət,
Getdim dolanıb bir dəxi, ey can, genə gəldim.
Dərman dedilər dərdi-nihanimə dəhanın,

Yox yerdə sanıb dərdimə dərman, genə gəldim.
Yüz dəfə xəzan olmuş idi bağü baharım,
Bu bağı görüb, fəsli-gülüstan genə gəldim.
Aldım ələ payi-mələx-asa dilü canı,
Sandım ki, çıxıb təxtə Süleyman, genə gəldim.
Zülmətgədeyi-aləmə manəndi-Skəndər,
Sandım tapılır çeşmeyi-heyvan, genə gəldim.
Seyyid, neçə yol gəlmiş idim mülki-cahanə,
Səd şükr.tapıb surəti-insan, genə gəldim.

Neçə illər ki, müqimi-dəri-xəmmar oldum,
Gərçi biganə idim məhrəmi-əsrar oldum.
Möhkəm oldu qədəmim mərkəzi-meyxanədə ta,
Həlqeyi-aləmin ətrafına pərgar oldum.
Küfr imiş dəhrdə bir dinə müqəyyəd olmaq,
Tərki-ədyan elədim, axırı dindar oldum.
Səbhə bənd idi ələ, başıma bir əmmamə,
Bir əyağə satıb onları səbukbar oldum.
Xəlq derlər ki, olur məst içən badeyi-nab,
Billah, içdikcə onu mən dəxi huşyar oldum.
Özlügümdən məni ta bixəbər etdi saqi,
Haləti-zahidi-məkkarə xəbərdar oldum.
Şükrlər ki, gedibən piri-müğanə qul olub,
Mən də Seyyid kimi sərdəftəri-əhrar oldum.

Bağ içrə gəlib yarımı əğyar ilə gördüm,
Qan oldu könül kim, o gülü xar ilə gerdüm.
Eşq içrə mənə rövnəqi-bazar pozuldu,
Ol Yusifi bir qeyr xəridar ilə gördüm.
Viranə könül bir dəxi abad ola bilməz,
Kim, gənci-nihanımı bu gün mar ilə gördüm.
Peykanlarına eylədi könlümü nişanə,
Əltafını, əlhəq, bu dili-zar ilə gördüm.

Ol mahə qərin olmuş idi guşənişinlər,
Sabitləri ol kövkəbi-səyyar ilə gördüm.
Ey kaş olaydı bu təmaşadə gözüm kur,
Biganələri gülşən ara yar ilə gördüm.
Qönçə kimi könlüm dönəcək qanə ki,
Seyyid, ol novgülü bir özgə xəridar ilə gördüm.

Qaşuva eylərəm nəzər, fikri-hilalə düşmüşəm,
Eydi-vüsalın istərəm, meyli-cəmalə düşmüşəm.
Kövkəbi-bəxtimin kəsib rahını nəhs yulduzu,
Ey məhi-bədr, qıl nəzər, gör nə vəbalə düşmüşəm.
Gəlməli aftabımız, keçdi nahar nisfdən,
Gör ki mən, ey fələk, bu gün bir nə zəvalə düşmüşəm.
Dün demişəm dəhanüvi nöqtə, vəleyk, yox yerə
Nüktəşünaslər ara qilü məqalə düşmüşəm.
Dün olub özgə nəhv ilə ömr zəmani-mazidə,
Halıma indi hali ol, bil ki, nə halə düşmüşəm.
Aşiq olub dəhanüvə həlqeyi-«mim»ə dönmüşəm,
Zülfüvə iştiyaq ilə surəti-«dal»ə düşmüşəm.
Sirri-dəhani-yarı mən istəyirəm, şüur yox,
Sandım ədəm vücud olur, fikri-məhalə düşmüşəm.
Can verib almaq istərəm busə dəhani-yardən,
Bu yoxü vardən keçib, gör nə xəyalə düşmüşəm.
Mülki-cahanda, Seyyida, xatəmi-aşiqan mənəm,
Nöqteyi-əvvələm vəli, növbədə dalə düşmüşəm.

Xızr tək tutdu könül zülməti-zülfündə məqam,
Ta ki, ol abi- həyati-dəhənindən ala kam
Oldu müddətdi könül Kəbeyi-kuyində müqim,
Olmayıb hiç səfa əhlinə hasil bu məqam.
Xuni-Osmanı gətir xeyməyə sən, ey saqi,

Nə gərəkdir ki, Ömər qoydu təxəllüs Xəyyam.
Gör bu sövdazədəni tutdu o zülfi-siyəhi,
Elə bildim ki, Diməşq içrə mənəm valiyi-Şam.
Sənə, ey dust, bu xunabı həlal eyləmərəm,
Mənə qıldın bu gecə badeyi-gülgunu həram.
Saqiya, lazimədir baisi-xeyrə rəhmət,
Yadi-Cəmşid eləyib gəl içəlim bir neçə cam.
Şükr lillah ki, qutardı ələmi-nöqsanın,
Seyyida, gəldi bu şəhrə genə ol mahi-təmam.

Bir lalərüxi pirəhəni-al ilə gördüm,
Cadu gözünü hiylə ilə, al ilə gördüm.
Bir hal ilə söhbətdə gətirdi məni halə, :
Hal əhli imiş, mən o gülü hal ilə gördüm.
Rüxsarını gördüm səri-zülfi-siyəhində,
Mehdini həmağuş bu Dəccal ilə gördüm.
Şərhi-dəhənin müşgül edər əhli-dəqaiq,
Bir nöqteyi-mövhumu yüz əşkal ilə gördüm.
Düşmüşdü dalınca o məhin nəhs rəqibi,
Ol əxtəri-səyyarəni dünbal ilə gördüm.
Lalə açılıb, dağı mənə oldu nümayan,
Ya ol sənəmin arizini xal ilə gördüm?
Seyyid, yeri, məlum ki, hal əhli degilsən,
Dün şəb səni mən mədrəsədə qal ilə gördüm.

Yetdi rəqibi-şumun əli yarə, ağlaram,
Dəgdi dili-həzinimə yüz yarə, ağlaram.
Qan oldu qönçə tək dili-pürxunum, ey fələk,
Tapşırdım öz əlimlə gülü xarə, ağlaram.
Əfsürdə qıldı sərsəri-qəm novbaharımı,
Yetdi xəzan cəfası bu gülzarə, ağlaram.,

Gördüm rəqibi yar ilə bağ içrə həmnəfəs,
Bağ oldu düzəxim, yaxılıb narə, ağlaram.
Aldı əlinə şişeyi-badə o səngdil,
Minayi-qəlbim eylədi sədparə, ağlaram.
Sirri-dəhani-yarə yetirdi rəqib özün,
Sərbəstə vaqif oldu bu əsrarə, ağlaram.
Çəkdim cəfasını o gülün qönçəlikdə mən,
Açıldı, qismət oldu yetən xarə ağlaram.
Verdi o mah zülfünü biganə dəstinə,
Qıldı bu şəhrdə günümü qarə, ağlaram.
Bəxtim dönüb, evim yıxılıb, izzətim gedib,
Seyyid, o mah yar olub əğyarə, ağlaram.

Könül, səni o səri-kuyə məhrəm istəmənəm,
Büsati-eyşimi rəşk ilə dərhəm istəmənəm.
Degil bu rəşk mənə ixtiyari, məcburəm,
Behişt hurisini yarə həmdəm istəmənəm.
Gülab vurma yüzə, etmə göz yaşım cari,
Gözüm çıxar, o gül üstündə şəbnəm istəmənəm.
Anan veribdi sənə şir, mən cigər qanın,
Səni anandan, oğul, hiç mən kəm istəmənəm.
Bəlavü dərdü qəmin vermə özgəyə, mənə ver,
Özümdən özgəni aləmdə xürrəm istəmənəm.
Aparma Seyyidi bu suz ilə dəri-yarə,
Behişt rövzəsini mən cəhənnəm istəmənəm.

Seydi-dilə ol zülfi-girehgir nə lazım,
Bir seyd ki, qaçmaz, ona zəncir nə lazım.
Beyzayi-rüxün Qaziyi-Behzavi edər şərh,
Rövşəndi bu gün tək, buna təfsir nə lazım.
Gər qətl muradındı, sənə bəsdir o qəmzə,
Ey türki-cəfacu, dəxi şəmşir nə lazım.

Gəl vədeyi-qətlimdə mənim eyləmə təxir,
Öldüm, səni tari, belə təxir nə lazım.
Vaiz məni müslim bilibən eylədi təkfir,
Mən kafəri-eşqəm, mənə təkfir nə lazım.
Qoy eşqə qədəm, söylə «təvəkkəltü ələllah»[1]
Divanəsən, ey dil, sənə tədbir nə lazım.
Seyyid, nə həvəsdir genə bir yar sevirsən,
Bu eşqi-cəvani sənə, ey pir, nə lazım!

[istinad1:Allaha təvəkkül].

Xaki-rah oldum, o gülrüx güzər etməz, nə edim.
Xaksarinə o şəh bir nəzər etməz, nə edim.
Çəkirəm ah, rəqibə əsər etməz, səd ah
Dəri-dilbərdəi onu dərbədər etməz, nə edim.
Ləbi-dilbərdən alır kam ləbi-cam müdam,
Mən təki çərx onu xunincigər etməz, nə edim.
Giryələr etdi gözüm ta dili-dilbər ola nərm,
Səngi-xarayə bu baran əsər etməz, nə edim.
Qorxuram xirməni-hüsnün yaxa axır narə,
Bərqi-ahımdan o gülrüx həzər etməz, nə edim.

Əmərəm ləblərüvi ta nəfəsim var mənim,
Tutiyəm şəkkərə, ey gül, həvəsim var mənim.
Gəldi qanımı töküb yar qutarsın qəmdən,
Şükr lilləh ki, könül, dadrəsim var mənim.
Bənd-bəndim kəsələr eyləmənəm tərki-fəğan,
Qoy nəva ney tək edim ta nəfəsim var mənim.
Mürği-baği-mələkutəm qəfəsi-çərxə əsir,

Bu əcəb tənk olan gör qəfəsim var mənim.
Bikəsəm aləm ara, dərdü qəmindən özgə
Nə həvadarü nə yavər, nə kəsim var mənim.
Etmişəm gərçi bu dəm aləmi-nasuti vətən,
Ey könül, böylə degil, pişü pəsim var mənim.
Karvan getdi, könül, qafil edirsən nalə,
Dəmbədəm naləvü bangi-çərəsim var mənim.
Mövti-cismani ilə sanma mənim ölməgimi,
Seyyida, ölmənəm, aləmdə səsim var mənim.

Sanma kim, mən bişə içrə əcdəhadən titrərəm,
Cünbuşi-ol türreyi-əqrəbnümadən titrərəm.
Öylə kim, gül yaprağı titrər nəsimi-sübhdən,
Misli-bərgi-bid ol gülgunqəbadən titrərəm.
Vəh, nə mümkündür görüm ayineyi-rüxsarüvi,
Mən ki, bir simab tək şövqi-liqadən titrərəm.
Əndərunum zəhri-qəmlə səbz, birunumdur ağ,
Bir qovaq yaprağı tək əndək həvadən titrərəm.
Titrəşir ol növ kim, gərcək balıq sudə.ilan,
Göz yaşımda əksi-geysuyi-dütadən titrərəm.
Dərdi-hicran ol qədər etmiş zəif əndamımı,
Şaxi-gül tək cünbüşi-badi-səbadən titrərəm.
Qorxuram ki, xirməni-afaqı suzan eyləsin,
Bərqi-ahi-Seyyidi-bəxtiqəradən titrərəm.

Bir Leyli sevib eşqdə sövdalərə düşdüm.
Məcnunə dönüb daməni-səhralərə düşdüm.
Sövdayi-səri-zülfdə sərmayəmi verdim,
Sud eyləmədim, gör necə sövdalərə düşdüm.
Bir tifli-səğir aldı mənim əqlimi əldən,
Ey pir könül, gör qəmi-kübralərə düşdüm.
Hər canibə bax, bir büti-hərcayi görərsən,

Hər yerdə əcəb töhməti-bicalərə düşdüm.
Sənani olub, bir büti-tərsa tələbində
Hərdəm həvəsi-deyrü kəlisalərə düşdüm.
Şayəd gətirəm damənə ol dürri-yətimi,
Qəvvasə dönüb eşqlə dəryalərə düşdüm.
Ta ki, bir əlin öpmək üçün piri-müğanın
Saqinin əyağından öpüb palərə düşdüm.
Əksi-rüxüvü sağəri-səbhadə görən dəm,
Bitab oluban özgə təmənnalərə düşdüm.
Bildi məni nadan, elədi pənd xəlayiq,
Səd şükr ki, Seyyid, dili-danalərə düşdüm.

Vəslində idim möhnəti-hicranı bilirdim,
Cənnətdə ikən atəşi-niyranı bilirdim.
Qafil o səri-zülfüvə dil vermədim, ey gül,
Əlbəttə ki, bu hali-pərişanı bilirdim.
Hərçənd ki, bimar gözün xəstəsi oldum,
Mən olmayacaq dərdimə dərmanı bilirdim.
Vəslində əgərçi neçə gün şad idim, ey məh,
Mən kineyi-bu gərdişi-dövranı bilirdim.
Ol gün ki, qədəm şövq ilə bu gülşənə qoydum,
Mən sərzənişi-xari-müğilanı bilirdim.
Müşgüldü dəxi aqibəti-kar ola məhmud,
Ağazdə bu möhnəti-payanı bilirdim.
Ol gün ki, dilə düşdü sənin şövqi-dəhanın,
Mən onda olan nükteyi-pinhanı bilirdim.
Zülfün anıban sureyi-«Vəlleyl» oxuyurdum,
Mən hər gecə bu məniyi-quranı bilirdim.
Yadə salıban ruyüvi «Vəşşəms» oxurdum,
Keyfiyyəti-xurşidi-dirəxşanı bilirdim
Mən bilməz idim sureyi-ixlasdan özgə,
Tövhidi-xudavənddə mənanı bilirdim.
Seyyid, bu qəzəl mətləin etdikdə sən inşa,
Zimnində olan rəmzi, -müəmmanı bilirdim.

Ta kuyi-yardə özümə mənzil etmişəm,
Asan ikən özüm işimi müşkül etmişəm,
Bir qətrə qan oğurlamışam tiği-yardən,
Sinəmdə vermişəm yer, adın mən dil etmişəm.
Verdim qəmində xirməni-ömrümü badə mən,
Pərvanə tək o xalını mən hasil etmişəm.
Dün gecə şürbi-badəni mən tövbə eylədim,
Saqi, bağışla, səndən işi qafil etmişəm.
Zülfi-siyahi-yar xəyalilə, zahida,
Təsbih qəsdinə özümü mail etmişəm.
Sərməstlikdə söyləmişəm mey həramdır,
Hökmi-xətadı bu, əməli-batil etmişəm.
Seyyid, cahanda kəsrət ilə yox rücuumuz
Kim, bəhri-vəhdətə özümü vasil etmişəm.

Yazıb dərdi-dili-pürxunumu dildarə göndərdim,
Şikəstə bülbülün əhvalını gülzarə göndərdim.
Zəbani-ərzi-halə cürətim yox, rubəru olsam,
Bu üzdən səbt edib dərdi-dilim-tumarə göndərdim.
Mürəkkəb içrə həl qıldım səvadi-çeşmi-xunbarı,
Yazıb bir nameyi-şövq, ol gözü xummarə göndərdim.
Gedib əğyar ilə ol mahrüx seyri-gülüstanə,
Töküb irmaqə sabit əşkim, ol səyyarə göndərdim.
O kuyin itlərinə nəzr etmişdim dili-zarı,
Yetib,məqsuduma, hər bir itə bir parə göndərdim.
Fərağı yarələr kim, sineyi-məcruha vurmuşdu,
Qopardıb pənbəsin ol yarə üstən yarə göndərdim.
Mənə meydən geçən gün tövbə verdi şeyx, ey Seyyid,
Bu gün mən də alıb mey şeyx üçün kəffarə göndərdim.

Ey könül, sərvi-səməndə sən idin, ya mən idim?
Yar ilə seyri-çəməndə sən idin, ya mən idim?

Cilveyi-nazdə ol şahsüvarı görcək,
Yıxılan payi-səməndə sən idin, ya mən idim?
Zülfi-tarini qılan boynuva zənciri-cünun,
Olmayan tarıya bəndə sən idin, ya mən idim?
Gəh sənə yümni-yəmin var idi, gəh yüsri-yəsar.
Ləli zövqilə Yəməndə sən idin, ya mən idim?
Hüsni-rüxsarına kam ilə qılan nəzzarə,
Dövləti-vəchi-həsəndə sən idin, ya mən idim?
Zülməti-xətlə görən tirə üzari-mahın,
Yüz qəra günlə vətəndə sən idin, ya mən idim?
Seyyida, şeri-gühərbar edərdin xahiş,
Talibi-dürr Ədəndə sən idin, ya mən idim?

Zəmani-mərg rüxsarın görüb məhvi-cəmal oldum,
Əgərçi əhli-iymanəm, ölən halətdə lal oldum.
Başımdan çıxmadı sevdayi-zülfün, çıxdı can təndən,
Qara günlərlə piçidə, əcəb aşüftəhal oldum!
Çü tutdu pənceyi-rüxsari-yarı xətti-müşkini,
Ötüb, nisfün-nəharı şəms «min-vəqti-zəval» oldum.
Dedim sorram ləbindən dərdimi, gördükdə dildarı,
Fəğan kim, görcəgin nitqim tutuldu, bisual oldum.
Hanı məndə o taqət kim, öpüm ləlin, verim canı,
Xəyalımdan xütur etmək bu sövdanı məhal oldum.
Mən ol muri-zəifəm kim, əlim yetməz Süleymanə,
Qalıb bu vadiyi-möhnətfəzadə payimal oldum.
Mənim də var imiş eşqimdə nöqsan, ey qəmərtələt,
Vəbali-hicrə Seyyid kimi düşdüm, bikəmal oldum.

Düşdükcə yadıma o səhiqamət, ağlaram,
Ey məh, qiyamətə kimi hər saət ağlaram.
Suzi-dərunə göz yaşı çün intifa verir,

Şayəd ki, könlümə yetə bir behcət, ağlaram
Derlər ki, ağlama mənə hicrani-yardən,
Eşqim bu pənddən eləyir şiddət, ağlaram.
Əzbəs ki, ağlayanda mənə tən edər rəqib,
Pinhan olub qara gecələr xəlvət ağlaram.
Əbr ağlayanda xəndə edər qönçeyi-çəmən,
Şayəd ki, xəndə eyləyə ol afət, ağlaram.
Bir əhli-hal tapmadım aləmdə, ey könül,
Şamü səhər bu halətə bihalət ağlaram.
Bu göz mənim, təranə mənim, suzi-dil mənim,
Bilməm ki, hiç xəlqə nədir hacət, ağlaram.
Seyyid bu qəmdə ağlamasa var taqəti,
Məndə dəxi bu möhnətə yox taqət, ağlaram.

Səndən ötrü neçə müddətdi məlamət çəkirəm,
Tiflsən, sən nə bilirsən ki, nə möhnət çəkirəm.
Çərxi-dəvvar ilə yerdən gögə vardır fərqim,
O çəkə bilmədi, mən bari-əmanət çəkirəm.
İstəməzsən, dedim, ey mah, qübari-qədəmin?
Dedi: rövşəndi bu, yerdən gögə minnət çəkirəm.
Pərdeyi çeşmimə mümkündü çəkəm surətüvi, .
Mərdümi-didə rüxün görməgə qeyrət çəkirəm.
Etdi ayineyi-rüxsarüvi axır tirə,
Çəkdigim ahlərə indi xəcalət çəkirəm.
Yar olub özgələrə yar, çəkir zövqü səfa,
Düşmüşəm mən quru böhtanlara töhmət çəkirəm.
Dedilər öldürəcək yar səni, ey Seyyid,
Tarı şahiddi ki, bu xeyr işə həsrət çəkirəm.

Əsiri-dərdü qəmi-hicri-canşikar oldum,

Nədən ki, qorxur idim mən ona düçar oldum.
O gülüzardən axır məni ayırdı fələk,
Baharım oldu xəzan, mübtəlayi-xar oldum.
Olubdu təhti-fələk təng beytül-əhzanım,
Fəraqi-Yusif ilə xakü xaksar oldum.
Dönüb kənarələrim rudi-Nilə əşkimdən,
O vəqtdən ki, mən ol mahdən kənar oldum.
Ayırdı Yusifi məndən bəradərani-qəyur,
Bəlayi-hicrdə mən zarü biqərar oldum.
Nə cürm etmiş idim, ey xudayi-pakü əhəd,
Yanıb fəraq oduna mən əsiri-nar oldum.
Yeriydi yaxsa məni çərx narə, ey Seyyid,
Ki bivəfalərə mən çün ümidvar oldum.

Alanda dəstinə ol şuxi-gülüzar qələm,
Əlindən olmağını istəməz kənar qələm.
Qələm özü Xütən ahusudur və yainkim,
Həvayi-zülfü ilə oldu müşkbar qələm.
Öpərdim əllərini ol qələmqaşın mən də,
Məni edəydi əgər xəlq kirdgar qələm.
Dəhanı ilə qələm başın etdi pak o gül,
Yetişdi çeşmeyi-heyvanə Xızrvar qələm.
İki dil açdı ki, vəsf eyləsin o gülbədəni,
Fəzilətü hünərin etdi aşkar qələm.
Kəsəydi başımı tiği-cəfa ilə hər dəm,
Xəyal edəydi məni kaş ol nigar, qələm.
Qaşını çəkməgə əsbab olmasa, Seyyid,
Əzəldə etməz idi xəlq kirdgar qələm.

Ləbi-ləlin həvəsin, munisi-can eyləmənəm,
Salmanam gövhəri xak içrə, nihan eyləmənəm

Bilmənəm sud özümə çarsuyi-aləmdə,
Hansı bir sudi ki, eşqində ziyan eyləmənəm.
Ləbi-ləlinlə ki, bir sirri-nihanım var idi,
Gedərəm xakə mən ol sirri bəyan eyləmənəm.
Qanımı tökdü ləbin, dişlədim axdı qanı,
Elə bildin, sənəma, qanıma qan eyləmənəm.
Qorxuram yatmayalar itləri fəryadımdan,
Gecələr mən dəxi ol kudə fəğan eyləmənəm.
Sirri var, annamışam, yoxdu dəhanından əsər,
Mən yəqin əhliyəm, əlbəttə güman eyləmənəm.
Hansı bir fəsldi kim, ey güli-rəna, sən üçün
Gezümü əbr kimi əşkfəşan eyləmənəm.
Hansı bir sərvdi kim, qamətüvün yadı ilə
Qoparıb əşkim ilə, suya rəvan eyləmənəm.
Seyyida, bəsdi dilə eşqi-xudavəndi-əhəd,
Meyli-xubani-dilazari-cahan eyləmənəm.

Özümlə olsa idi, mən cahanə gəlməz idim,
Gətirdilər məni, amma mən anə gəlməz idim.
Bu dami-eşqə məni saldı daneji-xalın,
Firib verməsə idi o danə, gəlməz idim.
Görünməsəjdi əgər hər məkanda nuri-rüxün,
Fəzaji-qüdsü qojub, bu məkanə gəlməz idim.
Dəhani-jardən olsajdı bir əsər zahir,
Jəqini tərk qılıb, mən gümana gəlməz idim.
Qədimi ejlər idim dərd ilə qəmində kəman,
Xədəngi-çeşmüvə, bilsəm, nişanə gəlməz idim.
Bəhanə ilə jetərmiş vüsalə aşiqlər,
Və gər biləjdim onu, bibəhanə gəlməz idim.
Olajdı zatım əzəldən əgər zəri-xalis,
Janıb bu butə ara imtahanə gəlməz idim.
Bu zövqdən.eləmə, bağban, məii məjus, .
Gülüm olajdı əgər, gülsitanə gəlməz idim.
Könüldə zəxmi-nihan olmasajdı, ej Sejjid,
Ümidi-mərhəm ilə mən fəğanə gəlməz idim.

Əzəldən çünki mən mejxareji-bəzmi-ələst oldum,
İçib vəhdət şərabından belə məxmurü məst oldum.
Zibəs ki, jağdı daşlar başıma bu çərxi-minadən,
Dürüst ikən pozuldum, sağəri-mej tək şikəst oldum.
Təcəllaji-cəmalın məscidü mejxanədə gördüm,
Gəhi məsciddə abid, dejrdə gəh bütpərəst oldum.
Əjağ aldım ələ, başıma çəkdim naz ilə sağər,
Ajağın sədqəsi, saqi, ki mən bipavü dəst oldum.
Nişimən etmiş ikən qafi-üzlət üzrə ənqa tək,
Həvaji-daneji-xalınla damə pajbəst oldum.
Ədəm məmurəsində rahət ikən ejni-vəhdətlə,
Düşüb ejni-zəvalə aləmi-kəsrətdə həst oldum.
Zijai-şəms tək düşdüm o kuji-dilbərə, Sejjid,
Jetişdim rütbeji-üljajə, fikr etmə ki, pəst oldum

Vaiz əsrari-ləbi-dildarı bilməz, bilmişəm,
İçməyən, zövqi-meyi-gülnarı bilməz, bilmişəm.
«X»-ai rüxsarı bilibdir, «b»-ai-bismillah fəqih,
Nöqteyi-«ba»də olan əsrarı bilməz bilmişəm,
Zahidin halın əgər kim, bilməyəm eybim degil,
Məst olanlar haləti-huşyarı bilməz, bilmişəm.
Kim ki, bir müddət mənim tək yarə həsrət qalmayıb,
Zövqi-vəslü dövləti-didarı  bilməz, bilmişəm.
Olmayan aşiq nə bilsin əhli-eşqin halını,
Cövri-yarü təneyi-əğyarı bilməz, bilmişəm.
Olmayan tari-səri-zülfi-siyahında əsir,
Piçü tabi-türreyi-.tərrarı bilməz, bilmişəm.
Olmayan bülbül kimi bir güldən ötrü xuncigər,
Seyyida, cövrü cəfayi-xarı bilməz, bilmişəm.

Həsrət idim o hilaləbruya bir mah təmam,
Şükr lillah ki, gəlib şəhrə bu gün tutdu məqam.
Haşəlillah, degiləm badeyi-nabə mötad,
Hicri-ləlində mənə vacib olur şürbi-müdam.
Könlümə sən girəni özgələr oldu xaric,
Ey həbibim, elədin Kəbədə kəsri-əsnam.
O müqəvvəs qaşuvi vəsmədən etmə rəngin,
Zülfüqari-Əsədullahə nə lazımdı niyam.
Xət pozub rövnəqi-hüsnünü, dedim, ram olur,
Xət gəlib vəhşati artdı, o qəzal olmadı ram.
Üzüvə baxsa gözüm şamü səhər, vəchi budur,
Nəm olan pərdəni sərmək günə vacibdi müdam
Seyyida, lalələr aldı ələ mərcani qədəh,
Ruhi-Cəmşidi edək şad, içək bir neçə cam

Cavanlar gəldi dünyayə, qocaldım, heyf, pir oldum,
Qüvalər düşdü qüvvətdən, yaman yerdə fəqir oldum.
Yetişdi əlliyə yaşım, tökər su çeşmi-xunpaşım,
Ağardı bərf tək başım, dönüb bir zəmhərir oldum.
Kəbir olmuş bilirdim mən özümü, əqlü fəhmim gör,
Giriftari-kəməndi-türreyi-tifli-səğir  oldum.
Cünun mülkündə sultan Qeys idi, ol getdi dünyadən,
Məni naibmənab etdi, yerində mən əmir oldum.
Füzun olsun cəlali-eşq kim, asari-yümnindən
Əgərçi mur idim mən bişeyi-aləmdə şir oldum.
Nişimən astani-yarı etdim aqibət, ey dil,
Bihəmdilləh kim, axır ömrdə sahibsərir oldum.
Əyağ aldım əlindən saqiyi-gülçöhrənin, Seyyid,
Çəkib başə, ayaqdan düşdüm, axır dəstgir oldum.

Bu gecə bir məh ilə ovci-Sürəyyadə idim,

Vəsli-meracı ilə ərşi-müəllladə idim.
Yuxu əhvalı gəlir indi mənə şami-visal,
Haləti-ləfzədə, ya bu gecə röyadə idim.
Ləbi-camə yetişirdi, ləbi-ləli o gülün,
Mən ləbi-camı öpüb özgə təmənnadə idim.
Sağərim cami-qəvarir, şərabım kövsər,
Həmdəmim hur, özüm cənnəti-məvadə idim.
Yar açmışdı lətafətlə bu şəb sinəsini,
Qərqi-nur olmuş idim, sineyi-Sinadə idim.
Nəqşdən pey aparırdım bu gecə nəqqaşə,
Seyri-qüdrət eləyib özgə tamaşadə idim.
Həlqeyi-zülfdə rüxsari-münirin görübən,
Naziri-mahi-münəvvər şəbi-yeldadə idim.
Dəhənin açmağa ol yar qılırdım tədbir,
Sübh olunca həvəsi-kəşfi-müəmmadə idim.
Çox baxırdım dəhəni yarə, nihani, hərdəm,
Çareyi-fikri-dili-Seyyidi-dildadə idim.

Gördüm ki, gəlir təngə nigarım, səfər etdim,
Sevdalərə saldım başımı, tərki-sər etdim.
Asudə ola bir neçə gün nazlı nigarım,
Əlmas basıb bağrıma vəzi-nəzər etdim.
Avarə düşüb cənnəti-kuyindən o hurün,
Öz mənzilimi göz görə nari-səqər etdim.
Çox müşkül idi keçməgim ol cənnəti-kudən,.
Canımı tutub gör dişə, ey dil, cigər etdim.
Ta olmaya qeyrin gözünə sürmeyi-rövşən,
Xaki-səri-kuyinə töküb əşk, tər etdim.
Çox gecələri zəmzəmeyi-yar ilə, ey dil,
Guşi-fələki-şöbədəpərdazı gər etdim.
İncitdi fəğanım gecələr əhli-diyarı,
Ta bir neçə gün əzmi-diyari-digər etdim.
Verdim dilü can nəqdini, aldım qəmi-eşqi,
Fikr etmə bu sevdadə ki, Seyyid, zərər etdim.

Ey nuri-səmavatü zəmin, gərçi nihansan,
Amma nəzəri-arifü danadə əyansan.
Batin gözünün yox səni görməkdə qüsuri,
Zahir gözü görməz səni, əlbəttə, nihansan.
Zatın eləyib cümleyi-əşyadə təcəlla,
Musa gözünə turi-həqiqətdə əyansan.
Bir Adəmü İsadə degil nəfxeyi-ruhun,
Aləm hamı qalibdi, sən ol qalibə cansan.
Kəssən nəzəri-feyzüvi bir ləhzə cahandan,
Nabud olur aləm, sən ona ruhi-rəvansan.
Gəh badi-səba tək verisən [1] gülşənə rövnəq,
Gəh soldurusan [2] gülləri, sən badi-xəzansan.
Sən qaimi-bizzatsən, aləm hamı bilğeyr,
Xəllaqi-səmavatü zəmin, kövnü məkansan.
Minbir adının hər biri bir aşiqə munis,
Tapmaz səni bir kəs, genə binamü nişansan.
Ey Seyyidi-pir, eylə meyi-vəhdətə rəğbət,
İstərsən əgər olmağa həmvarə cavan, sən?

[İstinad1: Verirsən]
[İstinad 2: Soldurursan]

Əyan gözlə baxan şəxsə nihansan,
Nihan gözlə baxan zatə əyansan.
Desəm pinhansən, hər yan əyansan,
Desəm ki, mən əyansən, yox nihansan.
Münəvvər etmisən cümlə cahanı,
Məgər sən afitabi-asimansan?
Özün həm rahsən, həm rahzənsən,
Özün həm düzdsən, həm pasibansan.

Adındır-zərrü nafe, ey nigarım,
Gəhi üşşaqə sudü gəh ziyansan.
Səninləndir xəzanım, həm baharım,
Vəli sən nə baharü nə xəzansan.
Yelə verdin şəmimi-tari-zülfün,
Nəsimi eylədin ənbərfəşan sən.
Sən oldun Seyyidin lütfündə zahir,
Əyan oldun ki, sən gənci-nihansan.

Əhli-təqvanın əgər məscidi bərbad olsun,
Nə qəm ondan, təki meyxanələr, abad olsun.
Tövbə sındırmağıma şeyx məlul olsa əgər,
Piri-meyxanə bu işdən təki dilşad olsun.
Etdi bir cam ilə təmir dili-viranı,
Meyfüruşun ki, görüm xanəsi abad olsun.
Türreyi-dilbər ilə nəğmeyi-məstanə bizim,
Zahidin məşğələsi səbhəvü övrad olsun.
Şəhrdə bağlı qoyubdur dəri-meyxanələri,
Vaizin, bari-xudaya, evi bərbad olsun.
Seyyidin badəni tərk etməməgin eyb eləmin,
Tərki müşkildi onun, kimsə ki, mötad olsun.

Hanı bir kəs ki, yetirsin mənə canan xəbərin,
Söyləsin bülbül üçün bağü gülüstan xəbərin.
Ey səba, ey sənə bu ruhi-rəvanım qurban,
Qümriyi-zarə gətir sərvi-xuraman xəbərin.
Zülməti-qəmdə Skəndər kimi qaldım heyran,
Yetir ey Xızr, mənə çeşmeyi-heyvan xəbərin.
Ey kəbutər, aparıb nameyi-dərdi-dilimi,
Həm məni-zarə gətir ol məhi-taban xəbərin.
Hanı bir qasidi-Fərrüxsiyərü İsadəm--
Ki, yetirsin təni-biruhumuza can xəbərin.

Cani-şirin mənə təlx oldu qəmi-hicrandan,
Vermədi kimsənə ol xosrovi-xuban xəbərin.
Seyyida, canımı nəzr etmişəm ol qasidə kim,
Verə mən aşiqi-dilxəstəyə canan xəbərin*.

Qəzəl Soltan Çənginin bir qəzəlinə cavabdır.

Olub nərgislərin dövründə əhli-eşq bimarın,
Qidası xuni-dildir, laləruyim, aşiqi-zarın.
Fəraqə dözməyib, ey mahru, tərki-vətən etdim,
Ümidi-dövləti-didar ilə oldum tələbkarın.
Həbibim, sən bu gün ol Kəbeyi-hüsni-səfasən kim,
Güruhi-qüdsiyandır aləmi-baladə zəvvarın.
Gərəkdir mövci-xara bilsin, ey məh, mövci-dəryanı
O kəs kim, talibidir sən kimi bir dürri-şəhvarın.
Xoş ol bimarlıq kim, Seyyida, qürbət diyarında
Təbibi-sübhü şamın yar idi, dövlət pərəstarın.

Hər nə əğyar dedisə sənə, bavər .qıldın,
Ta o gündən məni-biyarı mükəddər qıldın.
Həvəsi-silsileyi-zülfü rüxündən, ey mah,
Günümü aləm ara şamə bərabər qıldın.
Bəs demişdin gecələr çıxmaram, ey mah, neçin
Çıxıban mənzili-əğyarı münəvvər qıldın?
Mey içib qeyr ilə, rüxsari-ərəqnakın açıb,
Bəzmi-əğyarə rüxi-aluvu zivər qıldın.
Nuş badə ləbi-şirinüvi açdın, ey gül,
Meyi-təlxi dəhəni-qeyrdə şəkkər qıldın.
Etməyib aşiqinə hiç sitəmkər, billah,
O sitəmlər ki, mənə sən büti-kafər qıldın.
Görüm, ey Seyyidi-sərgəştə, səni lal olasan,
Nə dedin ki, genə dildarı mükəddər qıldın?

Gər istəsən ki, xəstə könül qanə dönməsin,
Ləli-ləbin sarı dəxi peymanə dönməsin.
Bülbül tək istəsən ki, əgər etməyim xüruş,
Meydən üzün fəzayi-gülüstanə dönməsin.
Dönsün, dağılsın aləmin, ey gül, binaları,
Tək şişə sınmasın, xümi-meyxanə dönməsin.
Saqi, əlim əsir, mənə çox vermə cam kim,
Badəm dağılmasın yerə, peymanə dönməsin.
Mən oldum, ey rəfiq, pərişan o zülfdən,
Ya rəb, sənin günün bu pərişanə dönməsin.
Aç zülfi-müşkfamuvu, göstər cəmalüvi,
Ta dövri-şəmə hər gecə pərvanə dönməsin.
Çəkmə o tari-türreyi-ənbərfəşanuva
Bu çak-çak könlümə ta şanə dönməsin.
Əhd etdi dil ki, bağlana zənciri-zülfüvə, .
Bu əhddən, ilahi, o divanə dönməsin.
Seyyid, görəndə yarı düşürsən ayağına,
Görcəg səni o şux necə yanə dönməsin?

Ey könül, bos vəsli-yarə noldu tədbirin sənin,
Yoxmu, ey fəryadü ahım, yarə təsirnn sənin?
Gövhəri-əşkim kimi düşdün nəzərdən aqibət,
Noldu, ey miskin könül, bir söylə təqsirin sənin?
Navəki-dilduzuva qoy canımız olsun fəda,
Etməsin tək, ey kəmanəbru, xəta tirin sənin.
Ol cavanı məst qıldın məclisi-əğyardə,
Xəsm ola, ya rəb, görüm, saqi, sənə pirin sənin.
Ey mələkxu, vədeyi-qətlimdə ehmal etmə kim,
Seyyidi tez öldürür, billah, bu təxirin sənin,

Bildin gəlirəm hər yerə getsən, səfər etdin,
Aşiqligimi şöhreyi-hər bumü bər etdin.
Verdin xəbərin getməgüvün, getdim özümdən,
Ta ruzi-vidaində məni bixəbər etdin.
Olmuş genə məcruh o gülün arizi-alı,
Ey didə, məgər sən rüxi-yarə nəzər etdin?
Etdin cigərim yarə, günüm qarə cəfadən,
Ey mah, bilirsənmi ki, sən bir nələr etdin?
Ey lalərux, aldın ələ qeyr ilə piyalə,
Dağ eyləyibən aşiqi xunincigər etdin.
Tulani şikayətlər edərdin bizə, Seyyid,
Bəs ol şəhi görcək nə üçün müxtəsər etdin?

Binayi-zöhdümü mey seyli birlə abə verin,
Satın bu xirqəvü səccadəmi şərabə verin.
Gəlin, bir eyləyin, ey badəxarlər, himmət,
Bu çərxi-pürsitəmin dövrün inqilabə verin,
Xərab olum, qutarım ta zəmanə dövründən,
Bir-iki cam məni-xanimanxərabə verin.
Görün ki, aqibətül-əmr kim olur məğbun,
Bu nəqdi-canı meyə, zahidi kitabə verin.
Vəsiyyətim budu, Seyyid, vəfatım olduqda,
Nə qalsa məndən, onu vəqf edin, şərabə verin.

Düşə gər sayəsi kuyindəki divarə dildarın,
Çıxar çərxə həsəddən bərqi-ahı aşiqi-zarın..
Bilibdir fərz özünə astanən səcdəsin xurşid,

O gündən kim, olubdur aşiqi xurşidi-rüxsarın.
Desəm Yusifdən artıqsan, degil böhtan ki, eşq əhli
Cəmad ilə onun oldu, sənin canla xəridarın.
Səri-küyündə, ey gül, göz yaşımdan olma rəncidə,
Səfasın artırır barani-rəhmət bağü gülzarın.
Dili-bimar çeşmindən dəva istər, vəli bilməz
Ki, olmaz bir əlacı dəhrdə bimarə bimarın.
Həbibim adını zikr etməyib mehrabi-taətdə
Yəqindir, zahida, yox gəlmeyi-tovhidə iqrarın.
Xəyali-şəmi-rüxsar ilə çəkdin ahlər, Seyyid,
Bihəmdillah kim, rövşəndir aləmdə şəbi-tarın.

Dözməyib hicrə, könül, hər gecə fəryad etdin,
Axır ol mahı mənim qətlimə cəllad etdin.
Zülfi-müşkininə dil verdin, o, qanın tökdü,
Bu xəta düşdü özündən, mənə isnad etdin.
İltifat eylədin əvvəl mənə şirin-şirin,
Axır eşqində məni aləmə Fərhad etdin.
Yox idi aşiqi-şeyda ürəgin qan etmək,
Bunu da xublar arasında sən iycad etdin.
Seyyidi-süxtəni atəşi-naz ilə yaxıb,
Şəmi pərvanəni yandırmağa mötad etdin.

Neyləyim, məclis ara olsa da əğyar, olsun,
Tək o güldən mənə bir fürsəti-didar olsun.
Qayəti-şövqimi gör yarə ki, həngami-vida
Rəşkdən mən deyə bilməm ki, xuda yar olsun.
Hanı, ey ruhi-rəvan, qeyrəti-məşuqəligin,
Qoyma kim, qeyr məni-zarə xəridar olsun.
Bir əyağ ilə mənim könlümü aldın ələ sən,
Görüm, ey saqiyi-gülçöhrə, əlin var olsun!
Taki, sərməstdir eşq əhlinə lütf eylər yar,

Saqiya, qoyma o bimehri ki, huşyar olsun.
Ürəgim qanə dönüb, qüvvəti-təqririm yox,
Yoxdur əhvalıma bir kəs ki, xəbərdar olsun.
Bunca kim silsileyi-zülfüvü istər, Seyyid,
Görüm ol damdə bundan da giriftar olsun.

Vaiz bu qədər zəmmini etməzdi şərabın,
Bir bilsə idi ləzzətini badeji-nabın.
Mejxarələrin halına dəxl ejləməsəjdin
Zahid, səni cənnətlik edərdi bu səvabın.
Şərbət içibən bəzmdə şirinlik olur kam,
Vəsl aləmidir aqibəti bu şəkərabın.
Ej cam, gəlir nəkhəti-cənnət nəfəsindən,
Adəm gətirib jer üzünə, joxsa, türabın.
Ol mah bizə vədeji-təşrif edib axır,
Ej didə, gəlir əvvəli-şəbdən nijə xabın?
Hüsnün olub ol səbzeji-xətdən dəxi ziba,
Ej mahi-pəriçöhrə, nədəndir bu hicabın?
Gər piri-müğan tutsa əlimdən, nola, zahid,
Bir çakəri-dirinidi Sejjid o cənabın.

Bəs ki, ej dil, həvəsi-zülfi-girehgir etdin,
Axır ol zülfü mənim bojnuma zəncir etdin.
Ej könül, mən ki görüb jarı ajaqdan düşdüm,
De görüm öz qəmini sən neçə təqrir etdin?
Arizi-jarımı, ej sanei-afaq, məgər
Qərü ənbiqi-məhü mehr ilə təqtir etdin?
Ejlədin vədə ki, vəslin günü qanım tökəsən,
Ej olum vədənə qurban, nijə təxir etdin?
Baisi-nar dedin mehri-rüxin, ej vaiz,
Gör behişt ajəsini.sən nəjə təfsir etdin?

Verdi dil ol sənəmin küfr səri-zülfündən,
Zahida, sən nijə ancaq məni təkfir etdin?
Səni ol gözləri xunxar salıbdır gözdən,
Genə, ej Sejjidi-biçarə, nə təqsir etdin?

Təsiri-eşqin oldu dilə kargər sənin,
Eşqində çəkdim, ey güli-rəna, nələr sənin.
Üşşaq bağrını sitəmin qanə döndərib,
Könlündə yoxdu rəhmü mürüvvət məgər sənin?
Dil şişəsin əfa ilə sədparə eylədin,
Daşdırmı könlün, ey büti-bidadgər, sənin?
Bais nə oldu, ey güli rəna ki, görmürəm
Əvvəlki iltifatlarından əsər sənin?
Ey kakilin fədası olum, görməgə yüzün
Sərgəştənəm zəmanədə şamü səhər sənin.
Xurşidi-asiman gözünə tutiya üçün
Verməz türabi-məqdəmin əhli-nəzər sənin.
Seyyid, bu halə şükrlər et, ta ki, olmaya
Bundan da, ruzgardə, halın bətər sənin.

Çəkmişdi qətlim etməyə yüz tir, gözlərin,
Zalım, nə oldu eylədi təxir, gözlərin?
Məst idi, aldı xameyi-müjganı dəstinə,
Fitvayi-qətlim eylədi təhrir, gözlərin.
Seydi-hərəm həramdır, ey qibleyi-Səfa,
Ahu şikarın etdi genə şir gözlərin.
Qaşınla qətlim etməgə peyvəst oldular
Əgrilər ilə eylədi tədbir, gözlərin.
Zalım, diyari-eşqə Hülakuyi-tazasən,
Olmaz bu qanlar içmək ilə sir gözlərin.
Geysulər içrə etdi kəmin türki-məst tək,

Şəbxunlar etdi könlümə şəbgir gözlərin.
Etdin kəməndi-zülfüvü pürtab, ey pəri,
Seyyid tək eylədi məni nəxcir gözlərin.

Ya rəb, kim olur ərzimi cananə yetirsin,
Dərdi-dilim ol xosrovi-xubanə yetirsin.
Xurşidə desin, zərreyi-sərgəştə məlalın,
Pərvanə sözün şəmi-şəbistanə yetirsin.
Cəmiyyəti-dil kəsrəti-qəmdəndi pərişan,
Bu halı o geysuyi-pərişanə yetirsin.
Bu mürği-giriftari-qəfəs surəti-halın,
Ol qönçeyi-novxizi-gülüstanə yetirsin.
Məndən yetirib ol şəhə əcz ilə dualər;
Xaki-qədəmin dideyi-giryanə yetirsin.
Hər şamü səhər virdi budur Seyyidi-zarın,
Allah səni bir də bu Şirvanə yetirsin.

Müyəssər olsa əgər tovfi-kuyi cananın,
Dəxi nə minnəti var Kəbədən dilü canın?
Hənuz vəsldir, ey mah, yoxdur aramım,
Nə növ bəs keçəcək mən fəqirə hicranın?
Xəlil xanəsinin neylirəm ziyarətini,
Çevir məni başuva, ey gül, eylə qurbanın.
Fəda olum sənə, ey Kəbeyi-məhəbbət kim,
Hərirdən mənə xoştər gəlir müğilanın.
Bir-iki gün ki, sənə, ey nigar, mehmanəm,
Nolur əgər tutasan hörmətin bu mehmanın?
Cəza günü olusan sürxruy, ey Seyyid,
Əgər bu gün tökülə kuyi-yardə qanın.

Ta könül, meyli-səri-zülfi-siyəhtar-eylədin,
Ruzgarım etdin aşüftə, günüm tar eylədin.
Ol dəhanın varlığın insar eylərdi həkim,
Naz ilə göftarə gəldin, sən yoxu var eylədin.
Dideyi-bülbüldə xar oldu gül, ey sərvi-səhi,
Ta açıb rüxsarüvi sən seyri-gülzar eylədin.
Qönçə həsrətdən qalıb ağzı açılmış bağdə,
Ta açıb dürci-dəhən bağ içrə göftar eylədin.
Göstərib rüxsarüvi göftarə gəldin ta ki, sən
Bülbülü eşqində şərməndə, gülü xar eylədin.
Düşmüşəm nöqsanə, etdin mahımı məndən cüda,
Sən muradım əksinə, ey çərx, rəftar eylədin.
Rişteyi-canım yanar suzi-nihandan hər gecə,
Sən, üzün ta sübh, şəmi-bəzmi-əğyar eylədin.
Kuyi-yarə etmisən, Seyyid, güzər məndən nihan,
Nalə ilə itlərin ol kudə bidar eylədin.

Həbibim, həddən aşdı aşiqi miskinə bidadın,
Cəfanı kimdən ögrəndin, ilahi, ölsün ustadın!
Sən əvvəldən belə bidadlər etməzdin üşşaqə,
Məgər tutdun müxalif pəndini bu qövmi-həssadın.
Yetişməz, ol .büti-namehribanə bir əsər qılmaz,
Nə sud ondan ki, ey dil, çıxdı çərxə ahü fəryadın.
Əsiri-qaməti-mövzunun olmuşdur məgər, ey gül,
Ki çəkmiş bağban əl xidmətindən sərvi-azadın.
Bu şirinlik ki, var mabeynimizdə yar ilə, Seyyid,
Əgər bilsə qiyamətlər qopar başinə Fərhadın.

Gözüm səndən siva rüxsarəyə gər baxsa kur olsun,

Deyim bundan bətər, vəslindən ey məhparə, dur olsun.
İlahi, qanə dönsün qeyr yadın eyləsə könlüm,
Gözüm çıxsın, baxa sənsiz, əgər qilmanü hur olsun.
Gözün yadilə könlümdə, əcəb yox, olmasa işrət,
Nə mümkündür, gözüm, bimar olan evdə sürur olsun?
Qüruri-hüsn edib, ey mişkxət, məndən kənar olma,
Nədir nöqsan Süleymanə əgər həmbəzm mur olsun.
Olub binur hicri-arizində dideyi-Seyyid,
Üzündən dur olan gözdə nə mümkündür ki, nur olsun!

O gün olsun ki, ey rəbbim, səfərdən dilbərim gəlsin,
Sərim şuri, gözüm nuri, o mahi-ənvərim gəlsin.
Məzaqi-cani-şirinim olubdur təlx hicrində,
Açılsın karvani-Misr, kani-şəkkərim gəlsin.
Güli-cəfər kimi rəngim saraldı badi-möhnətdən,
Açılsın güllərim, ol türrəsi nilufərim gəlsin.
Cahan dönsün behiştə, cənnəti-mövud əyan olsun,
Üzü cənnət, qədi tuba, o ləli Kövsərim gəlsin.
Cüda düşdüm o tutiləhcədən balü pərim sındı,
Gəlib ol şahbazım, tazədən balü pərim gəlsin.
Nigara, sən gedəndən bu olubdur Seyyidin virdi:
O gün olsun ki, ey rəbbim, səfərdən dilbərim gəlsin!

Genə ey göz, nə gördün kim, bu növi xunfəşan oldun,
Hübabi-əşki-xunin içrə cismim tək nihan oldun.
Sənə tapşırdım, ey dil, sirri-ləli-yarımı bir gün,
Ona tab etmədin sən, həm dönüb axırda qan oldun.
Səni derlərdi, ey dil, bivəfa, mən bavər etməzdim,
Və lakin bivəfalıq səhldir, sən xəsmi-can oldun.
Əzəl gün mehr edərdin, ta könül oldu giriftarın
Dönüb, ey səngdil, daşə, əcəb namehriban oldun.

Cəfavü cövrüvə mötad qıldın Seyyidi-zarı,
Ona, şad olduğun gördün, ona həm sərgiran oldun.

Cismdən can almağa gər olsa fərmanın sənin,
Canə minnətdir olam, ey dust, qurbanın sənin.
Gər tökərsən, ey Xəlilim, qanımı, qəm etmərəm,
Qəm odur kim, gər bata ol qanə damanın sənin.
Gəlmişəm can verməgə, ey şəh, Minayi-kuyüvə,
Qanımı tök camə kim, olsun bu ehsanın sənin.
Bir gülüstandır səri-kuyin açılmış gülləri,
Qan ilə gülrəng olub gülbərgi-xəndanın sənin,
Kəsrət içrə tapmışam mən dürri -kənzi-vəhdəti,
Olmuşam hərçənd zülfün tək pərişanın sənin.
Nəfydən isbatə gəl, ey dil, ki xakə nəss edə
Qətrə-qətrə hərfi-«illəllah» al qanın sənin.
Seyyida, gər canuvi cananə etməzsən fəda,
Razı olmaz eşqdə səndən o cananın sənii.

O gün olsun ki, genə məclisə dilbər gəlsin,
Çıxıban bürcdən ol mahi-münəvvər gəlsin.
Genə saqilər ələ badeyi-gülgun alsın,
Bəzmə mina düzülüb, gərdişə sağər gəlsin.
Bəzmi-işrətdə əgər yar ola, bir haləti var,
Məst olub rəqs eləsin, haləti-digər gəlsin.
Nuşbada!--ləb açıb badəni şirin etsin,
Təlx mey zaiqeyi-canıma şəkkər gəlsin.
Səhldir kim, edəsən qanımı su kimi rəvan,
Tək sənin qaşlaruvun tiğinə cövhər gəlsin.
Ey məni ol məhi-xurşidliqadən ayıran,
Görüm aləmdə günün şamə bərabər gəlsin.
Gərçi hicranda, könül, bəd geçinir əhvalın,

Şükr qıl, olmaya bundan dəxi bədtər, gəlsin.
Tövbə etdin meyi-gülfamdən, ey Seyyidi-zar,
Hələ səbr eylə ki, fəsli-güli-əhmər gəlsin.

Kim ki, istər özünü sərvəri-əyyam eləsin,
Dəri-meyxanəni öpsün, tələbi-cam eləsin.
Abi-Kövsərdə mənim hər nə nəsibim varsa,
Döndərib rəbbim onu badeyi-gülfam eləsin.
Yar gəldi, hamı öz dərdinə məşğul oldu,
Qalmadı kimsə ki, əhvalıma əncam eləsin.
Sən nə kutahsən, ey şami-visali-dilbər,
Həq mənim ömrümü kəssin, sənə ənam eləsin.
Zülfü xəttin gətirir arizinə cananın,
Kafər istər əcəba, kafəri islam eləsin?
Olsa nakamlığım gər o pərinin kamı,
Dili-divanəmi həq dəhrdə nakam eləsin.
Seyyid ol zülfü rüxündən ki, hekayət söylər,
İstəyir kim, günün ol vəch ilə axşam eləsin.

Şivəsi gah qəzəb, gəh rəvişi naz olsun,
Təki bəzmimdə mənim bir büti-tənnaz olsun.
Xəlq hərçənd deyir bir gül ilə yaz olmaz,
Çağırın ol gülü kim, məclisimiz yaz olsun.
Tayiri-könlümü seyd etdi qəzali-çeşmin,
Bavərim yox bu cahanda belə şahbaz olsun.
Öldür, ey qaşı kəman, aşiqi min zillət ilə,
Ta güruhi-şühəda içrə sərəfraz olsun.
Müstəcab oldu duamız ki, nigarım gəldi,

Dəri-meyxanə gərəkdir bu zaman baz olsun.
Demənəm badə ilə et məni sirab, xuda,
Bari, çox olmasa da qismətimiz az olsun.
Seyyida, çəkmənəm ol dövri-müxalif qəmini,
Təki ol dilbəri-xoşləhcə mənə saz olsun.

Cəm ikən rüxsarüvə zülfün pərişan eylədin,
Məndən ey gül, ol cəmalüllahı piihan eylədin.
Bağə girdin ol üzari-aldən açdın niqab,
Qönçənin bağrın həsəddən dəmbədəm qan eylədin.
Ərzi-rüxsar eylədin gülşəndə, ey gül bülbülə,
Bülbülü gülzari-eşqində pəşiman eylədin.
Boynuma saldın o müşkin zülfüvün zünnarını,
Ey büti-tərsa, məni eşqində Sənan eylədin.
Oldu hər bir zərrədən eşqin təcəllası əyan,
Aləmi Musa tək, ey xurşid, heyran eylədin.
Kənzi-məxfidən əyan oldu düri-şəhvarlər,
Qətrəni, ey bəhri-ehsan, dürri-qəltan eylədin.
Gah işvə, gah qəmzə, gah xişmü, gah naz,
Seyyidə hər gündə bir növ ilə ehsan eylədin.

İstərsən əgər, ey dili-şeyda, fərəh olsun,
İç dilbər ilə sağəri-səhba, fərəh olsun.
Öp ləli-ləbi-dilbəri, iç badeyi-gülgun,
Məcuni-müfərrehdi, sənə ta fərəh olsun.
Sərbəstə müəmmadı sor ol qönçə dəhanı,
Şayəd ki, açılsın bu müəmma, fərəh olsun.
İç badə ki, olsun iki əmrin biri hasil,
Ya qüssə gətirsin sənə mey, ya fərəh olsun.
Mövquf isə qəlbin fərəhi qətlimə, billah,
Öldür məni, ey dilbəri-ziba, fərəh olsun.

Giryan səni gördükdə olur gül kimi xəndan,
Tək ol gülə, ey Seyyidi-rüsva, fərəh olsun.

Üç aydı hicrini çəkirəm gülüzarımın,
Hər gün qəribə haləti var rüzgarımın.
Üç yüz il Adəm ağladı, üç ay, əgərçi, mən,
Amma ki, çox təfavütü var ahü zarımın.
Üç dərdə mübtəla idi Adəm, degil nihan,
Bundan ziyadə dərdi yox ol tacdarımın.
Həvva həvası, dərdi-günahü fəraqi-xüld,
Kəsmişdi ixtiyarını ol xaksarımın.
Mən bilmirəm ki, hansı qəmi eyləyim bəyan,
Yoxdur. şümarəsi ələmi-bişümarımın.
hicran qəmi, fələk sitəmi, təneyi-rəqib
Kəsmiş qərarını bu dili-biqərarımın.
Ruzi-cəzadə siqləti kahini sındırar,
Hər şəmməsin əgər çəkələr intizarımın.
Seyyid, yetərdi rüfət ilə gögərə başım,
Yetsəm səməndi gərdinə ol şahsüvarımın.

Vaiz meyin məzəmmətin etməz savab üçün,
Dildə bəhanədir sözü zikri-şərab üçün.
Saqi, gözün fədası olum, cami-mey gətir,
Yandırma odlara məni bir cürə ab üçün.
Derlər ki, badədən açılır babi-mərifət,
Biz daxi bir əyağ içəlim fəthi-bab üçün.
Sərf oldu bəsdi səbhəvü övradə ömrümüz,
İndi gərəkdi sərf ola çəngü rübab üçün.

Zahid şərabı Kövsər üçün tərk edərsə, mən
Fövt etmərəm bu nəqdi o nisyə hesab üçün.
Olsun cahanda guşeyi-meyxanələr bizim,
Qalsın behişt zahidi-alicənab üçün.
Seyyid, yəqin ki, rəhməti-həqdəndi bixəbər,
Ol kim şərabı tərk edə bimi-əzab üçün.

Ey həmnişin ki, sən mənə qəmxar olmusan,
Zənnim budur rəqibi-məni-zar olmusan.
Hər günkü pəndüvə bu nəsihətlər oxşamaz,
Qafil, bu damə sən də giriftar olmusan?
Müddətdi bəzmi-qeyr olub ol mah mənzili,
Ey asiman, nədən belə bikar olmusan.
Səndən sivayə cövr eləməz yar, ey könül,
Netdin ki, sən bu lütfə səzavar olmusan.
Bülbül kimi fəğanə gəlib ağla, Seyyida,
Ol gül yanında böylə ki, sən xar olmusan.

Ey dil, həzar şükr xəbər gəldi yardən,
Olduq xilas dərdü qəmi-intizardən.
Fəsli-xəzan qəmin çəkən avarə bülbülə,
Verdi səba xəbər o güli-novbahardən.
Ey məqdəmin fədası, bəlalər çəkir başım,
Gəl, gəl ki, keçdi səbrü qərarım qərardən.
Et şadlıq gözüm yaşı, ol gülrüxüm gəlir,
Xarü xəsi götür, kərəm et, rəhgüzardən.
Aləmdə bir gün olmadı ki, vəsli-yar ilə
Bir kami-dil alam fələki-kəcmədardən.
Bilməm nə eyləyib ona eşq əhli kim, müdam,
Bu çərxi-kinəvər ayırır yarı yardən.

Qoy dönməsə müradımca çərx dönməsin,
Minnət çəkən kişi degiləm ruzgardən.
Şükri-xuda ki, vədeyi-vəslində ol məhin,
Şərməndə olmadım dili-ümmidvardən.
Getdi o gün ki, Seyyid, oxurdun bu misrəi:
«Vahəsrəta, üzüldü əlim ol nigardən».

Dilbəstə olmasaydım əgər zülfi-yarə mən,
Çox da bu gunə olmaz idim bəxtiqarə mən.
Ağazi-ülfətimdə görən lütfü yardən,
İndi rəqib ilə görürəm aşkarə mən.
İstər cüda həmişə o məhparədən məni,
Bilməm nə etmişəm fələki-kəcmədarə mən.
Əğyarə iltica edirəm indi hicrdə,
Qaldım qəmində gör nə yaman ruzgarə mən.
Ey dərdü qəm, qoyun məni bir öz qərarimə,
Bir çarə eyləyim bu dili-biqərarə mən.
Ol lalərüx fəraqı ilə əşgi-aldən
Döndərmişəm cahanı bu gün laləzarə mən.
Gördüm ki, ülfətimdən edər ar dilbərim,
Çəkdim özümü, Seyyid, o güldən kənarə mən.

Ol mahrüx xəyalımı bilcək vüsal üçün,
Azürdə oldu eylədigim ol xəyal üçün.
Can çıxdı görmədim dəhəni-yardən əsər,
Ömrümü badə verdim ol əmri-məhal üçün.
Döndü hilalə qürreyi-ömrümdə qamətim,
Oldu zəif günbəgün ol məhcəmal üçün.

Bundan bil iştiyaqımı kim, bunca rəşk ilə
Bir qeyri qasid eyləyirəm ərzi-hal üçün.
Səndən nolur kəmalə yetə Seyyidi-fəqir,
Bais Məhəmməd oldu kəmali-Bilal üçün.

Yüz yarə dəgsə çeşmimə gər novki-tirdən,
Sanmun ki, mən kəsəm nəzər ol binəzirdən.
Oldum şəhidi-qəmzəsi, bir kimsə bilmədi;
Düşməz cahanə qülqülə mərgi-fəqirdən.
Ol bu ki çini-türreyi-cananədən gəlir,
Gəlməz məşamə nəkhəti-müşkü əbirdən.
Bilməm nə Kəbəsən ki sən, ey qibleyi-səfa,
Xoşdur yolunda xari-müğilan hərirdən.
Ahuyi-çeşmi-məstin edən seydi, ey pəri,
Bir kimsə görməyibdi cahan içrə şirdən.
Keçmək xətadı bəççeyi-sağərfüruşdən,
Fitva varımdı əldə bu məbhəsdə pirdən.
Tutdun sədayi-şer ilə, Seyyid, cahanı sən,
Ya rəb, cahanda qalmaya namın Cərirdən.

İstəməz nərgisi ol dideyi-şəhlanı görən,
Sünbülə meyl eləməz zülfi-çəlipanı görən.
Səni tari, özün insaf elə bir ey zahid,
Məscidə meyl eləsinmi bu kəlisanı görən?
Şeyx Sənanə məzəmmət nə rəvadır vaiz,
Kafər olmazmı belə düxtəri-tərsanı görən?
Gəl kəlisayə, tamaşa elə möcüzlərinə,
Nə görər gör ki, bu ecazi-Məsihanı gerən. ,
Gəl təmaşa elə rüxsardə iqdi-ərəqi,
Olmayıb gərçi gün üstündə Sürəyyanı görən.

Hurü qilmanə necə meyl eləsin aşiqi-zar,
Surəti-zahirə baxsınmı bu mənanı görən?
Bu qəzəldən genə bir rəmz göründü Seyyid,
Bilmirəm kimdi yol üstə bu müsəlmanı görən?

Mənəm ki, yüz qəmü yüz dərdə mübtəlayəm mən,
Məhəbbətində sənin talibi-bəlayəm mən.
O vəqtdən ki, hamı masivanı tərk etdim,
Yəqinim oldu ki, sultani-masivayəm mən.
Mənimlə zində olub tapdı Xızr ömri-əbəd,
Bu dari-zülmət ara çeşmeyi-bəqayəm mən.
O qüvvəyəm ki, yədi-həqlə gəlmişəm felə,
Təsəvvür eyləmə kim, bir dəxi fənayəm mən.
Nə şöləyəm ki, çəkəm asimanə gərdəni-kibr,
Bəsani-sayəyəm, üftadə xaki-payəm mən.
Məni çəkər gözünə harda görsə əhli-nəzər,
Siyahbəxtəm əgər, mili-tutiyayəm mən[1].

[İstinad1: Məqtə yoxdur].

455

İstəməm istəbrəqi-firdovsi-əladən kəfən,
Gər tapam cildi-səgi-yari-dilarədən kəfən.
Gər o sərvi-gülrüx eşqindən şəhid olsam, mənə •
Sərvdən tabut edin, gülbərgi-həmradən kəfən.
Şərdə gərçi qara caiz degil təkfin üçün, .
Xoşdurur Məcnuni-eşqə zülfi-Leyladən kəfən.
Gər behişti-küyin içrə nəşimi dəfn etsələr,
Göndərir rizvani-cənnət zülfi-huradən kəfən.
Qamətin görcək qiyamətdə nədamətlər çəkər
Münkiri-eşqin geyə gər bərgi-Tubadən kəfən.

Asitani-yardə üryan məni dəfn eyləyin
Kim, şəhidi-eşq aparmaz mülki-dünyadən kəfən.
Göndərin Seyyid, vəfat etdikdə mən, zünnarımı,
Yollasın rahib mənə fərşi-kəlisadən kəfən.

Keçən şəb bir məkanda bir nigari-sadə gördüm mən,
Xədəngi-qəmzəsin can almağa amadə gördüm mən.
Yığılmışdı o bəzmi-canfəzayə hurü qılmanlar.
Behişti-Ədn kim derlər, onu dünyadə gördüm mən.
Xədəngi-qəmzəsindən, onların tiri-nigarından
Özüm tək əhli-bəzmi sərbəsər üftadə gördüm mən.
Yıxıldım, huşdən getdim, tutuldu iitq, Musa tək
Təcəlla nurunu çün vadiyi-Sinadə gördüm mən.
Müsəlmanzadə idim, döndüm axır bütpərəst oldum,
Məhəmməd nurunu çün ol büti-zibadə gördüm mən.
O bəzmi bir də, Seyyid, görmək olmaz, ağlaram hər gün,
Ki guya ol büsatı dün gecə röyadə gördüm mən.

Əgər sərdabeyi-qəbrim ola meyxanə xiştindən,
Degil mənadə əksik zahidin qəsri-behiştindən.
Mənə bir xubru bir guşeyi-xəlvətdə yar olsa,
Olur asudə könlüm bu chanın xubü ziştindən.
Nə ziba bütsən, ey məh sən ki, görcəg qaşların tağın
Çıxar mehrabdən zahid, keçər rahib kiniştindən.
Bu abü-tab ilə sənsən ki, ey gül, həsbətən-lillah,

Yəqinimdir degilsən sən bəni-Adəm siriştindən.
Əsir ol kakilə başdan səni yazmış qəza, Seyyid,
Bu qarə günlərə düşdün qəzanın sərnəviştindən.

Ancaq o məhin zülfü nə iyman alır əldən,
Ahu baxışı, qarə gözü can alır əldən.
Rüxsarın üzə tazə gələn səbzeyi-xəttin,
Bir murdi kim, mülki-Süleyman alır əldən.
Zülfün götürüb əl,.üzün iymanə edər qəsd,
Kafər alanı indi müsəlman alır əldən.
Sərgəştə edər könlümü ol kakili-dərhəm,
Cəmiyyətim ol zülfü-pərişan alır əldən.
Yüz saxlayasan nəqdi-dilü canüvi, Seyyid,
Bir vəchlə ol novgüli-xəndan alır əldən.

Umarkən aşinalıq ol məhin çeşmi-siyahindən,
Bulaşdıq qanə ahulər kimi tiri-nigahindən,
Mən ol əhli-məhəbbət aşiqəm kim, xakə dönsəm də,
Gəlir buyi-məhəbbət aləmə qəbrim giyahindən.
Degildir fövci-xət rüxsari-yar üzrə, şəhi-Zəngin
Düşübdür mülki-Rumə tirəlik gərdi-sipahindən.
Əgər mehr ilə bir gün göstərə ol mah rüxsarın,
Olur bizar mərdüm bu sipehrin mehrü mahindən.
Əbəs gestərmə sən məscid təriqin Seyyidə, zahid,
Onu azdırmaq olmaz bir dəxi meyxanə rahindən.

Məni dövri-fələk avarə qıldı kuyi-yarimdən,
Şikəstə bülbüləm kim, ayrı düşdüm gülüzarimdən.
Mənəm bu vadiyi-möhnətdə sərgərdan qalan naqə,
Fələk bidad ilə üzdü məni axır qətarimdən.
O gündən ki, rəqibə aşinadır naz-pərvərdim,
Həmişə mərg xahiş eylərəm pərvərdigarimdən.
Sirişki-laləgunum damənim gülzara döndərdi,
Sanırlar kim, çıxıblar lalələr, güllər kənarimdən.
Həvayi-kakilinlə dudi-dildir, ey mələksima,
O sünbüllər ki, tışra baş verir xaki-məzarimdən.
Nihani eşqimi mərdümlərə faş etdi göz yaşım,
Odur kim, qətrə-qətrə düşdü yaşım etibarimdən.
Demə bidərdlikdən məskən etdim qürbəti, Seyyid,
Məni avarə qıldı dərdi-yar axır diyarimdən.

Ta ki oldu məst yari-məhliqamız badədən,
Şükr lillah, hasil oldu müddəamız badədən.
Badəni gər qaziyül-hacat dersəm, ney[1] əcəb.
Müstəcab oldu bu gün, saqi, duamız badədən.
Biz o rindi-badəxarıq aləmi-işrətdə kim,
Tutiyamız dürdi-meydəndir, şəfamız badədən.
Xirməni-reybü riyanı yandırırmış cami-mey,
Şükr lillah, bərtərəf oldu riyamız badədən.
Gərçi ay gündən qılır kəsbi-ziya, amma bizim
Feyzimiz lütfi-xudadəndir, ziyamız badədən.
Müşrifi-movtəm, vəli, Əzrailə can verməərəm,
Ey təbib, olsa əgər, billah, dəvamız badədən.
Badə üçün bilmədim vaiz nə böhtan söylədi,
Aqibət biganə oldu aşinamız badədən.
Seyyida, derlər ki, meydən rəf olur şərmü həya,
Tutdu dünyanı bizim şərmü həyamız badədən.

[İstinad1: Nə, yox]

Mahım yıxıldı bəstərə eynül-kəmaldən,
Saxla ol afitabı, xudaya, zəvaldən.
Keçdi xəyaldən ki, öpəm ləli-nabını,
Təbxalə zahir etdi ləbim ol xəyaldən.
Hal əhli olsa şəxs olur hali haldən.
Bir gecə rövşən olmadı ol mahdən gözüm,
Nöqsanə getdi ömrüm o qaşı hilaldən.
Zahid nə bilsin eşqdə əhvalımı mənim,
Cami-şərabıma daş atır möhtəsib genə,\
Bilməm nə istəyir o, bu sınmış sifaldən.
Hər kəs o mahı oxşada xurşidi-ənvərə,
Nöqsani-eşqi var ki, qutarmaz vəbaldən.
Hər gülrüxün ki, hüsnün edə xətti paymal,
Bir padşahdır ki, düşübdür cəlaldən.
Mahi-təmamə eylədi nisbət cəmalını,
Nöqsanı var ki, Seyyid azıbdır kəmaldən

Könül, ta var əlində cami-mey sultani-aləmsən,
Əyağın başə çək, dünyadə çəkmə hiç bir qəm sən.
Fəda olsun sənə, ey düxtəri-rəz, paklər canı,
Verərsən mürdəyə canlar, məgər İsəbni-Məryəmsən.
Kiminçün olasan məqdur, olur müstəğni aləmdən,
Məgər, ey badeyi-gülrəng, sən iksiri-əzəmsən?
Visali yardən etdin büsatım bərhəm, ey gərdun,
Nolur könlüm kimi bir gün olaydın böylə bərhəm sən
Nə yüzdən geymisən qarə bu gunə, ey xəti-dilbər,
Məgər sultani-hüsnə tutmusan Rum içrə matəm sən?
Nə mümkündür bəşərdə, haşə-lillah, bu cəmal olsun.
Mələksən, ya pəri, ey gül, degilsən nəsli-Adəm sən.
Əgər oxşatmasaydın xublar əbrusuna, Seyyid,
Əkib mehrabə başın eyləməzdin qamətin xəm sən.

Nə dəsti-yardən öpdük, nə bir saqi əyağından,
Açılmaz qönçeyi-məqsudumuz bu dəhr barından.
Görəydi sən təki ruhi-rəvanı dideyi-Məryəm,
Atardı toprağa qundağın İsanın qucağından.
Məni, ey Xızrxət, himmətdə İsgəndər xəyal etmə,
Muradım ləblərindir çeşmeyi-heyvan sorağından.
Təsəvvür etmə təqvadəndi gər sağər şikəst etdim,
Eşitdim bəzmi-meydə öpmüş ol dilbər dodağından.
Görüb xublar cəfasın xofvə düşmüş, Seyyida, zahid,
Budur vəchi ki, çıxmaz tışra məscidlər bucağından.

Ey könül, eşq içrə oldun kar sən, divanə mən,
Oldun axır eşqdən bizar sən, biganə mən.
Simbər bütlər qəmi-eşqindən oldun aqibət
Xəlq ara biqədrü bimiqdar sən, əfsanə mən.
Yadi-çeşmi, şevqi-şəmi-arizi-çananədən
Oldun, ey miskin könül, bimar sən, pərvanə mən.
Sən gülə şuridə, mən bir gənci-hüsnün talibi,
Tutdun, ey bülbül, rəhi-gülzar sən, viranə mən,
Seyyida, səd şükr kim, asudə olduq, eyləyib
Can fədayi-qəmzeyi-dildar sən, biganə mən.

Gərçi qəra günəm o məhi-kəckülahdən,
Xoşdur bu qarə gün mənə yüz mehrü mahdən.

Səndən dedim ki, eyləyərəm şəkvə ruzi-həşr,
Ta ruzi-həşr münfəiləm bu günahdən.
Rahi-məhəbbətində xoşam gər olam şəhid,
Növmid eyləmə məni, ya rəb, bu rahdən.
Rüyün ki, mehri-sübhi-ümidimdir, ey pəri,
Zülfün nihan edibdi məni-rusiyahdən.
Sən eylə vəsli-yarə həvəs şövqi-can ilə,
Seyyid, mənim görüldü işim bir nigahdən.

Dün eşitdim bir siyəhzülfə giriftar olmusan,
Ey mələksurət, mənim tək aşiqi-zar olmusan.
Vermisən bir səngdil dildarə nazik könlüvü,
Sən məgər könlündən, ey məhparə, bizar olmusan?
Çəkmisən canan cəfasın, görmüsən hicran qəmin,
Şükr-lillah, halıma, ey gül, xəbərdar olmusan.
Görmüsən ayineyi-vəchində əksi-surətin,
Taqətü huşün gedib, bir nəqşi-divar olmusan.
Şövqi-ləlindən onun, ey xosrovi-şirinzəban,
Seyyidi-şirin-süxən tək sahibəşar olmusan.

Saqi, lütf et mənə bir cam meyi-səhbadən,
Fariq eylə məni bu dəğdəğeyi-dünyadən.
Çərx həllaclıq eylərdi tərazu quruban,
Biz atan pənbəni yığsaydı səri-minadən..
Aldı dil zülfi-siyahın iki dünyanı verib,
Gör nə sud eylədi bimayə olan sövdadən.

Ərəqi-arizi-gülfamuva bənzər deyibən,
Cəzb edib şəbnəmi gün ruyi-güli-həmradən.
Surəti-zahirə meyl etməz idin, Seyyid, əgər
Feyzyab olseydün zaiqeyi-mənadən.

Şükr, ey dil, gəlir ol mah bizim sarı bu gün,
Gör doyunca rüxi-canpərvərini, barı bu gün.
Qoyma getsin çıxıb, ey dil, o məhi-bimehri,
Sabit et yalvarıb ol əxtəri-səyyarı bu gün.
Bu gecə mənzil elə xanəmi, ey mahliqa,
Salma nöqsana bizi, getmə, səni tarı, bu gün,
Ayü gün, sabitü səyyarə təmaşayə çıxıb,
Müştəridən o məhin gərmdi bazarı bu gün.
Genə dünyalərə sığmaz, nə olubdur, Seyyid,
Xoş baxıbdır üzünə yoxsa genə yarı bu gün.

Nə Məcnunəm ki, vəhşət eyləyim Leyla cəfasından,,
Düşəm səhrayə sərgərdan qəmi-eşqin bəlasından.
Nə Fərhadəm ki, dağlarda vuram öz başıma tişə,
Qutarmaqçın bu şirin canımı hicran xətasından..
Vətəndə cövri-canan xoşdu, qürbət içrə rahətdən,
Xudavənda, qutarma sən məni canan cəfasından.
Gülahından çıxartdım kakilin yalvarə-yalvarə,
İlanı, ari, şirin dil çıxardar öz yuvasından.
Səgi-kuyi-həbibimlə qədimi aşinadır dil,
Xudavənda, ayırma aşinanı aşinasından!
Gəlir yanıma qeyr ilə nigarım hal sormaqçın,
Mənə, billah, xoşdur yüz cəfası bu vəfasından.
Diriğa, getdi xakə, ərzi-halı sinədə Seyyid,

Bəyanə çəkmədi ol şahə öz şərmü həyasından.

İstədim çarə xətin bu dili-sədparə üçün,
Dedi mərhəm kim edib müşki, görək, yarə üçün?
Qasid, ol mahi-təmamım şəbi-hicran qəminə
Nə sərəncam eləyirdi bu günüqarə üçün?
Həzrəti-Nuhi-Nəci nəxleyi-Tubanı kəsib,
Sənə, ey tifl, gərəkdir yona kəhvarə üçün.
Tövbə verdi mənə meydən qəsəm ilə vaiz,
Payladım badə alıb mən dəxi kəffarə üçün.
Səni gördükdə səri-rahdə, həqdən Seyyid
Yüz göz istər, gözəlim, hüsnüvə nəzzarə üçun.

Ey həmnişinlər, oyadın yar yatmasın,
Dursun ayağa ol güli-bixar yatmasın.
Yatsa o mahparə yatar bəxtimiz bizim,
Zinhar, qoymayın onu, zinhar yatmasın.
Bidar edin, amandır, o zülfi siyahımı,
Zülm ilə etməsin günümü tar, yatmasın.
Gülzari-xəttü xalına nəzzarədən siva,
Ol gülrüxə bir özgə sözüm var, yatmasın.
Rüxsarın etməsin yatıban zülf ara nihan,
Nuri-xudanı eyləsin izhar, yatmasın.
Eşq əhlinin bu şəb kəsilib səbrü taqəti,
Bir çarə eyləyin bizə, dildar yatmasın.
Seyyid həlak olur, oyadın ol qəzalımı,
Durmuş kəmində yar üçün əğyar, yatmasın.

Mən eylə bilirdim ki, mənə yar olacaqsan,
Aləmdə mənə yari-vəfadar olacaqsan.
Mən eylə xəyal etmiş idim ey güli-rəna,
Sərbəstə olan qəmlərə qəmxar olacaqsan.
Əvvəl eləyib mehrü məhəbbət mənə, axır
Məndən, nə bilim ki, belə bizar olacaqsan.
Rövşən elədim şəmi-cəmalın, nə bilim ki,
Əğyarə gedib şəmi-şəbi-tar olacaqsan.
Dil verməz idim mən sənə, ey yari-dilazar,
Bilsəydim əgər beylə dilazar olacaqsan.
Sərməst meyi-hüsnü səfasən hələ, ey gül,
Ol vəqt ki, hüsnün gedə huşyar olacaqsan.
Məğrursən, ey gül, xəbərin yoxdur özündən,
Əyyami-xəzan gəlsə xəbərdar olacaqsan.
Bir vəqt olacaqdır ki, sən, ey Yusifi-sani,
Üşşaqi-siyəhbəxtə xəridar olacaqsan.
Xar eylədi ol gül səni əğyar yanında,
Seyyid, hələ bundan dəxi sən xar olacaqsan.

Çeşmələr sanmun tökür göz yaşı, ağlar Bisütun
Tişə zəxmindən görüb Fərhad cismin laləgun
Bisütun dağında sanmun lalədir hər il çıxan,
Kuhkən qanın saçır hər dəm ona gərduni-dun.
İstəməzdi zövq üçün şəkkərdəhənlər vəslini,
Xosrovu Fərhad tək eşq etmiş olsaydı zəbun.
Can fəda insafına, ey şux kim, bu hüsn ilə
Xəstələr könlündən istərsən genə səbrü sükun.
Gün üzün rüxsaruva oxşatdı bir gün laf edib,
Hər gün eylər asiman ani bu yüzdən sərnigun.
Göstərir zülfün ara xəttin, dəhanın aşiqə,
Sanki Xızr İskəndərə zülmətdə olmuş rəhnümun.
Getdilər Fərhad ilə Məcnun büsati- dəhrdən,
İndi Seyyid oldu kim, sərxeyli-ərbabi-cünun.

İyadət eyləməz oldu Məsihim aşiqi-zarın,
O xurşidi-vəcahət kəsdi məndən feyzi-didarın.
Müşəxxəs eylədim kim, ölməgim qalibdi sihhətdən,
O gündən kim, təbibim saldı gözdən hicr bimarın.
Əgər gülqənddən məqsudi-əsli canə qüvvətdir,
Edin tərkib ol şuxün ləbin, gülbərgi-rüxsarın.
Bilibdir kim, bənövşə şərbəti bimarə lazımdır,
Əbəs tutmadı xət girdi-ləbi-ləli-şəkkərbarın.
Həkim abi-ənarin eyləmiş tərtib, bilməz kim,
O şuxün ruyi-gülnarı qılır sakit könül narın.
Düşər gənci-nihanım əllərə, ey Xızri-xət, bir dəm
Tərahhüm qıl, əcəl yıxmaqdadır bu cism divarın.
Deyirlər şireyi-innab təndə qanı saf eylər,
Çox. əmdim ləli-yarı, görmədim, Seyyid, bir asarın.

Gərçi hamıdan səfheyi-dünyadə kəməm mən,
Hər vəqt ki, camım ola dəstimdə, Çəməm mən.
Zahid, ramazanda mənə bu tövbəni verdin,
Get, başın üçün, tövbədə sabitqədəməm mən.
Dünyanı tutub tənteneyi-fəzlü kəmalım,
Aləmləri təsxir qılan möhtəşəməm mən.
Məndən nə sorursan o gülün sirri-dəhanın,
Məhv oldu vücudum, elə bil kim, ədəməm mən.
Yarani-səfa maideyi-təbimə möhtac,
İxvaneyi-Yusifdə vəliyyün-niəməm mən.
Sünbül nə güşayiş verəcək xatirə, ey gül,
Dilbəsteyi-ol kakili-pürpiçü xəməm mən.
Əmvati-məani olur ehya nəfəsimdən
Kim, aləm ara Seyyidi-ecazdəməm mən.

Ey dilbəri-sitəmgərü məşuqi-dilşikən,
Qaşın kəman, kiprigin ox, aşiqöldürən!
Çeşmi-zəmanə görməyib, əlbəttə sən kimi
Bir can alan, kirişmə qılan, işvə göstərən.
Sərraf əlində olsan əgər çoxdu qiymətin,
Bir ləlsən, çi faidə, yox qədrüvi bilən.
İnsan dedim sifətdə sənə, etmədim xəta,
Ey təbi-nazikilə küsüb məndən inciyən.
Yox, yox xəta dedim, qələt etdim, kəc anladım;
Məhparədir tülu qılan yengi bürcdən.
Olmaz başında əqli dürüst eşq əhlinin,
Divanədir özü onu divanə söyləyən.
Yanmış bu dərdə aşiqi-biçarə neyləsin,
Həsrət çəkən dil oldu, alan kam pirəhən.
Bir gün olur, bu təneyi-xəlq öldürür səni,
Eşqində öldü Seyyidi-biçarə qüssədən.

Nola, çox olmaq istərsə həbibim aşiqi-zarın,
Mətai xub olan, əlbəttə, çox istər xəridarın.
Əcəb yox, kəsməsə gər mehrini üşşaqdən ol məh,
Bu rövşəndir ki, kəsməz zərrədən xurşid ənvarın.
Nola əğyarə dildarım əgər ərzi-cəmal eylər,
Diriğ etsinmi aləmdən o məhru feyzi-didarın?
Sono bimehr olub, ey dil, əgər əğyarə meyl etdi,
Şikayət etmə, hər şəxsin bilir ol gül səzavarın.
Visalından rəqibi-divsirət kamyab olsun,
Əgər ki, xatəmi-ləlin mənim tək bilsə əsrarın.
Olur ol afitabə müştəri mahi-fələk, Seyyid,
Bu növ ilə ki, aşiqlər edibdir gərm bazarın.

Bir də görsəm, göz açıb, gər ol güli-rəna yüzün,
Görmək istərsəm, gözüm çıxsın əgər dünya yüzün.
Eşqdə Sənan olub, zünnarə etməzmi həvəs
Görsə zahid gər sənin tək bir büti-tərsa yüzün.
Xalü xəttin əksi çeşmimdə cəmalın şövqdən
Xeyli-hindudur ki, Rum üçün tutub dərya yüzün.
Dağə çaldı cani-şirinin, qurtardı Kuhkən,
Şuri-əşkim seyli ta gördü tutub səhra yüzün.
Nuru batsın çeşmimin görmək təmənna eyləsəm
Mahi-rüxsarın qoyub mehri-cahanara yüzün.
Üz sürürlər bunca kim, üşşaq xaki-payüvə,
Üz çəkib, ey mahi-rüx, göstərmə istiğna yüzün.
Nuru artıb çeşmimin başım fələklərdən keçər,
Bir də görsəm, Seyyid, ol mahi-mələksima yüzün.

Ey qan olan könül, niyə düşdün bu halə sən?
Bais nədir ki, dərdü məlalə həvaləsən?
Peyvəstə ol hilalqaşın möhnətindəsən,
Bir gün olur ki, qorxma, yetərsən kəmalə sən.
Oldun ol afitabə ki, sən müştəri, könül,
Düşdün vəbali-zillətə, gəldin zəvalə sən.
Ol mahdövrəsin dolanırsan səbahü şam,
Ay dövrəsində hər gecə manəndi-haləsən.
Olmazdı, incəlib, belə mu kimi peykərin,
Gər aşiq olmasaydın o qaşı hilalə sən.
Mu qədri görmədin dəhəni-yardən əsər,
Bir yoxdan ötrü düşdün əcəb qilü-qalə sən.
Bəs hanı, ey könül, sərivün üstə sayəsi,
Su verdin əşki-çeşm ilə novrəs nihalə sən.
Seyyid, o sərvin eşqini inkar eyləmə,
Pinhan necə cidanı edərsən çuvalə sən.

Sən mənim, ey ləbi canbəxş ki, cananımsan,
Sənə qurban nə deyim canı ki, sən canımsan.
Neylirəm sərvi, uzun söz nə gərəkdir, ey gül,
Rast oldur ki, özün sərvi-xuramanımsan.
Neylirəm sərvi, gülü gülşəni, ey laləüzar,
Sən mənim sərvü gülü sünbülü reyhanımsan.
Mən sənin murinəm, ey səbz-xətü müşkinmu,
Sən mənim təxti-hökumətdə Süleymanımsan.
Yoxü-varımdı fəda, ey dəhani-yar, sənə
Ki, mənim dəhrdə sən munisi-pinhanımsan.
Kakilin ayəti-«Vəlleyl»di, «Vəşşəms» yüzün,
Sən mənim məktəbi-üşşaqdə Quranımsan.
Dün dedin kim, mənə, ey şah, gədadır Seyyid,
Elə bildim ki, dedin aləmə sultanımsan.

Vahəsrəta,. üzüldü əlim vəsli-yardən,
Ayrıldım əndəlib tək ol novbahardən.
Bir növ ilə ki, ruh çıxıb təndən ayrılır,
Əğyarlər ayırdı məni ol nigardən.
Yarəb, cahanda mən təki məqsudə yetməsin
Hər kimsə kim, ayırdı məni vəsli-yardən.
Ol kəs ki, yardən məni nakam eylədi,
Bir kam görməsin rəvişi-ruzgardən.
Bir söz deyiblər ol gülə məndən hicab edər,
Biganələr kimi baxır indi kənardən.
Düşdüm cüda çü zülfü rüxindən o məhvəşin,
Sir olmuşam bu gərdişi-leylü nahardən.
Bundan sora zəmanədə mən mərgə şaiqəm,
Çün düşmüşəm yanında onün etibardən.
Guya ki, vəsli-yardə sultani-əsr idim,
Döndüm gədayə indi fəraqi-nigardən.
Bülbül kimi fəğandır işim indi, Seyyida,
Ta ayrı düşdüm ol sənəmi-gülüzardən.

Ta aşiq oldum ol büti-qönçədəhanə mən,
Etdim əcəb vücudumu, gör, qayibanə mən.
Aşiqləri nişan dedilər tiri-çeşmüvə,
Ey qaşı yay, görmədim ondan nişanə mən.
Bəzmi-rəqibə saldı ziya şəmi-tələtin,
Qaldım bəladə şəm kimi yanə-yanə mən.
Bər vermədi, açılmadı bir qönçeyi-mürad,
Hər xakə əşk saçdım isə danə-danə mən.
Eylə dəhən rümuzunu məndən sual kim,
Mülki-Ədəmdə vaqif idim bu nihanə mən.
Kuyi-nigardə görüb öz sayeyi-qədim,
Sandım gələn rəqibdi, düşdüm gümanə mən.
Gülşəndə, Seyyid, içdim o şirinləb ilə mey,
Eyş eylədim çəməndə bu gün xosrovanə mən.

Bir dəm mənə bax, ey gözü bimar, ölürəm mən,
Çeşmindən iraq, ey güli-tər, xar ölürəm mən.
Zəncirdə bir kimsənə can vermədi mən tək,
Ol silsileyi-zülfə giriftar ölürəm mən.
Məst olmadığım dəm yox idi dəhrdə bir gün,
Səd heyf, ölən vəqtdə huşyar ölürəm mən.
Qorxum budu görsəm səni ləzzət tapa çeşmim,
Şadəm ki, belə həsrəti-didar ölürəm mən.
Devrimi tutub qüssəvü qəm, möhnəti-aləm,
Sanma ki, belə bikəsü biyar ölürəm mən.
Yox taqətim əryar ilə görmək səni, ey şux,
Ölməkdə bu gün bir qərəzim var, ölürəm mən.
Zəxmi-sitəmin olmadı bu Seyyidə kari,
Səd heyf, səd əfsus, günəhkar ölürəm mən.

Peyğam göndərin bu gecə yarə, gəlməsin,
Sübh olmayınca bəzmə o məhparə gəlməsin..
Ol afitab eyləməsin nisfi-şəb tülu,
Eşqində etməsin günümü qarə, gəlməsin.
Bəsdir bu yarə kim, mənə var bəzmdə rəqib,
Bir də o, yarə üstə vurub yarə gəlməsin.
Nəqdi-məhəbbətində var əğyarın inqilab,
Ol Yusifi-əziz bu bazarə gəlməsin.

Şəm kim, rovşən olub yanmağa pərvanə üçün,.
Yanmağından dəxi pərvanəyə pərva nə üçün?
Verməyim xalüvə ey gül, niyə mən dünyanı,
Çəkdi cənnətdən əl Adəm elə bir danə üçün.
Bilmirəm zülfü üçün şanəni xəlq etdi xuda,
Ya ki, zülfi-siyəhin xəlq eləyib şanə üçün?
Bunca kim, hüsnünü Qurandə vəsf etdi xuda,
Bilmişəm kim, eləyib məşq onu meyxanə üçün.
Piri-meyxanə Əlidir, odur ənvari-cəli,
Aşinanı tanı, seyr eyləmə biganə üçün.
Olmasaydı gili-Adəmdə cəmalından əsər,
Qabil olmazdı onun tinəti peymanə üçün.
Seyyida. eyləmə övsafi-Əlidən qeyri,
Ömrüvi sərf eləmə hər yetən əfsanə üçün.

Xət gəlib müshəfi-rüxsarına mənası üçün.
Ayeyi-Nurə düşüb şərh təcəllası üçün.
Rəşk edir bir-birinə. mərdüməki didələrim
Nöqteyi-xalının, ey şux, təmaşası üçün.
Eşqinə düşdü Məsiha çü bu ziba sənəmin,
Çarmixə çəkilib zülfi-çəlipası üçün.

Xahiş etdi dəhənin sirrini çoxlar, əmma
Oldu .mədum-bu bir nöqtə müəmması üçün.
Zahida, dinüvi sən verdin əbəs şeytanə,
Şeyx Sənan verib öz dilbəri-tərsası üçün.
Verdi can könlümü zülfi-siyəhinə o məhin,
Çarə bildi onu rəfi-qəmi-sövdası üçün.
Mari-Zöhhak idi geysusi, Firidun xətti,
Bu Firidun gəlir dəfinə dəvası üçün.
Seyyidin var idi bir cüzi olan iymanı,
Eylədi nəzr onu da şəhr kəlisası üçün.

Rüxsarın açıb bülbülü şeyda elədin sən,
Bülbül nəzərində gülü rüsva elədin sən.
Ağuşun üçün bəs ki, qolum açıla qaldı,
Kafər, məni bir şəkli-çəlipa elədin sən.
Bürqə götürüb ol ərəqaludə yüzündən,
Gün üzrə əyan iqdi-Sürəyya elədin sən.
Nitqə gəlib etdin bu dili-mürdəni ehya,
Zahir genə ecazi-Məsiha elədin sən.
Tökdün yüzə ol zülfi-xəməndərxəmi, ey məh.
Xurşidə hicabın şəbi-yəlda elədin sən.
Yerdən gögə var Yusif ilə fərq səninçün,
Çox Yusifi eşqində Züleyxa elədin sən.
Hicri-rüxi-alında iki çeşmimi, ey gül,
Xunab ilə meydən dolu mina elədin sən.
Qəddini «əlif», zülfi-siyahini dedin «lam»,
Seyyid, bu əlif-lamı nə məna elədin sən?

Qönçə tək sirri-ləbin eşq əhli xəlvət saxlasın,
Nöqteyi-pinhandı bu, əhli-məhəbbət saxlasın.
Ləli-ruyün xətti pamal oldu, qarə gözlərin,
Getdi onlar, tanrı bu bimarı səhhət saxlasın.
Atdı bir ox bu dili-məcruhə ol əbrukəman,

Naz ilə tapşırdı kim, təndə əmanət saxlasın.
Dövləti-üzmadır, ey dil, pəndi-piri-meyfüruş,
Eyləsin guşində dürr, əhli-sədaqət saxlasın.
Yarımız eşq əhlinə ehsanə maildir özü,
İlticadən özlərin ərbabi-hacət saxlasın.
Ey könül, zülfi-siyahında yol azdın dilbərin,
Hər xətasından səni tanrı səlamət saxlasın.
Qönçə tək çak olmasın könlü necə bu Seyyidin,
Gül təki yarı gedib xar ilə söhbət saxlasın.

Can məşaminə gəlir buyi-riya məsciddən,
Görmədim ömrdə bir zövqü səfa məsciddən.
Buriya tək döşənir məscidə hərdən zahid,
Heyf tərk olmadı əsla bu riya məsciddən.
Öz-özüylə danışır vaiz, olub divanə,
Kim qulağimə gəlir gündə səda məsciddən.
Zahidin kamı ilə dövr eləyərdi gərdun,
Gər qəbul olsa idi bircə dua məsciddən.
Dürdi-meyxanəni tök camə, gətir, ey saqi,
Görmədim dərdimə aləmdə dəva məsciddən.
Cəmdir guşeyi-meyxanəyə ərbabi-səvab,
Bilmirəm ki, nə görüb əhli-xəta məsciddən.
Dəri-meyxanəni aç zövqlə, ey piri-müğan,
Şükrlər kim, dağılır əhli-riya məsciddən.
Seyyida, bunca ki, məsciddən edillər nifrət,
Nə görüblər görəsən kim, şüəra məsciddən.

Görüb ziyayi-rüxün kuyi-yarə gəldim mən,
Ümidi-vəsli ilə bu diyarə gəldim mən.
Visalı döndü mənə oldu axırı hicran,

Yəqin ki, çeşmi-bədi-ruzigarə gəldim mən.
Nəkarəyəm, nəçiyəm, badə ilə sadəm yox,
Özüm də bilməyirəm kim, nə karə gəldim mən,
Nə ahü zar idi bu bir gülün fərağında,
Əlindən, ey dili-xunkəştə, zarə gəldim mən.
Sizi tari mənə bu dəmləri verin fürsət,
Şikayətə bu dəri-şəhryarə. gəldim mən.
Münəccim etdi nəzər bəxtimin sitarəsinə,
Onun təsəvvürünə bəxtiqarə gəldim mən.
Yetişdi qətrələr ol bəhri-vəhdətə, Seyyid,
O bəhrdə dür idim, gör, kənarə gəldim mən.

Ey ləli-ləbin şireyi-şəkkər təki şirin,
Föhşi-dəhənin qəndi-mükərrər təki şirin.
Yüz şəkkərü şirini ola Xosrovun, olmaz
Hərgiz ləbi-Şirin ilə Şəkkər təki şirin.
Vəsf eyləməyin, çox yemişəm Misr nəbatın,
Əsla ola bilməz ləbi-dilbər təki şirin.
Nəxli-əsəlin rəşk ilə təlx oldu məzaqi
Kim, şirəsi olmaz o ləbi-tər təki şirin.
Badam mizacın hükəma təlx deyiblər,
Mən görməmişəm,hiç o gözlər təki şirin.
Seyyid, sənə düşnam desə yar, nə eybi,
Acı sözüdür könlümə şəkkər təki şirin.

Mən öldüm, üstümə dildar gəlsin,
Açıb başın o sünbültar gəlsin.
Açıb nitt, eyləsin yoxdan təkəllüm,
Qənimdə bir nəfəs ta var gəlsin,

Əgərçi ixtiyarı birlə gəlməz,
Edin ol sərkəşi naçar, gəlsin.
Qılın əhvalımı canana rövşən,
Bu zülmatə o məhrüxsar gəlsin.
Ki şayəd rəf edə dərdi-sərimi,
Əyağəldə, meyi-sərşar gəlsin.
Dəhanimə nəfəs təşxisi üçün
Tutub ayineyi-didar, gəlsin.
Cənazəm üstünə gəlsin imamım,
Namazə Cəfəri-Təyyar gəlsin.
Bu təmiri-dil oldu xakə yeksan,
Deyin təmirə ol memar gəlsin.
Əgərçi, bilmişəm gəlməz o gülrüx,
Yanır narə, deyin, bu xar gəlsin.
Nolur, bari-xuda, bu xanəgahə
Çıxıb ol şahidi-bazar gəlsin.
Görər əğyar ilə yarını ölməz,
İlahi, Seyyidə bir ar gəlsin.

Düşəli arizüvə türreyi-müşkəfşanın,
Kakilin kimi edibdir məni sərgərdanın.
Atma qəmzən oxunu sinəmə, qəm kəsrəti var,
Heyfdir, qəmlər arasında itər peykanın.
Sanma məşhərdə şəhidin tələbi-xun etsin,
Genə, ey mah, üzün görsə olur heyranın.
Ol meyi-nab ki, vəslində səninlə içdim,
Qan edib tökdü gözümdən ələmi-hicranın.
Nə bəlasən bizə sən, ey şəbi-hicran ki, sənin
Qorxuram olmaya məhşərdə genə payanın.
Zahida, eyləmisən ol xəmi-əbruyə sücud,
Bəs haçan kamil olur, söylə, sənin iymanın?
Seyyidi-müztəri, ey şəh, nə sorursan məndən,
O ki, qurbanın olum, oldu sənin qurbanın.

İstərəm görmək səni bir şəxsə imkan olmasın,
Məndən özgə hüsnüvə bir kəs nigəhban olmasın.
Düşməyə ta ki, yer üzrə sayeyi-nəxli-qədin,
Gecələr şəmü günüzlər mehr rəxşan olmasın.
İstərəm bir xasi-xəlvət yar ilə aləmdə kim,
Vaqifi ol xəlvətin ta ki dilü can olmasın.
Canü dil biganədir bəzmi-visali-yardə,
Aşinanın bəzminə biganə mehman olmasın.
Xarlər hərdəm görür, ey gülbədən, rüxsarüvi,
Rəşkdən qönçə kimi könlüm necə qan olmasın?
İstərəm canım alıb, boynuma salsın zülfünü,
Ya rəb, ol gülrüx bu sevdadən pəşkman olmasın.
Ol büti-tərsadə hər kim görsə nuri-vəhdəti,
Hiç mümkündürmü o eşq ilə Sənan olmasın?
Zülfü rüxsarı xəyalı ruzü şəb bəsdir ona,
Aşiqin könlündə fikri-küfrü iyman olmasın.
Özgə aləmdir həqiqətdə bu vəhdət aləmi,
Kəsrət ilə aşiqin halı pərişan olmasın.
Ey xudavəndi-əhəd, öz birligin həqqi, mənim
Xatirim, Seyyid kimi, qəmdən hərasan olmasın.

Əgərçi cümleyi-aləmdə yox nişanə sənə,
Vəli salıbdı könül mehri-qaibanə sənə.
Kimi hərəm, kimi meyxanədən səni istər,
Qılır həvəs hərə bir növ aşiqanə sənə.
Gəh əndəlibü gəhi sarü gah səlsəldən,
Çıxar mədihən üçün gah bir təranə sənə.
Təyyürat zəminü zəmanə səndəndir,
Vəli məhal təğəyyür verə zəmanə sənə.
Behiştə kimsənə getməz ibadət etmək üçün,

Qərəz bu əmri-ibadətdi bir bəhanə sənə.
Qərini-məğfirətin iylə cümlə zahirdir
Nə iş ki, tutmuşam, ey qadiri-yeganə, sənə.
Nəsib Seyyidə tövhidi-zatın et, ya rəb,
Çıxıb bədəndən olan dəm rəvan, rəvanə sənə.

Zahid ki, deməz. ad bizə napakdən özgə,
Bizdən nə görüb bəng ilə tiryakdən özgə.
Munis bizə yox şahidi-zibadən əlavə,
Həmdəm bizə yox cami-tərəbnakdən özgə,
Gər xaliqi-əşcarü fəvakeh mən olaydım,
Xəlq etməz idim hiç şəcər takdən özgə.
Təqvimi-rüxun bilməsə, ey mah, münəccim,
Eyb eyləmə, ol görməyib əflakdən özgə.
Məndən soruş ol mahvəşin payeyi-qədrin,
Sən görməmisən şənini lövlakdən özgə.
Fəhm eyləmək istərsən əgər elmi-xərabat,
Bir dərk gərəkdir ona idrakdən özgə.
Bilməm kim edib sineyi-suzanımı məskən,
Bir nalə qılan var dili-qəmnakdən özgə?!

Üzarın zülf ara xurşidi-ənvərdir səhab içrə,
Ləbin İsadı kim, məskən tutubdur afitab içrə,
Düşübdür həlqə-həlqə gül yüzə zülfi-girehgirin,
Qalıb divanə kenlüm fikr ilə- yüz piçü tab içrə.
Mənə gəlməz əçəb vəchində tər, gül üzrə şəbnəm tək,
Təəcçübdür ki, olsun atəşi-suzan gülab içrə.
Qədin əndişəsi könlümdə, ruyün əksi çeşmimdə,
Sanırsan bir əlifdir çan ara, bir güldür ab içrə.

Desən halı nədir sənsiz, nikarım, Seyyidi-zarın,
Qalıbdır cüğd.tək sərgəştə bu bumi-xərab içrə.

Xoş ol zaman ki, düşə vəsl o sərvqamət ilə,
Deyəm ona qəmi-hicranı yüz şikayət ilə.
Qəmində gər çıxa can yüz həyatdən xoşdur,
Təbib, qılma dəva, qoy ölüm bu halət ilə.
Yaralı könlümə hərgiz nəməkdən olmaz əlac,
O şuxi qoyma gələ bu qədər məlahət ilə.
Biz eylədik dəxi, ey çeşmi-yar, tərki-vətən,
O kudə sən qalasan səhhətü səlamət ilə.
Cənazəmi aparın ol nigar kuyində
Verin təvaf, əgər can çıxa bu həsrət ilə.
Gözümdən etdi qəmin qanlı çeşmələr cari,
Nolur gözün baxa bir dideyi-inayət ilə.
Yolunda vermədim ol sərv-qəddə can,
Seyyid, necə yüzinə baxım həşrdə xəcalət ilə.

Tutum ki, vəslüvə can yetdi yüz fəsanə ilə,
Fələk qoyarmı onu sən büti-yeganə ilə?
Ədəb qoyarmı öpüm xaki-astanından,
Tutum ki, kuyüvə yol düşdü bir bəhanə ilə.
Tutuşdu qəm oduna cism, yandı həm könlüm,
O növ ilən ki, yana bir quş aşiyanə ilə.
Yaralı könlümü qoy bir zaman tuta aram,
Amandı, zülfi-siyahın dağıtma şanə ilə!
Əcəb degil ki, tutar dust xublər, Seyyid,
Səni bu xoşməzə əşari-aşiqanə ilə.

Xoşam ki, can çıxa bu həsrəti-üzarın ilə,
Rəqibi sayə kimi görməyim kənarın ilə.
Görüm səni dönəsən qanə, ey dili-zarım,
Ki zarə sən məni gətdin bu ahü zarın ilə.
İşim qara gecələr ahü nalədir sənsiz,
Xəyali-türreyi-pürpiçü tabdarın ilə.
Cahanda hiç cavan həsrət ölməsin, ya rəb,
Bu həsrət ilə ki, mən öldüm intizarın ilə,
Edərsən aləmi Seyyid, qəriq dəryayə,
Gələndə məhşərə bu çeşmi-əşkbarın ilə.

Göndərir vəsl pəyamın mənə əğyar ilə,
İncidir könlümü hər ləhzə bir azar ilə.
Çıxa can xoşdu mənə həsrəti-didarında,
Görməyəm ta ki, səni seyr edən əğyar ilə.
Qan olub gəlsə gözümdən bu dili-zar, nə qəm,.
Vəhmim oldur gələ peykanı dili-zar ilə.
Sənsiz, ey sərvi-güləndam, xəyal eyləmə kim,
Xatirim şad ola seyri-gülü gülzar ilə.
Seyyida, möhnəti-hicranü əcəl, nari-saqər,
Yegdir ondan ki, mənə qeyri görüm yar ilə.

Xali-siyəhin əksidi bu çeşmi-tər içrə--
Kim, xəlq deyir mərdümək anı bəsər içrə?!
Ahu nigəhim, vurma qara zülfüvə müşki,
Toprağı nə lazım tökəsən müşki-tər içrə.
Əqrəbdə qəmər, yox əcəb, az eyləsə mənzil, •
Ol əqrəbi zülfündü əcəb kim, qəmər içrə.
Sən hurimisən, yoxsa mələk, ya ki pərisən,
Yox, yox, buların heç biri olmaz bəşər içrə.
Çeşmi-siyəhi-yarə dedim nərgisə bənzər,
Etdi məni bu söz xəcil əhli-nəzər içrə.

Könlümdə xəyalın o məhin istəməzəm kim,
Ol huri-behişti nə rəvadır səqər içrə.
Düşnam verir aşiqinə ləli-ləbindən,
Ol növ ilə kim, zəhri verirlər şəkər içrə.
Seyyid, əgər ol şəm qəmindən çıxa canım,
Əlbəttə qılın dəfnimi pərvanələr içrə.

Bəs ki, verir cəfaləri hərdəm səfa mənə,
Şadəm ki, daim eylər o gülrüx cəfa mənə,
Bəs ki, cəfalər ilə könül adət eyləyib,
İndi gəlir cəfa, əgər etsə vəfa mənə.
Ol aşina ki, qət elədi məndən ülfətin,
Biganə tənə eylədi, həm aşina mənə.
Derlər ki, vəsli-yardə bir özgə hal var,
Bircə nəsib edəydi o hali xuda mənə.
Ətşani-cami-vəslinəm, ey Xızrxət, əgər
İçsəm, ilahi, zəhr ola abi-bəqa mənə.
Sultani-vadiyi-ələməm, dərdü qəm sipah,
Eşq içrə gər cəlalımı, qıl mərhəba mənə.
Gəh cövrü, gəh xətavü, gəh azarü, gah xişm,
Seyyid, o şux hərdəm edər bir əta mənə.

Eşitdim yarələnmiş dəsti-yarım bir zəval ilə,
Asıbdır gərdənindən dəstin ol məh dəstmal ilə.
Cərahət şiddətindən, söylənir kim, haldən düşmüşy,
Həlak ollam əgər görsəm mən ol mahı bu hal ilə.
Olub rüxsarı atəşnak təbdən ol güləndamın,
Yaxıbdır xirməni-üşşaqı ol rüxsari-al ilə.
Saralmış arizi ta zəfdən ol mahi-tabanın,
Çıxar xurşidi-rəxşan çərxə hər gün infial ilə.
Təbib-asa gəlib ol afitabın tutmağa nəbzin,
Məsiha gögdən enmiş bu təmənnayi-məhal il;.
Həsəddən qamətim xəm oldu kim, cərrahi-bədtinət,

Keçirdir günlərin ol dilbəri-əbruhilal ilə.
Gedib bir gün əyadət etməgə ol mah-simanı,
Qalıbdır Seyyidi-bəxtiqəra yüz min xəyal ilə.

Dönüm sənin başuva,.saqi, al əyağı ələ,
Alıbdı xəncəri-müjganını o yağı ələ,
Yetir o sibi-zənəxdanı qəlbə qüvvət üçün,
Həmişə düşməyəcəkdir bu hüsn bağı ələ.
Üzün sorağın edər gögdə Həzrəti-İsa,
Alıbdı məşəli-xurşiddən çırağı ələ.
Müsəvvər etmək üçün daşə nəqşi-Şirini,
Alıbdı Kuhkəni-xəstə, gör ki, dağı ələ.
Fələk bu fikrə düşüb rişəmi qıla kəndə,
Bilirdi düşməgini bir gülün budağı ələ.
Şərab ola, mən olam, bir də nazlı yarım ola, .
Gətirrəm axırı bir guşeyi-fərağı ələ.
Şərabxanədə baş xüm ayağına qoydum,
Nə bak düşməyə gər Kövsərin bulağı ələ.
Başım səmayə yetər, Seyyid, övci-rüfətdən,
Bəsimdi mahvəşin gər düşə ayağı ələ.

Əgər, gülüm, ola meyli-şərabi-nab sənə,
Gərəkdi şireyi-candan ola şərab sənə.
Həlak qıl məni, ey şəh ki, gəlmişəm canə--
Ki, var bu əmrdə minnət mənə, səvab sənə.
Səninlə həmdəm imiş Bisütun, ey Fərhad,
Fəğanə gəldikcən kim, verib cəvab sənə.
Bu növ ilə ki, lətafət tənində var, ey gül,
Düşərsə sayeyi-Tuba yetər əzab sənə.
Fələk, muradım ilə dövr qılmadın bir gün,
Tutulsun ayü günün, düşsün inqilab sənə.
Dəhani-yarımı gər görsən, ey Xızır, bilüsən
Ki, dəhr qismət edib çeşmeyi-sərab sənə.

O mah ilə olanı həmpiyalə, ey Seyyid,
Fələk həsəd aparır, rəşk afitab sənə.

Meyxanə tərəf saqi, amandır, güzər eylə,
Tez gəl, bir ayağ ilə dəmağimi tər eylə.
Hərçənd ki, mən tanımıram başla ayağım,
Sən doldur əyağı, məni bundan bətər eylə.
Sərməst ölürəm, get məni dəfn etməgə, saqi,.
Rindani-xərabatə bu işdən xəbər eylə.
Yandın necə sən indi, könül, nari-fəraqə,
Yüz dəfə dedim eşqdən, axır, həzər eylə.
Ey dil, əgər ol qəmzeyi-xunxarı sevirsən,
Can cövşənini tiri-bəlayə sipər eylə.
Sədparə könül, xövf eləmə tiri-bəladən,
Mərdanə bu meydanə qədəm qoy, cigər eylə.
Ey nalələrim, gəldi odur qətlim üçün yar
Kim dedi sənə get dili-yarə əsər eylə.
Ol zülfi-siyəhdən bu şəbi-vəsldə, Seyyid,.
Tulani şikayətlərüvi müxtəsər eylə

Könül, bu gün ki, müyəssərdi vəsli-yar sənə,
Dəxi nədir bu qədər suzü ah-zar sənə.
Dəmi-visaldır, ey can, nisar ol yarə,
Nə vəqtlərdi ki, varəm ümidvar sənə.
Visalı kim, o məhin hasil oldu, çıx ey can,
Dəxi bu iki aradə görüm nə var sənə?
Tutum ki, vəslüvə yetdim bu gün, və leyk nə sud,
Nəzər ki, qoymaz edim çeşmi-əşkbar sənə.
Gülün visalını sən bil qənimət, ey bülbül,
Küca ki, qismət ola bir də novbahar sənə.
Zamani-güldü, könül, iç şərabi-gülfamı,

Həmişə əl verə bilməz bu ruzigar sənə.
Fəğan ki, Seyyidə vəslin müyəssər oldu o dəm
Ki, cani-zarını vermişdi intizar, sənə.

Nigara, bəzmi-qəmdə çeşmi-məxmurun pürab etmə,
Dili-üşşaqı yaxma, atəşi-qəmdən kəbab etmə.
Pərişan eyləmə zülfi-siyahın mahi-rüxsarə,
Töküb xunabə gözdən xaneyi-mərdüm xərab etmə,
Xəraş etmə üzari-afitabı mahnovlərdən,
Xəraşidə cəmalın daği-qəlbi-afitab etmə.
Mükəddər eyləmə qəmdən dili-ayinəkirdarın,
Dili-ayinəni qəmdən mükəddər, ey cənab, etmə.
Mühaqə salma zülfündən nigarım, mahi-tabanı,
Sürəyyalar saçıb xurşidə gözdən, inqilab etmə,
Dili-üşşaq tək olma pərişan, gəlmə fəryadə,
Yanıb nari-qəmə zülfün kimi çox piçü tab etmə.
Yetər ol novhələr, ol bəzmdə az nalə bünyad et,
Usan əfqandən, huri-behiştə çox əzab etmə.
Şərikəm qəm günündə mən sənə, ey dilbəri-ziba,
Məni Seyyid kimi sən bivəfalərdən hesab etmə.

Əgər yarım iyadətçin gələydi bir ayağilə,
Dəxi can cism evindən çıxmaz idi dərdü dağ ilə.
Məni saldı ayağə dəhr, pamal etdi, ey saqi,
Tərəhhüm eylə, başınçın əlim tut bir əyağ ilə.
Görüb bir gecə, ey məh, pərtövi-rüxsari-tabanın,
Səni pərvanə hər şəb axtarır, hər yan, çırağ ilə.
Tənim dağında kim, zəxmin açıbdır lalələr, şadəm,
Tamaşa əhlinə, ey gül, gəlir xoş lalə dağilə.
Səfayi-Kəbeyi-hüsnün təmənnasındayam, ey məh--
Ki, hərdəm ol məqamə səy qıllam yüz sorağ ilə.
Yetirdi badəni saqi məgər ləli-ləbi-yarə
Ki, döndü badə bağrı qanə, Seyyid, ol dodağ ilə.

Baisi-təsxir ikən zülfi-pərişanlar sənə,
Bəndə olmazlarmı, ey afət, pəri şanlar sənə.
Dəstbürdi-pənceyi-şiri-nigahından aman,
Çak-çak olmaqdadır ceyb ilə damanlar sənə.
Gülşənə təşrifü nəşr eylə o buyi-kakilin,
Müntəzirdir sünbülü şəbbuvü reyhanlar sənə,
Görməmiş dildarı, ey dil, vəslət isnad etdilər,
Kaş ki, olsun mühəqqəq böylə böhtanlar sənə,
Xidməti-yarə, könül, ta mur tək bel bağladın.
Bəndə oldu mur tək yeksər Süleymanlar sənə.
Gah dərdü, gah qəm, gahi bəla, gahi əna,
Ey könül, hərdəm gəlir yüz tazə ehsanlar sənə.
Ol məhin ləli-ləbindən busə etdin arizu,
Həqqi var kim uddura hər gündə yüz qanlar sənə.
İndi əcrindir, könül, çək şami-hicrin dərdini,
Mən əzəl gün söylədim pəndi-firavanlar sənə.
Seyyida, rəncidə olma cövrü zülmi-yardən,
Ol şəhi-xuban edər hər dəm yüz ehsanlar sənə.

Ol ki, gözlər bir hilaləbruni yüz ümmid ilə,
Rövşən olmaz gözləri aləmdə mahi-eyd ilə.
Bəxtəvər bu çərxi-gərdan kim, keçirdir ömrünü
Hər gecə bir mah ilə, hər gündə bir xurşid ilə.
Mən qədi-canandan ayrı min qiyamət görmüşəm,
Sən məni qorxutma zahid, bunca gəl təhdid ilə.
İxtirai-Cəmdi camü badə, ondan mey içib,
Etməzəm aləmdə işrət minnəti-Cəmşid ilə.
Seyyidi meyxanədən mən etmə kim, etməz qəbul,

Mən bunu tapşırmışam yüz yol ona təkid ilə.

Gəldi göftarə xəyalın dili-divanə ilə,
Ah kim, şəm tutuşdu genə pərvanə ilə.
Olmasa silsileyi-zülfi-siyahın, ey məh,
Mən necə gün keçirim bu dili-divanə ilə?
Hər sitəm eyləyəsən razıyam, ey gül, təki sən
Aşina olmayasan nakəsü biganə ilə.
Tapmadı xanəyi-dil Kəbə təvafında səfa,
Ömrümü qarətə verdim bu siyəh xanə ilə.
Yardən xali görüb bəzmi ayağdan düşdüm,
Saqiya, tut əlimi bir dolu peymanə ilə.
Məst edib bəs ki məni saqiyi-Kövsər həvəsi,
Gəlirəm həşrə dəxi nəreyi-məstanə ilə.
Görələr zövqü səfasını əgər Seyyid tək,
Hurü qılman dəgişər cənnəti meyxanə ilə.

Zahid şərabı kim, görə bu abü tab ilə,
Meyxanədən çıxarmı çəkilsə tənab ilə?
Mən zamini ki, olmaya bir illət ilə fövt,
Hər xəstəyə dava edələr gər: şərab ilə.
hicran həlak edir məni, ver badə, saqiya,
Alsan nolar behişti bu bir cürə ab ilə.
Sordum dəhanüvi, dedi dil, sirri-qeybdir,
Öz əczini büruz elədi bu cavab ilə.
Ruyin yanında zərrə qədər eyləməz nümud,
Yüz gunə çərx özün bəzəsin afitab ilə.
Təfsiri-müshəfi-rüxü rəmzi-dəhanüvi
Zahid bilərmi, şərh edələr yüz kitab ilə?
Seyyidlə razıyam ki, yanam nari-duzəxə,
Getməm behiştə zahidi-alicənab ilə.

Məndən əgər ki ardır, ey simtən sənə,
Tök bir nigəhlə qanımı, qurban mən sənə.
Xövf etmə, öldür aşiqüvi, üzrxah olur
Məhşər günü həm aşiqi-xuninkəfən sənə.
Nazikdir ol qədər bədənin kim, verir müdam
Azar tari-pirəhən, ey gülbədən, sənə.
Ey zülfi-yar, sən həbəşizadəsən, nədir
Bais kim, oldu rövzeyi-rizvan vətən sənə?
Ey çeşmi-yar, sahiri-pürməkrsən əcəb,
Hardan çatıb bu məkrü, bu sehrü, bu fən sənə?!
Seyyid, tutar cahanı kəlamın həlavəti,
Təhsin gər etsə ol büti-şirinsüxən sənə.

Zəmanə qoymadı bir dəm məni nigarım ilə
Ki, xoş keçə günüm ol sərvi-gülüzarım ilə.
İlahi, döndü cigər qanə, bir də görrəm ola
Özümü vəsldə ol sevgili nigarım ilə.
Fəğan ki, sayəsinə həsrət oldum ol sərvin,
Ki, bəsləmişdim onu çeşmi-əşkbarım ilə.
Cüda olurdum o mahi-mələküzarımdan,
Qoyaydı rəşk məni gər öz ixtiyarım ilə.
Dedim ki, Seyyidi qurtar qəmi fərağından,
Dedi: gərək verə can dərdi-intizarım ilə.

Bu nəqsi-hüsn degildir dedimsə mah sənə,
Bu gün tamam bu şəhr əhlidir güvah sənə.
Yetişmədin, sənəma, dadına bir əhli-dilin,
Yazıq o kim ola eşq içrə dadxah sənə.
Həqiqət aləminə qoymadın qədəm, vaiz,
Ki badədən ola ta rəfi-iştibah sənə.
Günah əhlini məyus qılma rəhmətdən

Ki, ta yazılmaya-bu vəchdən günah sənə.
Bəsindi piri-müran iltifatı, ey dili-zar,
Nəzər gər etməsə ol şeyxi-xanəgah sənə.
Üzün kənarını kim, səbzeyi-xətin tutdu,
Lətafət artırıb ey gülrüx, ol giyah sənə.
Nə qəm, pənahım əgər yoxdu dəhrdə, Seyyid, .
Bu bipənahlıq ancaq yetər pənah sənə.

İçib hər şam mey yar ilə, etdim hər səhər tövbə,
Sınar saətbəsaət, şişeyi-meydir məgər tövbə?
Xəyalımdan xütur etməzdi kim, dilbər ola saqi,
Bağışla cürmümü kim, eyləmişdim bixəbər tövbə.
Su içməkdən mənə asandı, saqi, tövbə sındırmaq,
Əlim tut, dur əyağə, cam ver., verməz zərər tövbə.
Bu məşhuri-məsəldir, saqi can, kim ögrənən durmaz,
İnanma gər eşitsən eyləyib meyxarələr tövbə.
Eşitdim tövbə etmiş afitabım, qanə dön, ey dil,
Bu təqrib ilə öpmüş ləli-yarı bəxtəvər tövbə.
Xəyali-ləli-yar ilə həmişə məstəm, ey vaiz,
Nədir vermək mənə meydən dəmadəm bisəmər tövbə.
Əgər əhli-hünərsən tövbədən qıl tövbə, ey Seyyid,
Və gər nə, eyləməzlər badədən əhli-hünər tövbə.

Ey gözün eyni-xuda, «nuni-qələm» qaş sənə,
Verdi öz surətini nəqşdə nəqqaş sənə.
Sənsən ol padşəhi-məsnədi-izzət kim, olub
Rüsüli-sabiqə, yol açmağa fərraş sənə.
Səcdeyi-Adəmə zahirdə olundu təklif,
Endirib aləmi-batində mələk baş sənə.
Xilqəti-xüşkü tərə oldu vücudun bais,
Bəndə-fərmandı bu gün hər quru, hər yaş sənə.
Səngrizə dil açıb oldu güvahi-halın,
Nərm olunsa nə əcəb hər cigəri daş sənə.

Şəbi-meracdə getdin, sənəma, bir yol kim,
Cəbrəil olmadı getməkligə yoldaş sənə.
Ərzi-halımdı sənə suzi-dili-zarımdan
Gözlərimdən tökülüb qanlı axan yaş, sənə.
Seyyid ol gün ki, olub zairi-xaki-hərəmin,
Canını bəzl qılaydı o gün, ey kaş, sənə.

Vaiz məzəmmət eyləməsəydi inad ilə,
Məşhur olurdumu meyi-gülgun fəsad ilə.,
Meyxanə asitanəsini etmərəm əvəz,
Mülki-Firəngü məmləkəti-Keyqubad ilə.
Şuri-məhəbbət olmasa bir kimsədə əgər,
Fərqi nədir, görək ki, o şəxsin cəmad ilə,
Bidust, əhli-eşqə mey içmək həramdır,
Təhqiq olub bu məsələ yüz ictihad ilə.
Seyyid bilir həlal şərab içməgi əgər,
Əhli-behiştdir ölə bu etiqad ilə.

Verdi mey camını saqi genə canan əlinə,
Can fədadır kim, ona canı verib can əlinə.
Oldu, səd şükr, mənə guşeyi-meyxanə məqam,
Düşməyibdir bu sifət mülk Süleyman əlinə.
Adəmin künhünü anlardı, qılardı səcdə,
Düşsə idi mey əgər xülddə şeytan əlinə.
Kaş bir qətrə meyə qiymət olaydı yüz can,
Düşməyəydi bu qədər cahilü nadan əlinə.
Verəcəkdir o büti-kafərə yüz rəğbət ilə
Zahidin gündə əgər düşsə bir iyman əlinə.
Meyə Seyyid kimi mötad ola gər vaizi-şəhr,
Sərf edər badəyə hərgəh düşə Quran əlinə.

Ey qılan bəhs qədi sərv, üzü susən ilə,
O gün olsun ki, gəzim gülşəni hər su sən ilə..
Xəlvəti-xasi-Züleyxadı bu gün bağ məgər
Ki, gözüm gördü o Yusifrüxü pirahən ilə.
Kur olaydı gözüm, ey kaş, bu bağ içrə bu gün
Görməyəydim o pəriçöhrəni Əhrimən ilə.
Könlümün zəxminə müjganı ilə qıldı əlac,
Yarəmi tikdi o xəyyat-pəsər suzən ilə.
Dil dilər ləli-ləbin əmməgi, fəryadə gəlib,
Necə kim, tifl.qılıb şir tələb şivən ilə.
Xaldır ögrədən ol lalərüxə cövrü cəfa,
Nə üçün filfili bəs, xəlq dögər havən ilə.
Gül görüb, yadi-ruxilə məni incitdi könül,
Çıxma, Seyyid, dəxi gül seyrinə hər kovdən ilə..

Nəzr eyləmişəm verməgə can yar gələndə,
Dil şövq ilə qurban ola dildar gələndə.
Can saxlamaram təndə nigarım gələ, bir kəs
Saxlarmı mətaini xəridar gələndə?
Can gəlsə arayə dəmi-vəslində girandır;
Məxmur düşər möhnətə huşyar gələndə.
Mən yanına gəlsəm, tutulur, ol məhi-taban,
Gül tək açılır yanına əğyar gələndə.
Zülfün qəmi bir halə salıbdır məni, ey mah,
Naləm ucalır ərşə şəbi-tar gələndə.
Seyyid, o siyəhzülf düşər xatiri-zarə,
Hər məclis ara söhbəti-əşar gələndə.

Tutdu qərar ta ki, könül zülfi-yardə,

Səbrü qərar qalmadı mən biqərardə.
Bir vədeyi-visalə vəfa etmədi həbib,
Oldu həlak xəstə könül intizardə.
Ey zülfü qarə, qaşlaruva canü dil fəda,
Olmaz bu şiddət ilə kəsər Zülfüqardə.
Zülfü rüxün xəyalı ilə şaddır könül,
Yəni dilər visalüvi leylü nəhardə.
İndi kənardən baxıram yarə, ey fələk,
Hanı o gün ki, var idi mahım kənardə.
Vəslində can yetişsə nola cismi-zarıma,
Əzmi-rəmim zində olur novbahardə.
Vaiz, zülali-Kövsəri vəsf etmə Seyyidə,
Ol gördügün görübdü meyi-xoşgüvardə.

Can yandı şəm tək bu gecə intizar ilə,
Dil ta səhər fəğan elədi ahü zar ilə.
Gər qönçeyi-riyazi-ümidi açılmasa
Könlü açılmaz aşiqi-zarın bahar ilə.
Göz görmək istəməz o güli-tərdən özgəni
Doldursalar cahanı büti-gülüzar ilə.
Olsun həram badeyi-gülgun o rində kim,
Gülşəndə içməyə onu məhru nigar ilə.
Kuyün xəyalı döndəri nari-cəhənnəmə,
Getsəm behiştə gər bu dili-biqərar ilə,
Aruşi-canə tapmadığı vəchdən əlac,
Seyyid qənaət eylədi busü kənar ilə.

Gör ki, tutubdur qələm yer ləbi-canandə,
Sanki bitibdir genə, ney şəkəristandə.
Saldı mürəkkəb məgər arizinə nöqtələr,
Dağ nümayandı ya, laleyi-nəmandə.

Eyləmə, ey gülbədən, məşq «Gülüstanı» sən,
Yoxdu üzün kimi gül hiç gülüstandə.
Eylər idim ruyinə mən də tamaşa onun,
Kağız olaydım əgər zanuyi-canandə.
Kaş olaydım dönüb bir iki dilli qələm,
Ta yer edəydim kəfi-dilbəri-məstandə.
Xətti-şikəstə kimi xətt çıxıb ruyüvə,
Könlümü basdı qübar ol xəti-reyhandə.
Yarə olam həmnəfəs, xoşdu mənə Seyyida,
Sərf ola bu nəhv ilə ömr dəbistandə.

Bu gün ol mahi-gülçöhrə gəlibdir seyri-gülzarə,
Görüb ruyi-ərəqnakın gəlir gülşəndə gül zarə.
Güli-rənadən artar bağə zivər, bu əcəbdir kim, .
Güli-rüxsari-zibası veribdir ziyb gülzarə.
Çəməndə əndəlibin könlünü qan etdigiçün gül,
Gülabın şişəyə əttar tutdu, çəkdi bazarə.
Çəkir. yüz xəncəri-xunriz qanın tökməgə hərdəm,
Nə etmiş bülbül, aya bilməzəm, xari-dilazarə.
Dili-səxtinə təsir etmədin ol mahi-bimehrin,
Məgər, ey naleyi-şəbgir, bir gün gəlməsən karə!
Deyərdim kim. dəhani-yarə var filcümlə oxşarı,
Əgər bir nitq açıb yoxdan gələydi qönçə göftarə.
Yetirdi mücdə güldən bülbülə badi-səba, Seyyid,
Pəyami-vəsl xoşdur yetsə hərgəh yardən yarə.

Vaiz, demə kim, zail edər əqli piyalə,
Billah ki, piyalə gətirir mərdi kəmalə.
Sən özgə günah eyləmə, iç badeyi-gülgun,
Ondan nə günah olsa, mənə eylə həvalə.
Mən müctəhidi-əsr, cahan əhli müqəllid,
Təcviz-meyi-nabə yazıldı bu risalə.

Xətdirmi tutan dövri-rüxi-dilbəri, ya kim,
Müşk ilə çəkildi genə ay dövrünə halə.
Nazikdi gül, əmma hanı güldə bu lətafət,
Ey «səlli əla ali-Məhəmməd»[1] bu cəmalə.
Əhd eyləmişəm, könlümü zülfündən alan gün,
Qurban eləyim guşeyi-çeşmindəki xalə.
Seyyid, dəhəni-yardən etmə bu qədər bəhs,
Yoxdan nə danışmaq, nə düşürsən belə qalə.

Mənə mehman idi ol sərvi-xuraman bu gecə,
Məhfilim olmuş idi rəşki-gülüstan bu gecə.
Həmdəmim hur idi, camımda şərabım Kövsər,
Mənzil olmuşdu mənə rövzeyi-rizvan bu gecə.
Zülməti-zülfdə gördüm dəhəni-yarı genə,
Xızra əl vermiş idi çeşmeyi-heyvan bu gecə.
Nisfi-şəbdə mənə həmbəzm idi ol qaşı hilal,
Bəzmdə durmuş idi san məhi-taban bu gecə.
Dəhəni-yar xəyalilə yox idi varım,
Var idi bəzmdə çox nükteyi-pinhan bu gecə.
Ləhni-Davudi ilə könlümü aldı ol şux,
İltifat etmiş idi murə Süleyman bu gecə.
O meyin qətrəsi yüz ləli-Bədəxşanə dəgər
Ki, dəgərdi. ona hərdəm ləbi-canan bu gecə.
Seyyid, ol Kəbeyi-hüsn ilə ki, oldum həmdəm,
Kaş olaydım, dolanıb başına, qurban bu gecə.

[İstinad1: Məhəmməd və ailəsinə salam olsun]

Ayinəsin siyah elədim dudi-ah ilə,
Var həqqi töksə qanımı gər bu günah ilə.
Ayinədir cəmalı o simintənin, vəli .

Vaqe olur şikəst ona səngi-nigah ilə.
Xalın gətirdi xətti-siyahı üzarüvə,
San tutdu mülki-Rumu Nəcaşi sipah ilə.
Ey kaş olmayaydı səhər, çıxmayaydı gün,
Ovqatımız keçəydi bu gün üzlü mah ilə.
Qanimi tökdü qəmzəsi, şahiddi gözləri,
Qazi, sözün nədir iki adil güvah ilə.
Çəkdim bir ah kim, yana ol şölədən rəqib,
Öz xirmənimi yaxdım özüm bərqi-ah ilə.
Seyyid, iradə eyləmə dildar bəzminə,
Mümkün degil gəda ola həmbəzm şah ilə.

Eylə bildim edərəm tab qəmi-hicranə,
Dönəcəkmiş, nə bilim, hicrdə könlüm qanə.
Ey dilim, lal olasan, bilməyirəm kim, nə dedin,
Aşina könlünə dəgdin ki, olub biganə.
Vaqe oldu genə bir busədən ötrü şəkərab,
Od tutub yandım, özün çəkdi çü məndən yanə.
Ol Əzizin verirəm çahi-zənəxdanına dil,
Öz əlimlə salıram Yusifimi zindanə.
Yüz cəfa eyləsən, ey şux, könüldür razi,
Neyləsin bəndəsi, sultandan olan fərmanə.
Məni bu şəhrdə bir mahliqa etmiş əsir,
Salıb əbruyi-hilalı işimi nöqsanə.
Əqldən laflar eylərdi bu Seyyid, əmma
Görcəgin silsileyi-zülfün olub divanə.

Ləlin ki, bəhslər qılır abi-həyat ilə,
Xızri-könül dəgişməz onu kainat ilə.

Şəkkər ləbindi daim olan quti-ruhumuz,
Bir tutiyik ki, etmişik adət nəbat ilə.
Föhşündü təyyibat mənə, ey şəkərdəhən,
Al könlümü həmişə belə təyyibat ilə.
Ol xirməni-süreyn ki, var səndə, ey pəri,
Yüz il məni dolandırısan bir zəkat ilə.
Bir büt xəyalı eyləyib aşuftə könlümü,
Ömrüm keçər zəmanədə Latü Mənat ilə.
Fərzini-əql mat qalıb qıldı səcdələr,
Ol şahi-tacdari-rüxün görcək at ilə.
Düşnam verdi Seyyidə sultani-gülrüxan,
Şad etdi öz gədasını bu iltifat ilə.

Dedim, ey sərvi-rəvan, gül kimi xəndan gəzmə,
Eyləyib laləsifət bağrımı gəl qan, gəzmə.
Degiləm, iki gözüm olsa da, mən xatircəm,
Ey gözüm nuri, gözümdzn belo pinhan gəzmə.
Xatəmi-ləlüvə ta yetməyə Əhrimən əli,
Ey pəri, yarın əgər olsa Süleyman, gəzmə.
Çıxma yarım, gecələr tışra sən əğyar ilə,
Qorxuram hüsnüvə, ey məh, yetə nöqsan, gəzmə.
Danışırlar hamı, el ağzını tutmaq olmaz.
Ey güli-qönçədəhən, xar ilə hər yan gəzmə.
Faş olan nüktədi qeyr ilə dəhanıi sirri,
Sanma ol nüktə səri-mu qala pinhan, gəzmə.
Getmə cəmiyyəti-əğyarə sən, ey zülfi siyah,
Seyyidi-zarı edib halı pərişan, gəzmə.

Xali-ənbərşikən ol arizi-gülnar üzrə,
Bənzər ol nöqtəyə kim, nəqş ola rüxsar üzrə.
Görcək ol surəti-zövqavəri qaldım heyran,

Döndüm ol surətə kim, nəqş ola divar üzrə.
Bavər etməm desələr sudə bitər niylufər,
Xətti-niylufərini gör rüxi-gülnar üzrə,
Şəkər üstündə məgəs, ya ki, od üstündə sipənd,
Daneyi-xaldı ya, ləli-şəkərbar üzrə.
O şəhin tutdu bəyazi-rüxünü xətti-qübar
Ya ki, fərmandı çıxıb qətlimə tumar üzrə.
Ləbləri busəsinə mane olub ləşkəri-xət,
Zəngibar əhli hücum eylədi zəvvar üzrə.
Seyyidin qoymasa üz gər üzünə vəchi budur,
Nə rəvadır ki, qoya bərgi-gülü xar üzrə.

Genə həmbəzm idim ol zülfi-siyəhtarım ilə,
Sanki merac eləmişdim bu gecə tarım ilə.
Nisfi-şəbdir gəlib ol mahi-təmamım bu gecə,
Nola kim, qoysa fələk sübhə çıxam yarım ilə.
Eylədin varımı yox, ey dəhəni-yar mənim,
Sənə qurban mən olum cümlə yoxü varım ilə.
Şöleyi-duzəxi bir mövclə xamuş eylər,
Gər gələm məhşərə bu dideyi-xunbarım ilə.
Dili-bimarə edər cövrü cəfa məst gözün,
Nə ədavətdi o türk etdi bu bimarım ilə.
Ruzi-məhşərdə bir əsbabi-şəfaətdi mənə,
Eyləsən dəfn məni pərdeyi-zünnarım ilə.
Bisəbəb verməmişəm qürbətə dil, ey Seyyid,
Qoymadı rəşk vətəndə məni dildarım ilə.

O rənci dil ki, çəkir çini-zülfi-pürxəmdə,.
Ki çəkməyib onu xaqan kəməndi-Rüstəmdə.
Görə behişti-cəmalında gəndümi-xalın,

Qərarü səbrü təhəmmül qalarmı Adəmdə?
O şövq kim. mənə zəxmi-xədəngi-yar verir,
Cahanda görməmişəm ani hiç mərhəmdə.
Ümid var qutaraq atəşi-fərağından,
Məhəmməd ümmətiyik, qalmarıq cəhənnəmdə..
Sənə mənim təki, ey dust, bir gəda olmaz,,
Əgərçi, padşəhim, çoxdu Seyyid aləmda.

Mən dedim dilbərə qıl cövrü cəfadən. tövbə,
Gör ki, təsiri-nəfəs qıldı vəfadən tövbə.
Zülfi-müşkinüvə kim, nafeyi-Çin söyləmişəm.
Tövbə, ey gözləri ahu, bu xətadən tövbə.
Buriya üzrə oturma, bu riyadən bir usan,
Oğlun ölsün, elə zahid, bu riyadən tövbə.
Təngdil etmiş imiş Xızrı qəmi-tənhayi,
Dün gecə gördüm edib abi-bəqadən tövbə.
Yox imiş xəlvəti-yarə yolu, getdim gördüm,
Eylədim həmdəmiyi-badi-səbadən tövbə.
Şürbi-mey, tövbə, müqəffa görünüb bir-birinə
Qorxma, mey iç, elə mən kimi qəfadən tövbə.
Hər işindən eləyə tövbə, yəqindir, Seyyid
Çəkməz əl badədən, etməz bu ədadən tövbə.

Fələk ədavət edər xatiri-müşəvvəş ilə,
Bular nə kinədi bu aşiqi-bəlakəş ilə.
Bu rəsmdir ki, pəri mərdümə əyan olmaz,
Gözüm, nə vəsl təmənnadır ol pərivəş ilə.
Üzündə iqdi-ərəqdən təəccübüm artar,
Ki ab saziş edibdir nə gunə atəş ilə.

Üzündü bağı-cinan, zülf xüld tavusi,
Açıbdı çətr, gəzər şəhpəri-münəqqəş ilə.
Üzün, gözün, dəhənin, qamətin, iki zülfün,
Müsəxxər eyləmisən şeş cəhati bu şeş ilə.
Qərarü səbrü dilü tabü taqətim aldın,
Bu nərdi-eşqdə mən oynadım şeşü beş ilə.
Rəfiq yoxdur ola qəşşi-eşqdir xali,
Keçir həyatuvi, Seyyid, şərabi-biqəş ilə.

Əlində yar gəlib məclisə əyağı ilə,
Yetişdi qismət olan seyd öz ayağı ilə.
Veribdi qanını könlüm o çeşmi-xunxarə,
Binayi-sülh qoyubdur dəxi o yağı ilə.
Ucaldı şöleyi-ahım fələklərə, ey məh,
Könül gəzər səri-kuyində öz çırağı ilə.
Məni ayırmaya həq, zahid,. ol səri-kudən,
Yeri, mənim nə işim var behişt bağı ilə.
Görəndə qamətüvi seyrgahi-gülşəndə,
Xəcalətindən o, gün sındı gül budağı ilə.
Düşər o xali-siyəh yadə, dağidar ollam,
Görəndə laləni mən dağdə bu dağı ilə.
Zəmanədə sənə, Seyyid, vəfalı yar olmaz,
Əgər yüz il gəzəsən bir gülün sorağı ilə.

O məhvəşin ləbi-ləlin şərabə bənzətmə,
Şərabi-nabi, könül, sən sərabə bənzətmə.
Üzü yanında onun mehr zərrədən kəmdir,
Utan, könül, bu üzü afitabə bənzətmə.
Yeri var etsə o xurşidrüx, könül, səni qan,.
Dedim ki, ləblərini ləli-nabə bənzətmə.
Cəmalı kim, xəti-reyhan ilə müzəyyəndir,.
Səvadə gəl, bunu sən bir kitabə bənzətmə;.

O gül cəmalına həsrətlə ağlayan gözümün
Sirişki-alını, ey gül, gülabə bənzətmə.
həvayi-eşqlə məmlüvv olan dili-zari,
Bu bəhri-eşqdə rəngin hübabə bənzətmə.
Çalar səni, o siyəh zülfünə demə əqrəb,
O dilbərin üzünü mahtabə bənzətmə.
Gətirdi başıma, Seyyid, qədi qiyamətlər,
Bu qəmli günləri yovmül-hesabə bənzətmə.

Əzbəs ki, könlü qarət edibdir cəfa ilə,
Qəmgin olur o məhdən olan bu vəfa ilə.
Mazi keçib, müzariə yoxdur ümidimiz,
Saqi, bu halı, bari, keçirdək səfa ilə.
Tumar edib bu hali-dilazari-möhnətin,
Göndərmişəm xəbər ona badi-səba ilə.
Düşnam verdi, təlin açıb gərçi dilbərim,
Sandım ki, hali-zarımı sordu dua ilə.
Aşüftə zülfi-yarımı müşki-Xəta dedim,
Aləm yanında rusiyəhəm bu xəta ilə.
Qılmanü hurü bağı-cinan, zahida, sənin,
Meyxanədə təki olum ol dilrüba ilə.
Zahid Mənatü Latü Həbəldən götürməz əl,
Seyyid gələr qiyamətə Ali-əba ilə.

Ruyi zibaləndi yarın xətti-ənbərfam ilə,
Çöhreyi-xurşidə zinət oldu tirə şam ilə.
Gözlərin vəsfində bir söz yazmaq üçün şamlər,
Eylərəm rövşən çırağım rovğəni-badam ilə.
Kəbə rüxsarın, həcər xalındı, xəttin hacılar,
Kəbəyə ərablər gəlmiş qara ehram ilə.
Qaşını gördüm o mahın, eydi-əzəmdir bu gün,
Könlümü şad et, xudaya, gündə bu bayram ilə.
Aşiqi-rüxsari-yarəm, din nədir, iyman nədir,
Nə rücuum var mənim, küfr ilə, ya islam ilə.
Ayə oxşatsam üzari-yarı nöqsandır mənə,

Bir tərazuyə girərmi yar, hər nəmmam ilə.
Yarımın əndamını Seyyid demiş bir simi-xam,
İddəası var ola şair bu təbi-xam ilə.

Məlalü möhnətimin fərqi var sitarə ilə,
Nücum əhli qılır həsr onu şümarə ilə.
Üzündə xali-siyəh var o mahi-bimehrin,
Zühəl qiran eləyib ya ki, bir sitarə ilə?
Atıb xədəng oxunu yarə vurdu üşşaqə,
Nə gunə eyləməyim nalə mən bu yarə ilə.
Alıb, görün, əlinə tari-zülf təsbihin,
Şüru qətlimə eylər bu istixarə ilə.
Nə bilsin eşq işini eşqə düşməyən kimsə,
Bilərmi bəhr qəmin seyr edən kənarə ilə.
Degil sitarə, fələk üzrə ahlər çəkibən
Sipehri eyləmişəm rövşən ol şərarə ilə.
Mənim zəmanədə, Seyyid, nə idi nöqsanım,
Günüm keçəydi gər ol şuxi-mahparə ilə.

Həşrdən söylər, salıb vaiz qiyamət məscidə,
Yoxsa gəlmişdir bu gün ol sərvqamət məscidə?
Qaməti-mövzuni-yarimi görüb vaiz məgər
/*
Kim, qiyamətdən olur zahir əlamət məscidə?
Guşeyi-mehrabdə ol büt açıb rüxsarını,
Göstərir hər ləhzə yüz kəşfü kəramət məscidə.
Virdi «qəd qamət» olub təkbirxanın müttəsil,
Ta verə zövqü səfa ol qəddü qamət məscidə.
Titrəşir simab tək ayineyi-ruyin görüb,
Qalmadı əsla binayi-istiqamət məscidə.

Vaizin həqqində mən meyxanədə etdim dua,
Var ümidim kim, dəxi gəlməz səlamət məscidə.
Seyyida, bu zahidi məsciddən ixrac eyləyin
Kim, salıb bayquş tək asari-şəamət məscidə.

Ey badi-səba, kuyi-həbibə güzər eylə,
Hali-dili-zarimi o şahə xəbər eylə.
Qürbətdə pərişanlığımı zülfü qəmindən,
Tul eyləmə, ol sərvqədə müxtəsər eylə.
Axır məni-zarı dəri-dilbərdən ayırdın,
Ey çərxi-cəfacu, məni az dərbədər eylə.
Ahi-səhərim qübbeyi-əflakə ucaldı,
Bu navəki-xunrizdən, ey gül, həzər eylə.
Əgləşməyə ta xaki-rəhi dideyi-qeyrə,
Ey göz, tökübən əşk qübarını tər eylə.
Bəsdir mənə bu təlxiyi-hicran, ləbindən
Get özgələrin kamını sən pürşəkər eylə.
Səbr eylə dedin, vəslə əlac olmadı, Seyyid,
Rəf etməyə bu firqəti fikri-digər eylə.

İstəyir şəhrdən ol dilbəri-məhparə gedə,
Günümü hicrdə zülfü tək edib qarə gedə.
Bu xəbərdən ki, gedib yar, ürəgim getdi mənim,
Ah o gündən ki, müqabildən o məhparə gedə.
O kaman qaş nola kim, tiri-nigahilə məni
Bir səvab eyləyibən öldürə, qurtarə, gedə.
Axıb, ey qanlı yaşım, yolları məsdud eylə,
Qoyma kim, bir tərəf ol dilbəri-xunxarə gedə.
Qorx o gündən ki, o məhparə fərağında, fələk
Badə ahımla mənim sabitü səyyarə gedə.

Çəkə zənciri-səri-zülfə dili-şeydanı,
Qıla bu Seyyidi-divanəyə bir çarə, gedə.

Ləli-meygunun, nədir, düşmüş siyəh xal üstünə,
Ya ki, şəkkərdir dəhən, qonmuş çibin bal üstünə.
Ruyi-gülgununda, ey gül, ol xəti-mişkin degil,.
Ayeyi-nuri yazıblar kağəzi-al üstünə.
Saqiyi-gülçöhrəmiz hal əhlidir, vardır ümid,
Bəzmimiz ahəstə-ahəstə gələ hal üstünə.
Dövləti-üzmayə yetdi halın, ey göz mərdümü,
Gör, hüma kimi açıb zülfün pərü bal üstünə..
Arizi-gülgunin eylər ğazə ilə laləreng,
Artırır bir al hərdəm, ol pəri, al üstünə. •"
Bəxtimin güzgusinə üz verdi, ey məh, tirəlik
Düşdü zülfün çün rüxi-ayinətimsal üstünə.
Bilməgə eşqində əhvalım, qaraçılar kimi, •
Müshəfi-rüxsardən zülfün açıb fal üstünə.
Seyyida, çıxmış dilü can yarın istiqbalına,
Kövkəbi-bəxtin gəlir, zahir ki, iqbal üstünə.

Xoş keçəydi günüm ol mahi-vəfadar ilə,
Nə işim var idi qürbətdə bu azar ilə.
Könlümə gəlsə xəyalın həsədimdən ölərəm,
Necə mümkündü səni bəs görüm əğyar ilə.
Dəhənin qıldı vücudumu ədəm, varımı yox,
Quru sözdən nə çıxar,dəvi olur var ilə.
Yardən arılanı var rəqibə meylim,
Gülü bülbül itirib, həmdəm olub xar ilə.
Nəçiyəm mən ki, olam məclisi-yarə məhrəm,
Razıyam keçsə gün ol sayeyi-divar ilə.
Aşiqəm bir gülə kim, yoxdu gülüstan içrə,
Bağibana, nə işim var dəxi gülzar ilə.

Zülfi-yarın bu qədər vəsfini eylər Seyyid,
Eylə bilmiş ki, yetər vəslinə əşar ilə.

İstər aç mahi-rüxün, istər nihan et naz ilə,
Tək günüm keçsin mənim sən dilbəri-tənnaz ilə.
Ey xoş ol günlər ki, bimi-təneyi-əğyardən,
Ziri ləb bir söz dedin, məndən ötürdün naz ilə.
Sən məgər İsayi-ruhullahsən, ey ruhi-pak ,
Kim, ləbin əmvatlər ehya qılır ecaz ilə.
Dil səfi-müjganüvün məcruhu oldu aqibət,
Bir kəbutər neyləsin yüz çəngəli-şəhbaz ilə.
Harda qalmış, görmədim Fərhadi-şeydadən əsər,
Qəbri-Şirin üzrə yüz yol səslədim avaz ilə.
Verdim iman nəqdin, aldım, dustlər, bir şişə mey,
Çox giranqiymət şey aldım, bir bəhayi-az ilə.
Zahid ilə cənnətül-məvayə getməkdən, genə
Xoşdu yanmaq duzəxə Seyyid kimi dəmsaz ilə.

Nə lətafətdi bu, ey şuxi-güləndam, sənə,
Nə səfadır ki, verib badeyi-gülfam sənə,
Sünbülüstani-müjəndə iki çeşmindimi, ya
Xütən ahuləri, ey şux, olub ram sənə.
Nə rəva cami-bilurin yetə nazik ləbüvə,
Bərgi-güldən gərək olsun, gözəlim, cam sənə.
Xalın oxşar həcərə, Zəmzəmə çahi-zənəxin,
Yeri vardır desələr qibleyi-islam sənə.
Bədənin sim bilib müştəri oldu çoxlar,
Etdi aşiqlərin, ey məh, təməi-xam sənə.
Ey könül, qədrini bil oxlarının sinəmdə,
Edib ol qaşı kaman bunları ənam sənə.
Seyyid, ol mah sənin qətlüvə iqdam etdi,
Gedib öz çarəni qıl, eylədim elam sənə.

Nolaydı bəzmimə ol gülüzar bir də gələ,
Şükufələr açılıb, novbahar bir də gələ.
İyadət etdi, məni-nimcan-şəfa tapdı,
Nola iyadətimə ol nigar bir də gələ.
Xədəngü tiğü sinanü kəmənd ilə ol şux,
Əlində qətlim üçün hər çəhar bir də gələ.
İçə şərabı o. ruhi-rəvan, ola məxmur,
O məst gözlərə tazə xumar bir də gələ.
Nola bahar gəlib açılaydı bağdə gül,
Bu bağə bülbüli-biixtiyar bir də gələ,
Nihani qəmzələri canım aşikar aldı,
Nolur o gənci-nihan aşikar bir də gələ.
Sirişki-çeşm töküb ağla yar üçün, Seyyid,
Bu arxa su gəlib, ümmid var bir də gələ.

Hər zəmani kim, gəlir ol qaməti-dilcu gözə,
Ta ayağın öpməgə naşi olur yüz mu gözə.
Gözlərim fikri-miyanınla olubdur əşkbar,
Su olur gözdən rəvan, ari, düşəndə mu gözə.
Xəttüvə baxdım, gözümə gəldi su dəryayi-Nuh,
Ari, müşküldür əlacı, ensə qarə su gözə.
Yandıra hindu özün narə, inanmazdım, vəli
Xalını gördüm od içrə, gəldi bir hindu gözə.
İstərəm ayinədə çeşmim görə əksin, vəli
Xiyrə eylər gün şüailə düşən güzgu gözə.
Mən kimi bir qarəbəxt adəm, pərişanruzgar,
İstərəm görmək üzün ilə gələ geysu gözə.
Gözlərin pinhan verir sirri-dəhanından nişan
Göstərir hər iş ki yoxdur, var tək cadu gözə.
Gün şüai var ikən mümkün degil görmək hilal,,

Seyyida, zövi-rüxilə gəlməz ol əbru gözə.

Gördüm ayi, dedim, ey gül, görüm ayi nə ilə?!
Açdı rüxsarını, bax gör, dedi, ayinə ilə.
Şəbi-adinə gəlib bəzmimizə yar, degil
Leylətül-qədr bərabər şəbi-adinə ilə.
Baxdı ayi görüb ol şeyx ki, yarın üzünə,
Bilmədim heyf ki, ol gördü bu ayi nə ilə.
Ləfzi-hər ayinədir vaizi-şəhrin süxəni,,
Vəz bir ay qılır, ləfzi-hərayinə ilə.
Seyyida, eyləmə zən-təblər ilə ülfət,
Heyfdir sərf ola ömrün bu məlainə ilə.

Səd şükr, könül, yetdi əlin daməni-yarə,
Hicran. oxu hərçənd vurub qəlbüvə yarə.
Ey xəstə könül, səbr elə əyyami-xəzanə,
Gər ölməsə bülbül yetişər fəsli-baharə.
Sordum ki, gözüm nuru, siyəhpuş neçinsən,
Güldü, dedi ki, Kəbə gərəkdir geyə qarə.
Bir sağər ilə saqi məni saldı ayaqdan,
Ya rəb, nə olur halım əgər versə dübarə.
Cam içrə görüb əksüvi çox xam-təmələr,
Peyvəstə düşüblər həvəsi-busü kənarə.
Ey ruhi-rəvan, mən edərəm can sənə təslim,
Gər guşeyi-əbru ilə etsən sən işarə.
Gör rəşkimi kim, istəyirəm gözlərimi kur;
Səd heyf, sənə eyləsə əğyar nəzarə.
Ey qaşı kaman, kiprigi ox, sinəmə .bir bax, .
Ulduzları saymaq olu, yox zəxmə şümarə.
Həm vəsldə, həm hicrdə varındı şikayət,
Ey Seyyidi-sərgəştə, nədir bəs sənə çarə?

Cəfadı karı deyib ol nigarı qoyma gedə,
Əlindən ol sənəmi-gülüzarı qoyma gedə.
Nə etibar ki, səyyadə bir də ram olsun,
Çəkib kəməndüvə sal ol şikarı, qoyma gedə.
Əgərçi yar deyir qoy gedim, genə gəlləm, .
Yalandı, yox sözünün etibarı, qoyma gedə.
Dedi fəqih mənə, getmə yar kuyinə,
Dedim bacarsan əgər ixtiyari qoyma gedə.
Yapış o türrəyə kim, tarı rişteyi-candır,
Könül, bu gün səni tarı, o tarı qoyma gedə.
Gedər bahar hamı; yarü sağərin, ey dil,
Ayıl, bu qəflət ilə novbaharı qoyma gedə.
Dəhanı sirrini məxfi dedim sənə, Seyyid,
Dəxi budur sözümün aşikarı, qoyma gedə.

Ol ahugöz, işi gərçi cəfadı, qoyma gedə,
Fəda cəfasına, eyni vəfadı, qoyma gedə.
Dəxi kəməndüvə düşməz bu növ türfə şikar,
Könül, bu, ahuyi-dəşti-Xətadı, qoyma gedə.
Əgərçi can alıban. busə versə ləlindən,
İtirmə fürsəti, çox az bahadı, qoyma gedə.
Aparma xaki-dərin gözdən, ey sirişki-tərim,
Cila verən gözə bu tutiyaydı, qoyma gedə.
O Kəbənin bata gər payüvə muğilanı,
Dönüb dolan başına, çox səfadı, qoyma gedə.
Keçər cigərdən, otur tut o qanlı peykanın,
Könül, qədimi olan aşinadı, qoyma gedə.
Əgərçi qalsa könül, yar qətli-am edəcək,
Təvəhhüm eyləmə, Seyyid rizadı, qoyma gedə.

Saldı yarın güli-rüxsarəsinə mu sayə,
«Lən tərani»lə xitab oldu genə Musayə.
Turi-Sinayi-rüxün tutdu müğilan kimi xət,
Genə möhtac olacaq həftədə bir musayə.
Məktəbi-eşqdə İsa sənə oldu şagird,
Verdi təlim ləbin möcüzələr İsayə,
Dili-divanə o zülfündə xətalər çəkdi,
Hiç lütf eyləmədin bu dili-qəmfərsayə.
Seyyidə eyb eləmə bağlasa zünnar əgər,
Çün veribdir ürəgin bir sənəmi-tərsayə.

Tərazu əldə düşdü gözlərim ol mahi-tabanə,
Təsəvvür eylədim ki, mehr gəlmiş bürci-Mizanə.
Düşəydi kaş çeşmin kəffəsilə yar dəstindən
O daşlar kim, əlinə vəzn üçün almışdı cananə.
Enibdir Zöhrəvü Xurşidü Mahü Müştəri gögdən,
Olublar müştəri ol mahə, üz qoymuşla dükkanə.
Süleyman dəhrdə zənbilbaf oldu bu mənadən
Ki, ta əsbabi-sənət olsun ol mahi-şəbistanə.
Gəlib bazarə bir Yusif ki, görsə ruyi-zibasın
Dəxi Yəqub etməz arizulər mahi-Kənanə.
Əsəl xahiş qılan şəxsə nədir bais satar sirkə,
Olur ol gül türüşru aşiqi-məhcuri-nalanə.
Küçüklər hürməgin behtər bilər gərçi atasından,
Vəli əhli-nəzər etmiş hesab ol əmrin əfsanə.

Görən zülfi-siyahın üzdə, söylər müşki-tərdir bu,
Çəkən rüxsarüvi ağuşi-canə bəxtəvərdir, bu.
Könül kim oldu, ey gül, bəsteyi-zülfi-pərişanın,
Xətadən xali olmaz, fitneyi-dövri-qəmərdir bu.
Mütəvvəl macəralər çəkmişəm zülfün bəlasından,
Bular kim etmişəm təhrir, şərhi-müxtəsərdir bu.
Nə sud ondan ki, sənsiz badeyi-gülguna meyl etdim,
Əlimdə sağəri-səhba dögül, xuni-çigərdir bu,
Sərasər şəkvədir nəzmin fəraqi-yardən, Seyyid,
O məsti-hüsnə, hüşyar ol ki, yetsə dərdi-sərdir bu.

Edibdir nafə tək qan könlümü bir gözləri ahu,
Yetiş fəryadıma, rəhm eylə «yamən leysa illa hu»[1].
Oğurlar buyi-zülfün nəqdi-canü huşumu hərdəm,
Səyasət qıl, ədalət şahısan, layiq degildir bu.
O sərvi-gülüzarım halımı görcək olur xəndan,
Tökər hər yan gözüm sulər, axar qanlı yaşım hər su.
Gözüm kim, rövşən idi neçə gün bərqi-cəmalündən,
Qaraldı ruzgarım firqətindən, ey siyəhgeysu!
Verir əngüşt ilə mərdüm nişanə bir-birə, indi
Məni aləmdə saldı abirudən bir hilaləbru.
İşin daim cəfavü cövrdür, bidad üşşaqə,
Sənin tək dilşikən yarı, nigarım, kim demiş dilcu?
O zülfün macərasın mu-bə-mu şərh etməgə Seyyid
Qələm tək dillər açmış aləmə, ey mahi-müşkinmu.

[İstinad1: Ondan başqa heç kəs yoxdur. ]

Nə nəzakət, nə vəcahət, nə məlahətdir bu,

Kördü rüxsarüvi hər kəs dedi: cənnətdir bu.
Fitnələr düşdü cahanə qədi-mövzunundan,
Vəh, Nə qamət, nə səbahət, nə qiyamətdir bu.
Etmədin aşiqə lütf etməyi adət bir dəm,
Ey şəhi-mülki-cəfa, səndə nə adətdir bu?
Can verib, vəslüvə yetmək ola məqdur əkər,
Ey fəda can sənə kim, canıma minnətdir bu.
Çeşmi-xunxarı tökə qanüvi, ey dil, şükr et,
Sənə var mərhəməti, eyni-inayətdir bu.
Demədimmi sənə mən eşqdən, ey dil, həzər et,
Düşmüsən indi qəmü dərdə, nə halətdir bu?
Kenə can tazələnir şeri-şəkərbarındap,
Seyyida, şer dekil, kəşfü kəramətdir bu.

Buyi-zülfün sənə tapşırdı o müşkin-geysu,
Səndə, ey sünbüli-pürtab, əmanətdir bu.
Gərdənindir bu bəyazətdə və ya sineyi-baz,
Bu lətafətdə süreynindi və ya kim, pərqu?
Hanı bir kanda ləbin kimi əqiqi- Yəməni,
Hanı dəndanuva bənzər sədəf içrə incu?
Hanı ol o gün ki, olam yar ilə bir gülşəndə,
Düzülə dövrəmizə çəngü sürahivü səbu.
Eylədi seyd gözün könlümü, ey qaşı kəman,
Bu əcəbdir ki, qılar şir şikarın ahu.
Zindədir kim ki, yetişsə ləbi-dildarə, əbəs
İstəyir Xızr bəqa suyunu, gəzdi hər su.
Xaldır arizi-dilbərdə və ya kim, Seyyid,
Bağiban gülşəni-Firdovsə olubdur hindu?!1

Həlqeyi-silsileyi-zülfi-pərişandır bu,

Bağı-cənnətdə bitən sünbülü reyhandır bu.
Rüxi-ziybayə düşüb rişteyi-zülfi-siyəhin,
Cənnətə daxil olub, yoxsa ki, şeytandır bu.
Neyləyim, yoxdu səvadım, nə bilim mənasın,
Xət gəlib arizüvə, ayeyi-Qurandır bu.
Qazədən arizi-dilbər ki, olubdur gülgun,
Dağılıb müshəfə ya kim, dəmi-Osmandır bu?
Bağdə yüzdən açan dəmdə niqabın, qönçə
Qalıb ağzı açıla, hüsnüvə heyrandır bu.
Bu qədər cövrü sitəm aşiqə etdin, bəsdir,
Ey pəri, daş degil, rəhm elə kim, candır bu.
Ala bir yerdə ki, xurşid üzündən nurin,
Gər desəm aydı cəmalın, mənə nöqsandır bu.
Dəmi-tiğində olur zində dili üşşaqın,
Məgər, ey Xızr-xətim, çeşmeyi-heyvandır bu.
Bu gecə eyləmişəm övci-Sürəyyadə məqam,
Nəzərə oldu müsəvvər məhi-tabandır bu
Bəs ki can verməyə şəmşirüvə mən müştaqəm,
Qaşların qanımı töksə, mənə ehsandır bu.
Baxmağa əşkimə səyyarələr oldu sabit,
Qabili-dövr degil, halıma heyrandır bu.
Bu qədər bütlərə kim səcdələr eylər Seyyid,
Deməz iymanı olan kəs ki, müsəlmandır bu.

Degildir sağər içrə badə, yaquti-rəvandır bu,
Məsihi-ruhpərvərdirmi, ya quti-rəvandır bu?
Dili-məcruhuma bunca cəfalər bəsdir, ey zalim,
Degil fulad, axır, rəhm qıl, bir qətrə qandır bu,
Vücudum fani oldu həsrəti-təngi-dəhanından,
BU dərdi kimsəyə faş etmədim, sirri-nihandır bu.
Gözüm xunabi dildən zahir eylər zəxmi-pinhanı,
Nə hacət halımı sormaq, sirişkimdən əyandır bu.
Usan kim, cismü canım bunca nari-hicrə yandırdın,
Degildir səngü ahən, zalım oğlu, cismü candır bu.
Rəqib etmiş şəfaət yarə məndən, vamüsibət kim,
Yamandan yaxşılıq kər sadir olsa, həm yamandır bu.
Əgər Seyyid sənə söylərsə kim, canım fəda qıllam,
İnanma şairin göftarına, billah yalandır bu.

Dün dolandım başına, söylədi pərvanədi bu,
Zülfün aldım əlimə, güldü ki, divanədi bu.
Həlqeyi-zülfdə gör xali-siyahın, ey dil,
Birisi dami-bəladır, birisi danədi bu.
Arizi-yarıma bax, yoxdu gər əqlində qüsur,
Vaiza, vəsfi-behişt eyləmə, əfsanədi bu.
Sanma məscid kimi, bisidqü iradət gəlmə,
Ey gözüm, gözlə ədəb, guşeyi-meyxanədi bu.
Bu degil pərdeyi-Üşşaqü Nəhavəndü Hicaz,
Qülğülə ərşə salan nəreyi-məstanədi bu.
Uyma zəntəblərə, tut şəhi-Mərdan yolunu •
Ələ al sağəri-mey, məşrəbi-mərdanədi bu.
Seyyida, çək gözə eyvani-tila sürməsini,
Can yetib kamına kim, mənzili-cananədi bu.

Kim ki, meyxanəni bu dəhrdə bünyad etdi,
Həqq onu şad edə kim, aləmi dilşad etdi,
Seyli-qəm etmiş ikən aləmi-imkanı xərab,
Rəhmət ol şəxsə ki, meyxanəni abad etdi.
Bəndeyi-piri-müğanəm ki, inayətlər edib,
Özlügümdən məni bir cam ilə azad etdi.
Zahida, düxtəri-rəz ümmi-fəsad isə əgər,
Nəxli-ənguri neçin həqq özü icad etdi?
Hamı məscid tərəfə getsə əgər, ey Seyyid,.
Bəs neçin piri-müğan meykədə bünyad etdi

Yuzdən çəkəndə naz ilə. mahım, niqabını,
Torpaqlara fələk salır öz afitabını.
Bilməm ki, nəşəsin nə bilir, həq deyən, meyin, .
Zahid ki, dadmayıbdı məhəbbət şərabını.
Göz kim, bu qədr giryələr eylər, vüzu qılıb
İstər kəfi-nigarə cəmalın kitabını.
Ol qədr şərm var o büti-novrəsimdə kim,
Yüz məst ola, şərab götürməz hicabını.
Saymaq sitarə yadi-qədinlə şəbi-fəraq,
Məlumdür ki, hicrin olur axırı vüsal,
Amma könül gərək gətirə hicr tabını.
Ahuyi-Çin üzündə görüb tari-zülfüvü,
Etdi fərar, atdı çölə müşki-nabını.
Vaiz, şəbi fəraqda gör halımı, sora
Təqrir eylə xəlqə cəhənnəm əzabını.
Canım fəda o qatilə, Seyyid, ki əcrdə
Yazmış mələk, həzar şəhidin səvabını.

Ta düşdü dillərə qəmi-eşqin hekayəti, .
Divanəlikdə tutdu sözüm hər vilayəti.
Düşdüm o növ dillərə divanəlikdə kim,
Mənsux olundu dəhrdə Məcnun rəvayəti.
Eşq əvvəlində sərkəş olur ta zəbun edə,
Səbr et ki, vəsli-yardır anın nihayəti.
Çoxdan məni edərdi zəbun qüssə, saqiya,
Gər olmasaydı piri-müğanın inayəti.
Məndən ziyadə şəkvə edər ol dəxi mənə,
Səndən kimə edərsəm, a zalım, şikayəti.
Bica üzün qaralmadı xətti-siyahdən,
Üşşaq ahının budur, ey sərv, ayəti.
Zülfündə gizlənib üzüvə yetdi, aqibət
Küfr içrə tapdı Seyyid o nuri-hidayəti.

Xoş ol zaman ki, qapında gədalığım var idi,
Bu etibar ilə bir padşalığım var idi.
Mukəddər etdi qübari-həvadis ilə fələk,
Şərabi-nab kimi dilgüşalığım var idi.
Şikəsti-sərsəri-yəs oldu, ey xoş ol gün kim,
Səfineyi-əmələ naxudalığım var idi.
Nə çevrəmə dolanırsan bu gün mənim, ey bəxt,
Haçan səninlə mənim aşinalığım var idi.
Riyanı tərk elədim, cam tutdum, ey zahid,
Mənim də el gözünə parsalığım var idi.
İmamə müqtədiyəm, ey xoş ol zamanlar kim,
Şərabxarlərə pişvalığım var idi.
O zülfi-qarə qılıb bəxtimi, məgər Seyyid,
Mənim əzəldə bu bəxti-qəralığım var idn?

Bir kimsəyə şərh eyləmədim sirri-dəhanı,
Öldürdü məni axırı bu dərdi-nihani.
Ey gülbüni-gülrixtə, xiclət nə münasib,
Hər fəsli-baharın olur əlbəttə xəzanı.
Səd şükr, bu gün qönçeyi-məqsudum açıldı,
Gördüm genə xəndan o güli-qönçədəhanı.
Ortayə düşüb muymiyan ilə süxənlər,
Nəhli-əsəlin rəşk ilə incəldi miyanı.
Sağərdir öpən ləlin o xurşidcəmalın,
Bəzm içrə şərabın tutulur şişəyə qanı.
Sanma məhi-novdur görünən, qaşuvi görcək
Qövsi-fələk ay başına vurdu bu kəmanı.
Əlminnətü-lillah ki, bu şəhrdə, Seyyid,
Bir mahi təmam ilə keçirdik rəməzanı.

Sənsiz, ey ruhi-rəvan, təndə təvanım yox idi,
Təni-zarımda təvan, cismdə canım yox idi.
Ölməyib hicrdə kim vəslinə yetdim, ey məh,
Səxtcan olduğuma böylə gümanım yox idi.
Olmasa kimsə qəmimdən mənim agəh deyibən,
Gərçi dərdim çox idi, ahü fəğanım yox idi.
Ta səhər zülfi-siyahü dəhənin yadı ilə,
Yox idi şəb ki, mənim suzi-nihanım yox idi.
Kakilin şövqi ilə Seyyidi-sərgəştə kimi,
Dolanırdım, o səri-kudə məkanım yox idi.

Qasid, ol səbzxətü zülfi çəlipa nə dedi?
Görcəyin namədi ol dilbəri-ziyba nə dedi?
Sən ki şərh eylədin əhvali-şəbi-hicranı,
O təbibim məni-bimarə müdava nə dedi?
Ayəti-xətt ilə sirri-dəhənin sordunmu?
Buna təvil nə verdi, ona məna nə dedi?
Etdi meyxarələrin. səbrü sükunun qarət,
Guşuna sağərin aya genə mina nə dedi?
Dedi dilbər, bu qədər kim, başım ağrıtma mənim,
Bilmədim heyf ki, bir Seyyidi-rüsva nə dedi?

Dedim: qoy kuyüvün bir mən olum, ey gül, nigəhbanı,
Dedi: hər bülbülə vermək olurmu bir gülüstanı?
Budur zənnim ki, bir kəs məsiyət etməzdi dünyadə,
Əvəz etsəydilər gər ruzi-həşrə şami-hicranı.
Zəbani-şanəni kütah qıl zülfi-siyahından,
Gəlibdir mu-bə-mu şərh eyləyir bir nəqli-tulani.

Sənin tək afitabi-bizəvalın infialından,
Xəcalətdən fələk çah içrə saldı mahi-Kənanı.
Sənin tək mahdən əl çəkdi Seyyid, ey hilaləbru,
Bu, gün tək rövşən oldu, var imiş eşqində nöqsanı.

Dil kimdi zülfi-yardə, divanənin biri.
Dövri-rüxündə can nədi, pərvanənin biri.
Zülfündən üzdüm əl dedim, ol bivəfa dedi:
Zəncirdən üzüldü bu divanənin biri.
Ya xalüvün əsiridi dil, ya dəhanüvün,
Bu mürğü seyd edib o iki danənin biri.
Gər ayü gün tutulsa, nə qəm rindi-meykəşə,
Olsun əlində tək dolu peymanənin biri.
Zahid, çağırma Kəbəyə meyxanədən məni,
Yüz Kəbədən səfalıdı meyxanənin biri.
Min həccdən şərafəti əfzun olur, əgər
Şəmə dolanıban yana pərvanənin biri.
Ya cənnəti verillə bizə, ya cəhənnəmi,
Seyyid, məqamımızdı bu viranənin biri.

/
Olmayaydı məndə, ya rəb, bu məhəbbət kaş ki,
Ya ki hərgiz olmayaydı dərdi-firqət kaş ki.
Olmayaydım ol pəri .eşqində rüsvayi-cahan
Çəkməyəydim dustü düşməndən şəmatət kaş ki.
Göstərib əvvəl vəfa, axır olurlar bivəfa
Olmayaydı xubrulərdə bu adət kaş ki.
Ya verəydi həq sənə bir rəhm, ey bidadgər,
Ya olaydı məndə bu hicranə taqət kaş ki.
İnciyib ahü fəğanımdan, kəm etdin cövrünü,
Etməyəydim cövrü zülmündən şikayət kaş ki.
Seyyida, yarı görüncə vəsldə əğyar ilə,
Xud qalaydım hicrdə didarə həsrət kaş ki.

Səba, könlüm pərişan olduğun dildar bilməzmi?
Qəmi-pinhan məni öldürdü, halım yar bilməzmi?
Bəlavü möhnətim çox, bir ənisü qəmküsarım yox,
Bu halı, ey səba, ol sərvi-gülrüxsar bilməzmi?
Səba, ərz eylə dildarə mənim hali-pərişanım,
Məsihim, firqətindən olduğum bimar bilməzmi?
Nədir, qılmaz məni xoşhal dilbər bir pəyam ilə,
Qəmindən sübh olunca qaldırım bidar bilməzmi?
Məni hicran əlində Seyyidi-məhcurü rüsva tək
Cahanda olduğum ol gülüzarım xar, bilməzmi?

Genə bir namə ilə yadə salıb yar məni,
Bəxt handan bu işə gördü səzavar məni.
Məni ol mahliqa yadına salmaz, bilirəm,
Gündə bir mücdə ilə alladır əğyar məni.
Şəbi-hicran məni, ey mah, təmam etmiş idi,
Saxlayıb zində belə vədeyi-didar məni.
Fərəhimdən ölərəm gər səni birdən görsəm,
Gəlməgindən irəli eylə xəbərdar məni.
Dürri-göftari-dəhanınla edibdir xoşhal,
Ey ləbin sədqəsi, yoxdan eləyən var məni.
Bülbüli-gülşəni-qüds idim, əzizi-dü cahan,
Bir gül eşqində fələk eylədi gör xar məni.
Seyyid, əmmaməmi al başdan əyaği-meyə ver,
Sərgiranəm tut əlim, eylə səbükbar məni.

Dil yarımın dilərsə xilafi-rizasını,

Ya rəb, görüm ki, tapmasın öz müddəasını.
Qıymazdı intiqamə məni-zardən rəqib,
Çəkmiş olaydı mən təki yarın cəfasını.
Tək görməyim rəqibi, gərəkməz visali-yar,
Xoşdur çəkəm bu növ ilə hicran bəlasını.
Yüz bivəfa ola, o gülü tərk edərmi dil,
Kim bunların görübdü bir əhli-vəfasını?
Gər intizardən gözüvə ensə qarə su,
Əşki-rəvanımın bilüsən macərasını.
Avarə ikən eylədi dil zülfüvi vətən,
Mürği-qəribin, ari, tikər həq yuvasını.
Şəbanda gərçi bir neçə gün içmədim şərab,
Səd şükr mahi-ruzədə tutdum qəzasını.
Meydən bu gün ki mən qılırsız cavanları,
Seyyid qocaldı, almayın əldən əsasını.

Gər kövkəbi-bəxtimdə mənim rüfət olurdu,
Bir vəsli o mahın bizə də qismət olurdu.
Qorxuzmamış olsaydı məni qisseyi-hicran,
Ümmidi-visal eyləməgə cürət olurdu.
Düşnamsız olsaydı ləbi-yar müyəssər,
Təlx olmaz idi, meydə dəxi ləzzət olurdu.
Rüxsarəsi novxətlərin alsaydı dil əldən,
Xurşid səhab içrə də gərmiyyət olurdu.
Ey dil, tələb etsəydin əgər busə ləbindən,
Yarın xəti-reyhanı sənə hüccət olurdu.
Olsaydı vəcahət səbəbi-isməti-Yusif,
Bəs Yusifi-siddiqə neçin töhmət olurdu?
Təzminin əgər olmasa əşardə, Seyyid,
hər bir qəzəlin dəhrdə biqiymət olurdu.

Kimin ayineyi-rüxsarına düşmüş nəzəri

Ki, üzündə qalıb ol tünd nigahın əsəri?Q
Dedim: ey mah, üzündə nədir ol zəxm? Dedi:
Müstəfa barmağıdır, şəqq eləyibdir qəməri.
Göstərib bir-birinə mahi-rüxün əhli-nəzər,
Qalıb ol ayineyi-safdə əngüşt əsəri.
Göz yaşım su verib ol xəncəri-müjganə, nolar
Tiği-heydərdən onun artıq olursa kəsəri.
Seyyida, mahi-rüxi-yar nihandır bu gecə,
Dəgər eşq əhlinə axır bu mühaqın xətəri.

Rəhm etmədi əhvalıma yarım, belə keçdi,
Bir baxmadı ol nazlı nigarım, belə keçdi.
Həngami-bahar oldu, işim beylə xəzandır,
Ya rəb, necolur[1], çünki baharım belə keçdi.
Gündüzlər işim nalə, gecə göz yaşı həmdəm,
Ol zülfü rüx eşqində mədarım belə keçdi.
Saldım özümü payi-səməndinə o şahın,
Lütf etmədi ol şahsüvarım, belə keçdi.
Yar özgələrin məclisinin oldu çırağı,
Mən hicrdə qaldım, şəbi-tarım belə keçdi.
Seyyid, o qara gözlü mənim kəsdi qərarım,
Səhrayi-məhəbbətdə qərarım belə keçdi.

[İstinad:1 Necə olur. ]

Görəndə cilvədə bu sərvi-gülüzarləri,
Ucalmasın necə üşşaqın ahü zarləri.
O ala gözlər, o gül ləblər, ol qara tellər;,
Qoyarmı kim, qala eşq əhlinin qərarləri?
Açıb behişti-bərin qapısın məgər Rizvan,
Enibdi yer üzünə bu mələk qətarləri?

Tükətdi ömrümü bu bivəfaların axır
Visal ümidi ilə dərdi-intizarləri.
Nə qövmdür bu gül üzlü nigarlər, ya rəb,
Ki yoxdurur buların gülcə etibarləri.
Nə ölmədim qutarım, nə müyəssər olmadı kim,
Görüm visaldə kamimcə bu nigarləri.
Həlak eylədi axırda Seyyidi-zari
Bu gülüzarlərin dərdi-xar-xarləri.

Ey xoş ol günlər ki, bəzmimdə nigarım var idi,
Zövqi-didar ilə könlümdə qərarım var idi.
Getdi ol günlər.ki, zülfü arizindən ol məhin,
Sünbülüm, müşküm, gülüm, bağım, baharım var idi-
Rəşk edib dövri-fələk məndən ayırdı aqibət,
Dərdü qəm dəfinə kim, bir qəmküsarım var idi.
Barilaha, bir də mən görrəm ola ol günləri
Kim, visali-yardə xoş ruzigarım var idi.
Seyyida, bir də görüb ölsəm əgər, olmaz qəmim,
Ol zamani kim, vüsali-gülüzarım var idi.

Eylədi axır fələk ol gülüzarımdan məni,
Saldı dəşti-qürbət içrə kuyi-yarımdan məni.
Naqeyi-sərgəştə tək səhra dolansam, ney əcəb
Kim, fələk bidad ilə üzmüş qatarımdan məni.
Hicrdən rəngim saraldı, şükr kim, sərrafi-eşq,
İndi tanır bu zəri-kamil-əyarımdan məni.
Qaldı, .mən getdimsə, ey namehriban, kuyində dil,
Bari gəh-gəh sor dili-biixtiyarımdan məni.
Şəhri-Tiflisin çəlipa bağlayan tərsaləri,
Qorxuram kim, ayıra axırda tarımdan məni.
Seyyida, mən ol məhəbbət əhliyəm afaqdə--

Kim, tanır əhli-nəzər xaki-məzarımdan məni.

Zahidin gər güzəri bir düşə meyxanə sarı,
Kafərəm gər dönə ol məscidi-viranə sarı.
Dustlər, eyləmişəm badeyi-nab ilə vüzu,
Döndərin bəs dəxi səccadəmi bütxanə sarı.
Zahida, sən məni meyxarə bilirsən, yoxsa
O nə baxmaqdı həqarətlə bu divanə sarı?
Eyləməzdim bu qədər badeyi-gülgunə həvəs,
Saqinin əksi-rüxü düşməsə peymanə sarı.
Bəççeyi-badəfüruşun ki, görə rüxsarın,
Bir də divanədi Seyyid baxa quranə sarı?!

Dünən gecə mənə həmbəzm bir səmənbər idi,
Məhi-cəmalı ilə gözlərim münəvvər idi.
Başımda nəşeyi-mey, xatirimdə zövqü səfa,
Bir əldə türreyi-dilbər, bir əldə sağər idi.
Gecəm o hur cəmalilə ruz tək rovşən,
Yerim behişti-bərin, badəm abi-Kövsər idi.
Nə xahiş eyləsəm ol bəzm ara olub hasil,
Nə arizu eləsəm yardən müyəssər idi.
O gunə çox gecələr görmüşəm behiştasa,--
Və leyk, ol gecə həm, bir behişti-digər idi..
Xuda keçən gecəni ömrümə hesab eləsin--
Ki, hər dəqiqəsi yüz min günə bərabər ,idi-
O qədr axtarasan, ey şəhi-diyari-vəfa
Ki, heyf öldü bu Seyyid, qəribə çakər, idi.

Çəkmə, ey dust, bu gün daməni-səhrayə məni,
Yoxdur ol mah, aparma bu tamaşayə məni.
Oldum aşüftə pərilər səri-keysusundan,
Nə deyim Adəmə kim, gətdi[1] bu dünyayə məni.
Əksi-rüxsarüvi dil camdə görcək, ey gül,
Saldı yüz rəng ilə bir özgə təmənnayə məni.
Olmasaydı o xətin, Qaziyi-Beyzavi gəlib,
Sakit etməzdi əgər şərh edə mənayə, məni.
Sayeyi-sərvi-qədin ta ki, gedibdir sərdən,
İncidir gülşən ara güldən olan sayə məni.
Kakilin şövqü ilə qarəyə batdım elə kim,
Oxşadır əhli-nəzər Kəbeyi-ülyayə məni.
Ülfətimdən bu qədər etməz idi ar ol gül,
Oxşadıbdır, bilirəm, Seyyidi-rüsvayə məni.

[İstinad1: Gətirdi]

Pərtövi-hüsnün pozubdur nuri-mehri-ənvəri,
Rəvnəqi-hüsnündür ey mahım, cahanın zivəri.
Ayeyi-vəsseyf qaşındır bu yüzdən dəhr ara,
Sabit eylər xəlqə həqqən Zülfüqari-Heydəri.
Bu pərirulərdir aləmdə müsəxxər nəlinə,
Mur xəttim, ləblərindir ol Cəmin əngüştəri.
Şurə saldı püsteyi-xəndanın əhli-aləmi,
Ey şəkərləb, qamətin göstərdi şuri-məhşəri.
Guşeyi-meyxanədə bəsdir bizə sınmış sifal,
Çərxi-minanın əgər xurşiddən var sağəri.
Arizin cövhərdir, ol cövhər yanında gün ərəz,
Hanı Əflatun ki, fərq etsin ərəzdən cövhəri.
Yusifim, gəl eyləmə munca cəfalər Seyyidə,
Etmə rəncidə özündən xatiri-peyğəmbəri[1].

[İstinad1: İlk dəfə çap olunur]

Badi-səba şüküftə edər gərçi gülləri,
Həmmam camədən çıxarır bu gözəlləri.
Ey futə, verməərəm səni zahid əbasına,
Şamü səhər qucursan elə incə belləri.
Aşiq yanında zərrdən artıqdı qiymətin,
Ey tas, ta ki, dəgdi sənə yarın əlləri.
Ey xəlvəti fəda sənə, kəhli[1]-təcərrüdün
Var səndə ruhə feyz verən çox əməlləri.
Bir guşəni behiştə sənin verməərəm ki, var
Səndə bu şuxi-huriliqalər məhəlləri.
Həmmam daşı olsa idin Seyyida, əgər,
Sən də qucaqlar idin o ziba ....

[İstinad1: Ki əhli.]

.

Axiri-dəhr nə mümkündü fənadən qeyri,
Kimsə baqi degil aləmdə xudadən qeyri.
Aləmi-faniyə əl vurma ki, yoxdur səməri,
Eyləmə hiç tələb mülki-bəqadən qeyri.
Bivəfa mahlərə vermə könül, xar olusan,
Görməsən dərdü qəmü cövrü cəfadən qeyri.
Ləbi-şəkkərşikənindən sənə düşnam verir,
Gərçi sən eyləməsən xeyr-duadən qeyri.
Tapmasan kimsənə ki, dərdi-dil izhar edəsən,
Həmdəm olmaz qəmüvə badi-səbadən qeyri.
Hər nə zülm eyləsə dildar gərək səbr edəsən,
Yoxdu bu babdə bir çarə rizadən qeyri.
Aşiq ol pərtövi-rüxsareyi-şəmsi-əzələ,
Ta ki sən görməyəsən nurü ziyadən qeyri.
Ol xudavəndi-əhəd eşqinə candan rağib.,
Yoxdu bu Kəbədə çün zövqü səfadən qeyri.
Mümkünün var ki, yolu mümkünə aşiq olsun,
Pəs tələb eyləməsən mehrü vəfadən qeyri.
Surəti-vacibi mümkündə təmənna eləsən,

O da mümkün ki, degil Şiri-xudadən qeyri.
Çəng vur ürvəti-vüsqayi-vəliyyüllahə,
Görməsəm ruzi-cəza lütfü ətadən qeyri.
Mümkünün vacibə yoxdur yolu, ey Seyyidi-zar,
Görmədim səndə bir asar xətadən qeyri.

Ey ruyin asimanın xürşidi-nuri-tabi,
Bərgi-ləbi lətifin gülqənd afitabi,
Xət gəldi, yarı qıldı şərməndə əhli-dildən,
Ol müşkmu qəzalın oldu füzun hicabi.
Şövqi-cəmalın, ey gül, yaşımı tökdü gözdən,
Ol güldən eylədim mən təqtir bu gülabi.
Təshif ilə ləbindən bir busə istər aşiq,
Miskinə sədqə vermək əfzun edər səvabi.
Açmış zəbani-halın isbatı-zati-həqqə,
Hər bərgi-susən olmuş bir mərifət kitabi.
Derlər əzab olmaz cənnətdə, bu əbəsdir,
Kuyində dil o hurün daim çəkər əzabi*.

[İstinad1:. İlk dəfə çap olunur]
.

Derlər ki, xəlq üç yüz ili Adəm ağladı,.
İnsaf etməyib babamız, çox kəm ağladı.
Olsa həyatım ağlar idim ruzi-həşrə tək,
Üç yüz ilin nə behcəti kim, Adəm ağladı?
Mən ağlayanda Kövsərə yüz verdi yüz məlal,
Kəbə geyib libasi-qəra, Zəmzəm ağladı.
Gəh övcü gəh həzizdə gördü fəğanımı,
Mütrüb nə vəqt eylədi zilü bəm, ağladı.
Düşdüm cüda çü cənnəti-kuyindən ol məhin,
Halimə oldu cinnü pəri həmdəm, ağladı-
Göz yaşı ilə xürrəm o sərvi edib könül,

Bir ləhzə görmədi özünü xürrəm, ağladı.
Gördü gözüm ki, yarı gəlir ağlayanda mən,
Seyyid kimi sirişk töküb peyhəm ağladı.

Sənə olsaydı, ey gül, Yusifin filcümlə oxşarı,
Olurdu nəqdi-can ilə cahan əhli xəridarı.
O mahi-zərfüruşun qalmışam didarına həsrət,
Hücumi-müştəridən gərmdir əzbəs ki, bazarı.
Gəlir ol Yusifin bazarına zali-fələk hər gün,
Gecə ta sübh kövkəblərdən eylər cəm dinarı.
Əyari-nəqdi-eşqi, ey könül, sərraf olandan sor,
Büruz eylər məhəkdə simi-nabın qədrü miqdarı.
Nə bilsin bibəsərlər qiymətin əşari-canbəxşin,
Apar sərrafə göstər, Seyyida, bu dürri-şəhvarı.

Dün qismət oldu çeşmimə xalın nəzarəsi,
Sandım yanıbdı çərxdə bəxtim sitarəsi.
Yüz gün salır arayə fələk səngi-təfriqə,
Saz olsa bir gün aşiqü məşuqun arəsi.
Məndən ayırdı çərx o qaşı hilalımı,
Yandırsa çərxi, var yeri, ahım şərarəsi.
Dün gecə xəttü xalüvə baxdım o qədr kim,
Ey zülfi-qarə, gözlərimin getdi qarəsi.
Getmək qaşın xəyalı könüldən məhaldır,
Məhşər ola sağalmaz o şəmşir yarəsi.
Bimari-eşqə vermə davalər əbəs, təbib,
Ölməkdən özgə yoxdu onun hiç çarəsi.
Ol qaşı yayın oxlarını çəkmə sinədən,
Çəksən salır cahanə xələl qan fəvarəsi.
Ağzın xəyali etdi vücudum ədəm, mənim
Yox özgə bir qəmim, bu sözün aşkarəsi!

Bir zəxmi-cansitanla məni eylədi həlak,
Can verdi, Seyyida, genə zəxmi-dübarəsi.

Yanımda eyləməyin eyb o mahi-tabanı,
Könül sevən gözəlin olmaz eybü nöqsanı.
O zülfə dil verəni xatirim olubdur cəm,
Məlamət eyləməyin çox da mən pərişanı.
Üzari-yarım ara fövci-xətdi, ya bilməm,
Sipahi-Rus tutub mülki-ali-Osmanı?!
Sipahi-hərbi-Qaradağ edibdi Ruma hücum,
Və ya ki, ləşkəri-xət tutdu ruyi-cananı.
Hübablərmidi mövci-sirişkim içrə və ya
Qara dənizdə vaporlar açıbdı yelkanı.
Xədəngi-yarə gözüm xuni-dildən etdi riza
Ki, şahsevən tutar, ari, əziz mehmanı.
Bu mülkün işrətini, Seyyida, qənimət bil
Ki, tapmasan dəxi cənnətdə zövqi-Şirvanı.

Tökülür gözlərimin, xəttini görcək, yaşi,
Çox təəccübdü bulud səbzədən olmuş naşi,
Yeni ay çəkdimi çərx üzrə fələk nəqqaşi,
Ya salıb əks o məhi-çardəsalın qaşi?
Sayeyi-nəxli-qədin sərvə düşəndən, ey gül
Ucalıbdır fələkə fəxr ilə sərvin başi.
Qoydu tənha məni bu badiyeyi-möhnətdə,
Yoxdu Məcnunda vəfa, gözləmədi yoldaşi.
Gecə-gündüz ki, özü məsti-riyadır zahid,
Badədən bəs nə üçün mən qılır ovbaşi?
Kəbədə olsa da zahid ki, təvaf etməzdi,
Səngi-meyxanədən olsaydı əgər bir daşi.
Nəçidir şerdə Bixud sənə həmta olsun,
Seyyida, püxtə ilən tən gələ bilməz naşi.

Ta könül seydinə səyyad o gözü qaş oldu,
Aləmə razi-nihanım dağılıb faş oldu.
Zülfi-tərrarın olub gözlərinə yar, axır
Bu qara oğru həramilərə yoldaş oldu.
Nə bəlalər gətirir başıma bu dideyi-tər,
Bu nə tufan, bu nə girdab, bu nə yaş oldu?
Ey xoşa nəqşinə ol aşiqi-həqbinin kim,
Nəqşdən pey aparıb aşiqi-nəqqaş oldu.
Eşikin daşına ta dəgdi rəqibin qədəmi,
Evim ol ləhzə yıxıldı, başıma daş oldu.
Sədəfi-sinəm ara bəslədigim gövhəri-nab,
Heyf taraca gedib qisməti-ovbaş oldu.
Dün şümar eylədik aləmdəki divanələri,
Axirül-əmr bu Seyyid hamıdan -baş oldu.

Tökülür gözlərimin, xəttini görcək, yaşi,
Çox təəccübdü bulud səbzədən olmuş naşi,
Yeni ay çəkdimi çərx üzrə fələk nəqqaşi,
Ya salıb əks o məhi-çardəsalın qaşi?
Sayeyi-nəxli-qədin sərvə düşəndən, ey gül
Ucalıbdır fələkə fəxr ilə sərvin başi.
Qoydu tənha məni bu badiyeyi-möhnətdə,
Yoxdu Məcnunda vəfa, gözləmədi yoldaşi.
Gecə-gündüz ki, özü məsti-riyadır zahid,
Badədən bəs nə üçün mən qılır ovbaşi?
Kəbədə olsa da zahid ki, təvaf etməzdi,
Səngi-meyxanədən olsaydı əgər bir daşi.
Nəçidir şerdə Bixud sənə həmta olsun,
Seyyida, püxtə ilən tən gələ bilməz naşi.

Ta könül seydinə səyyad o gözü qaş oldu,
Aləmə razi-nihanım dağılıb faş oldu.
Zülfi-tərrarın olub gözlərinə yar, axır
Bu qara oğru həramilərə yoldaş oldu.
Nə bəlalər gətirir başıma bu dideyi-tər,
Bu nə tufan, bu nə girdab, bu nə yaş oldu?
Ey xoşa nəqşinə ol aşiqi-həqbinin kim,
Nəqşdən pey aparıb aşiqi-nəqqaş oldu.
Eşikin daşına ta dəgdi rəqibin qədəmi,
Evim ol ləhzə yıxıldı, başıma daş oldu.
Sədəfi-sinəm ara bəslədigim gövhəri-nab,
Heyf taraca gedib qisməti-ovbaş oldu.
Dün şümar eylədik aləmdəki divanələri,
Axirül-əmr bu Seyyid hamıdan -baş oldu.

Ta niqab arizinə zülfi-dütadən saldı,.
Məni ol mahliqa şurü həvadən saldı.
Saldı könlümdən o gül özgə sənəmlər şövqin,
Bütləri nayibi-həq beyti-xudadən saldı.
Xəti-müşkini gəlib tutdu rüxi-cananı,
Şamilər məmləkəti-Rumi səfadən saldı.
Sübh sərməst çıxıb ta elədi rəfi-niqab,
Arizi-beyzeyi-beyzanı ziyadən saldı.
Neynəvadə məni bir şux ərəb qıldı əsir,
Bu sınıq könlümü ney kimi nəvadən saldı.
Eşq ilə salmış idi aləmə Məcnun səda,
Onu divanəligim indi sədadən saldı.
Seyyid, ol gülbədəni bəs ki vəfasız gördüm,
Məni novmid edib, ümmidi-rəcadən saldı.

Nolurdu bəzmdə, ya rəb, mənim də yarım olaydı,,
Alıb piyalə ələ yar meygüsarım. olaydı.
İçəydi badeyi-gülgun o gül piyalə-piyalə,
Açaydı arizi güllər, cahan baharım olaydı.
Fəzayi-bağü gülüstanə meyl etməz idim mən,
Əgərçi, şəhrdə bir yari-gülüzarım olaydı.
Nişimən etməz idim mən diyari-qürbəti, ey dil,.
Rəqibi yar ilə görməkdə gər qərarım olaydı.
O şuxün eşqinə məhcur xəlq edib məni xaliq,
Riza olurdum əgər əldə ixtiyarım olaydı.
Rəqib vurmaz idi xari-qüssədən mənə yarə,
O gülüzar yanında gər etibarım olaydı.
Bu gunə olmaz idi bivəfa o gül mənə, Seyyid,,
Əgər mənim də vəfasızlığa şüarım olaydı.

Sanma güldür gətirən səhni-gülüstanə məni,
Gülə sənsiz nəzər etsəm gətirər canə məni. ,
Eylə billəm ki, mənə mənzil olur nari-səqər,
Çəkələr sənsiz əgər rövzeyi-rizvanə məni.
Zülfü xəttin həvəsi ey güli-rəna, qoymaz
Bağda mail olum sünbülü reyhanə məni.
Dili-zarımda olan atəşi-eşqin axır
Eylədi şəmi-rüxi-alüvə pərvanə məni.
Qələt etdim ki, dedim müshəf o vəchi-həsənə,
Tövbələr ver, qoy öpüm, tapşır o quranə məni.
Muri-sərgəştəyəm ol Xızr-xətimdən ayrı,
Sizi tari, yetirin mülki-Süleymanə məni.
Seyyida, silsileyi-zülfünə oldum mail,
Nə bilim kim, edəcəkmiş belə divanə məni.

Bilməm ki, bu nə fitneyi-dövrü qəmər oldu,
Saqi, hanı xurşidi-mey, axır səhər oldu.

Əğyar ilə ol qönçədəhən içdi meyi-nab,
Ərbabi-vəfa həsrət ilə xuncigər oldu.
Mən dərdi-dilim ərz qılırdım, dedi ol şux:
Hay-hay! Bu da gəldi bizə bir dərdi-sər oldu.
Verdim könül ümmid ilə bir özgə nigarə,
Bədbəxtligim gör ki, bu ondan bətər oldu,
Hər nəxli-təmənnayə ki, yaşımla su verdim,
Əğyarə salıb sayə, mənə bisəmər oldu.
Dildən keçib, əhvalı bilən yari-zəbandan,
Mən ərzi-dil etdim ona, qəsdi-digər oldu.
Sancıldı təni-zarıma gər oxları, Seyyid,
Uçmağa səri-kuyinə bir balü pər oldu.

Ey könül, ol gül üçün naləvü zar etmə dəxi,.
Özüvü dideyi-əğyardə xar etmə dəxi.
Həsrətindən bu qədər qanə ki, döndün bəsdir,
Həvəsi-buseyi-ləli-ləbi-yar etmə dəxi.
Bəsdir oldun bu qədər bəsteyi-zənciri-cünun,
Həvəsi-silsileyi-zülfi-nigar etmə dəxi.
Ömr payanə yetib, muyi-siyəh oldu səfid,
Arizuyi-həvəsi-busü kənar etmə dəxi.
Ziri-bari-qəmi-hər simbər olduq bəsdir,
Bivəfalər qəmini bizlərə bar etmə dəxi.
Öldürürlər, könül, ol kudən edər kim ki, güzər,
Gər güzarın düşə, ol guyə güzar etmə dəxi.
Seyyida, əlbiseyi-əqldən oldun ari,
Təni-hər aqilü fərzanədən ar etmə dəxi.

Hər aşiqi-dilsuxtə bir meyldə qaldı,
Məcnuni-siyəhbəxt qəmi-Leylidə qaldı.
Məcnun ilə bir məktəbi-eşq içrə oxurdum,
Mən xətmi-kəlam etdim, o «Vəlleyl»də qaldı.
Sandım ki, tutan damənini vəslə yetər, mən

Tutdum ətəgin eylə, əlim zeyldə qaldı.
Hər kəs ki, çatıb vəslüvə rizvanə yetişdi,
Hicrində qalan çahə düşüb Veyldə qaldı.
Tufanə verib mərdümi-çeşmim bu cahanı,
Viranə könül kəşməkeşi-seyldə qaldı,
Sərxeyli-cünun Qeys ilə Fərhad idi saydım,
Seyyid dəxi bizdən çıxıb, ol xeyldə qaldı.

Dustlər, mən görən ol dilbəri-ziba kim idi?
Dağıdan gül üzünə zülfi-mütərra kim idi?
Mən ki, bihuş düşüb, görçək özümdən getdim,
Siz ki, huşyardız, ol afəti-dünya kim idi?
Nə könül qoydu, nə can məndə, nə səbrü nə qərar,
Etdi qarət məni, ol şahidi-yəğma kim idi?
Ol üzü cənnəti mən bilməsəm adəm degiləm,
Ləbi Kövsər, üzü gül, qaməti Tuba kim idi?
Dustlər, dün gecə kim, məsti-meyi-vəhdət idik,
O bizə saqi olan yari-dilara kim idi?
Doldu ənvari-məhəbbətlə genə sinə bu gün,
Göstərən vadiyi-Sinadə təcəlla kim idi?
Bu nə bəhcət, nə səfadır, nə sürurü nə bəha,
Sizi tari, o nigari-fərəhəfza kim idi?
Kimdi bu məclisi-ürfanı bu şurə gətirən,
Dövri-sağərlə verən badeyi-səhba kim idi?
Gəldi göftarə ləbi, aləmi ehya elədi,
Bu necə ruh idi, aya bu Məsiha kim idi?
Çeşmi-Qibti nə bilir xilqəti-harun sirrin,
Nə bilir dəhrdə Firon ki, Musa kim idi?
Olmasan badiyeyi-eşqdə Məcnun əgər,
Bilməsən hiç ki, sən, Həzrəti-Leyla kim idi?
Nəfsi-vahiddən əgər mətləbə olsan vaqif,
Bilisən onda ki sən, Adəmü həvva kim idi.
Həq zühurunda hələ yolda qalıb iki gözüm,
Bəs o həq məzhəri ayineyi-ülya kim idi?
Qürrətül-eynüvə ömründə degilsən vaqif,
Görə bilməz ki, cəmali-həqə bina kim idi.

Bu səri-çeşmə əzəldən bulanıb, ey qafil,
Gör kimə tabe olursan, sizə mövla kim idi?
Neçə gün aləmi-nasutə gəlib oldu müqim,
Heyf ki, bilmədilər Seyyidi-rüsva kim idi?

Necə həmtay tutum hər büti-zibayə səni,
Verməræm tanrı bilir, cümlə bu dünyayə səni.
Qorxuram ki, nəzər əhli deyə naqisdi bu söz,.
Oxşadam hüsndə hərçənd təmam ayə səni.
Arizin gün əvəzi, aləmi nurani edər,
Gər mələklər çəkələr ərşi-müəllayə səni.
İstəməz abi-bəqa Xızrü Məsiha xürşid,
Göstərə bir kəs əgər Xızrü Məsihayə səni.
Şaxi-gül qoyma sala sayə sənə bağ içrə,
Bu nəzakətlə, gülüm, incidər ol sayə səni.
Ey pəriçöhrə, gəlir billəhi, heyfim özümün
Ki, desin yar, xəlayiq, məni-rüsvayə səni.
Nə edər arizuyi-hur, nə gülzari-behişt,
Versələr .bir gecə bu Seyyidi-şeydayə səni.

Məgər bəzmi-əzadə ol məhin zülfi-siyəhfamı
Tökülmüş kim üzə, etmiş bərabər sübhlə şamı?
İki gündür ol ayı görmürəm, olmuş günüm qarə
Tutulsun ayü gün, çərxin pozulsun səqf ilə bamı.
Gözüm, tök ləli-əşkin, ağla kim, bu məclisi-qəmdə
Olubdur gövhərəfşan ol nigarın çeşmi-badamı.
Gedərsə arizindən zülfi-şəbrəngi, gəlir xətti,
Fələk qoymaz qəradən çıxsın ol sərvi-güləndamı.
Sitarəm qarə, bəxtim qarə, Seyyid tək günüm qarə,
Bu qarə günlərin, ya rəb, nədir bilməm sərəncamı?

Ölüncə çəkmənəm mejxanədən hərgiz qədəm, saqi.
Ələ al sən əjaği-badəni ejlə kərəm, saqi.
Nə oldu böjlə kim, indi zəlili-ruzigar oldum,
Məni piri-müğan saxlardı daim möhtərəm, saqi.
Bilurin sağəri ləbriz qıl xurşidi-səhbadən--
Ki, bizdən razı olsun xatiri-Cəmşid-Cəm, saqi.
Xəjali-taqi-əbruji-kəci-mehrab-mislinlə,
Əlif tək qamətim kejsulərin tək oldu xəm, saqi.
Dəhani-jar fikrilə jox oldu cümleji-varım,
Vücudum oldu, gör bir nöqtə eşqində ədəm, saqi.
Behişti verdi Adəm danəjə,  mən daneji-xalə,
Olum qoyxaluva qurban özüm mən, həm dədəm, saqi.
Tutulmuş qönçə tək hicrində qəmdən xatiri-Sejjid,
Səri-minanı aç, xatirdən ejlə dəfi-qəm, saqi.

Alıb qərarımı, gəl biqərar qojma məni,
Şikəstə xatirü biqəmküsar qojma məni.
Alıbdı jaği gözün ixtijarımı əldən,
Fəda olum, belə biixtijar qojma məni.
Əgərki öldürəsən intizardən xoşdur,
Amandı, qanımı tök, intizar qojma məni.
Fəraqəti-dilü can məstlikdədir, saqi,
Gözün fədası olum, huşijar qojma məni.
Durubdu qətlimə cəlladi-çərx bipərva,
Amandı, saqi, gözündən kənar qojma məni.
Gədaji-kujinəm, ej- şəhsüvari-ərseji-hüsn,
Bu zillət ilə sən, eytacdar, qojma məni.
Əgərçi Sejjidəm, amma sənə qulaməm mən,
Bu dərdü qüssədə, eyşəhsüvar, qojma məni.

Ta məndən iraq ol büti-gülpirəhən oldu,
Hər camə ki geydim, mənə qəmdən kəfən oldu.
Sən beylə degildin mənə, ey ruhi-rəvanım,
Məlum olur kim, səni bir ögrədən oldu.
Rəhbər dedigim oldu mənə rahzən axır,
Yusif görünən yar mənə Əhrimən oldu.
Bəhreynə dönüb mövci-bəladən iki çeşmim,
Hər qətrə ki, düşdü yerə dürri-Ədən oldu,
Dil eylədi axır səri-zülfündə nişimən,
İymanə gəlib maili-hübbi-vətən oldu,
Nisfi-rüxünü xətti-siyəh tutdu o mahın,
Gəldi Həmələ mehr, şəbü ruz tən oldu.
Ol Yusifi-gümgəştə fərağında bu Seyyid, Y
Yəqubə dönüb sakini-beytül-həzən oldu.

Xalü xətin olub dili-viranə oğrusu,
Oldu iki qaraçı bu bir xanə oğrusu.
Şəmi-cəmalə yandı könül, öpdü ləlüvi,
Məqsuduna yetişdi bu pərvanə oğrusu.
Məşşatə pak edər ərəqi-ruyi-yarımı,
Lazımdı qəti-yəd ola dürdanə oğrusu.
Ol gecədən ki, şanə dəgib tari-zülfünə,
Sədçak könlümüzdür olan şanə oğrusu.
Ləli-ləbin xəyalına düşmüş dili-həzin,
Bu düzd olub xəzaneyi-şahanə oğrusu.
Dil basdı bağrına bu gecə zülfi-pürxəmi,
Zənciri-əqlin oldu bu divanə oğrusu.
Xali-xəyali xali edib bəs ki, əqldən,
Xirmən gəzib bu Seyyid, olub danə oğrusu.

Ləblərin öpdüm, könül oldu meyi-nab oğrusu,
Oldu, bu sərrafı gör, bir Ləli-sirab oğrusu.
Bağbandır bağı-rüxsarında zülfün, ey pəri,
Dil dilər ləli-ləbin, bu tifl innab oğrusu.
Ta səhər çeşmin xəyalilə könül bidardır,
Oldu ol sahir bizim bimardən xab oğrusu.
Aldı pinhani dəhanın hər nə kim, var idi yox,
Açmaq olmaz sirrini, müşküldü əhbab oğrusu.
Xət gəlib rüxsarüvə, aldı əlimdən könlümü,
Bu siyəh əyyarı gör kim, oldu məhtab oğrusu.
Fal açıb rüxsarüvə zülfün qaraçılər kimi,
Qarət etdi könlümü dəhrin bu qüllab oğrusu.
Qaşları taqində xalı aldı könlüm, Seyyida,
Oldu hər bir oğrudan bədtər bu mehrab oğrusu.

Dil aşiq olub zülfüvə sevdalərə düşdü,
Məcnun kimi zəncir ilə səhralərə düşdü.
Ta camə üzün əksi düşüb, ey ləbi meygun,
Çox xam-təmə qeyr təmənnalərə düşdü.
Sirri-dəhənin söylədilər rəmz ilə mərdüm,
Bu mübhəm olan nöqtə müəmmalərə düşdü.
Zülfün elədi xatiri-üşşaqı nişimən,
Ol şəkli-çəlipa bu kəlisalərə düşdü.
Ta qətreyi-neysan ola dəndanüvə nisbət,
Əl əbrdən üzdü, dili-dəryalərə düşdü.
Gəh sərzənişi-xəlq, gəhi kineyi-gərdun,
Eşqində başım, gör ki, nə qovğalərə düşdü.
Yandırdı məni şəşəeyi-nuri-cəmalın,
Musa kimi Seyyid bu təcəllalərə düşdü.

Bağdən fəsli-bahar ol küli-rəna getdi,
Bağlər düşdü səfadən ki, təmaşa getdi.
Nə əcəb gər axa Zəmzəm kimi əşki-çeşmim,
Nəzərimdən mənim ol Kəbeyi-ülya getdi.
Getdi ta silsileyi-zülfi əlimdən o məhin,
Qurtarıb ömr, .başımdan dəxi sövda getdi.

Dəxi sən, ey dili-bimar, dəvasız qaldın,
İndi ol mərgüvə amadə, Məsiha getdi.
Etmədi aqibəti-karüvi Məhmudi-xuda,
Ol Əyazi-dilü can, şivədə Leyla getdi.
Dedi minbəd sənə atəşi-duzəxdi məqam,
O üzü baği-cinan, qaməti Tuba getdi.
Seyyida, getdi o kim, gəlmiş idi Şirvanə,
Qaldı surət kimi bu şəhr, o məna getdi.

Ey rövzeyi-behişt cəmalın nişanəsi,
Kövsər o ləli-şəhd-misalın nişanəsi.
Duzəx nümuneyi-ələmi-dərdi-firqətin,
Cənnət nəimi-baği-visalın nişanəsi.
Bülbül nəvayə gəlməz idi şuri-eşq ilə,
Gül olmasaydı arizi-alın nişanəsi.
Etməzdi hiç kəs Həcərül-əsvədi təvaf,
Gər olmasaydı üzdəki xalın nişanəsi.
Mehrabə Seyyid etməz idi, baş əgib, namaz,
Tağında olmasaydı hilalın nişanəsi.

Xət gəldi rüxi-yarə füzun oldu səvadı,
Şəffafdı bu ayeyi-«Vəlleyl» midadı.
Ol gül məni, gör, eylədi məşhuri-qəbayil,
Eylə ki, Ədi şöhrə edib qovmi-Əyadı.
Ey bari-xuda, hasil elə yar muradın,
Gər qətlim isə dəhrdə mətlubü muradı
Vaiz eləyir mənfəəti-badəni inkar,
Meyxarələrə gör ki, nə əfzundu inadı.
Zahid işi zahirdə əbadır və duadır,
Məlun kişidir, hiyləvü təzvir nihadı.
Bu əsrdə yox gövhəri-ürfanə xəridar,
Ey bari-xuda, lütflə rəf et bu kəsadı.

Ey kaş, qoyaydın itinin adını Seyyid,
Gəh-gah dəgəydi ləbi-şirinüvə adı.

Derdim ki, könül zirü zəbər olmasın, oldu,
Həmvarə gözüm əşklə tər olmasın, oldu.
Derdim ki, xətin tutmaya dövri-məhi-ruyin,
Bu fitnə əyan dövri-qəmər olmasın, oldu.
Ömrüm tükənib, oldu nihayət şəbi-vəslin,
Etdim ki dualar, bu səhər olmasın, oldu.
Bağı-dili-şeydadə olan nəxli-məhəbbət,
Derdim belə bibərgü səmər olmasın, oldu.
Çəkdim o qədər ah ki, ol sərv cəmalı
Sərkəşlər üçün məddi-nəzər olmasın, oldu,-
Rəşk öldürəcəkdi məni, ol muy-miyanın
Ortayə gəlib zibi-kəmər olmasın, oldu.
Seyyid, dilüvi lal eləsin qadiri-sübhan,
Derdim ki, dili-yarə kədər olmasın, oldu.

Zülali-ləblərin «eynən tüsəmma səlsəbil»[1] oldu,
Dedim bir cürə ondan, aləmə qanım səbil oldu.
Dəhanından səri-mu qədri söz izhar qılmışdım,
Düşüb söz aləmə varü yox üstə qalü-qil oldu.
Desəm peyğəmbəri-əsrəm, degildir küfr, zira kim,
Pəyamım vəhyi-münzəl, qasidim bir Cəbrəil oldu.
Əgərçi, yandı könlüm hicr odundan, kuyüvə, ey məh,
Qaranqu gecələrdə şöleyi-ahım dəlil oldu.
Ayırdı ol əzizi nagəh ixvanın cəfasından,
O Yusif firqətindən hər gözüm bir rudi-Nil oldu.
Çü gördü qəmzeyi-fəttanını, xovfindən Əzrail,
Kəməndi-zülfüvə saldı özün, miskin dəxil oldu.
Zərurətlə çü gəldi aləmi-nasutə ol gülrux,
Əzizi-aləm ikən Seyyidin xarü zəlil oldu.

[İstinad1: Behiştdə axan çeşmə]

/*Bir da bəzmimdə mənim ol büti-novşad olumu?
Görəsən qəmli könül bir də dönüb şad olumu?
Ol qədi sərvi-rəvan başə salarmı sayə,
Dili-qəmpərvərimiz  qüssədəı  azad  olumu?
Özün insaf qıl, ey padişəhi-kişvəri-hüsn,
Səni əğyar ilə kerdükdə könül şad olumu?
Zülfi-müşkinini eylərmi kenə canə kəmənd?
Kenə dil seydinə ahu közü səyyad olumu?
Cevri-yar oldu füzun, saqi, kezün qurbanı,
Rahət üçün  mənə  mey  ta xəti-bəğdad olumu?
Özün insaf elə, ey ləbləri şəhdü şəkkər,
Ləbi-şirinüvə bir mən təki Fərhad olumu?
Almadı tərbiyətin piri-muğanın Seyyid,
Cövhəri naqis olan qabili-irşad olumu?

Dün, ey Səfa ki, etmiş idin xoşsəfa məni
Topraqdən götürmüsən, ey dilrüba, məni.
Qurban bu mehribanlığa, ey Kəbeyi-ümid,
Bundan sora çevir başuva, qıl fəda məni.
Hər yerdə kim, olam, sənin, ey şəh, qulamınam,
Yazmış sənə qulam əzəldən qəza məni.
Hər gün sənin hüzuruva mən gəlmək istərəm,
Bu əmrdən mümanəət eylər həya məni.
Cami-mey ilə həmdü səna söhbətin yazıb,
Guya təsəvvür etmisən əhli-riya məni.
Xaki-dərindən olduğuma neçə gün cüda,
Ey dust, gərçi yazmış idin bəd əda məni.
Rahi-məhəbbətində sənin olmamış şəhid,
Səndən, ilahi, eyləməsin həq cüda məni.
Düşnam olsa da, mənə şirindi sözlərin,
Seyyid kimi hesab eləmə bivəfa məni.

Görməyib sən kimi, ey məh, çərxi-minanın gözü,
Kurdir hüsnün şüasından Sürəyyanın gözü.
Zahidi-kəcbin nə bilsin arizin əsrarını,
Feyz aparmaz gül tamaşasından əmanın gözü.
Dil edər naqus tək fəryad dərdi-hicrdən,
Sən ki, çıxdın dışraya, çıxdı kəlisanın gözü.
Canuva canlar fəda kim, sənsən ey tərsa-beçə
Məryəmin canı, Məsihin ruhu, İsanın gözü.
Bəs ki etmiş ruzü şob, ey tifl, fikri-qamətin,
Görməyir bir hərf əlifdən qeyri mollanın.gözü.
Ənbəri-sarayə meyl etməzdi, ey ahunigah,
Zülfi-müşkinin əgər görsəydi Saranın gözü.
Seyyida, müşkül qalır ol mahi-nurəfşan tək--
Kim, qalıbdır ol hilaləbrudə dünyanın gözü.

Bir könül ki, ola ol mahliqadən xali,
Bu yəqinimdir olur nuri-xudadən xali,
Düşəni könlümə rüxsari-münirin mehri,
Bu siyəh xanə degil hiç ziyadən xali.
Nafeyi-Çin demişəm zülfi-əbirəfşanın,
Bilmişəm kim, degiləm səhvü xətadən xali.
Dili-pürxunə dəgəndən bəri tiri-sitəmin,
Dil degil hiç bu ehsanə duadən xali.
Necə izhar eləyim dərdi-nihanım o gülə,
Ki degil, yanı onun badi-səbadən xali.
Xalı bir nöqtədir, amma ki, edib yüz dili seyd,
Hiç bir nöqtə degil əmri-qəzadən xali.
Seyyida, sən kimi aşiq degil ol zülfə əgər,
Niyə ayrılmayır ol zülfi-dütadən xali.

Əlminnətü-:lillah, qəmə qəmxar tapıldı,
Qəm çəkməyə bir yari-həvadar tapıldı.
Səd şükr ələ gəldi şəriki-qəmü möhnət,
Aləmdə mənə yari-mədədkar tapıldı.
Maildi məgər çərxi-cəfakar vəfayə--
Kim, bir bu sifət yari-vəfadar tapıldı?
Düşmüşdü mətai-hünərü fəzl kəsadə,
Şad ol ki, könül rövnəqi-bazar tapıldı,
Qalmışdı tərazuyi-gözümdə düri-əşkim,
Yüz şükr ki, bu dürrə xəridar tapıldı.
Asandır o qəm ki, ola qəmxarı cahanda,
Şadəm  ki, əlaci-qəmi-düşvar tapıldı.
Seyyid, o səri-kuy iti oldu sənə həmdəm,
Avazüvə avaz verən yar tapıldı.

Budur o fitnə ki, siz eylədiz fəsanə məni,
Məhəbbətində şəhir eylədiz cahanə məni.
Budur o kiprigi ox, dilbəri-kəmanəbru--
Ki, tiri-tənəyə siz eylədiz nişanə məni.
Bu ol bahari-dilaradı kim, həvası ilə
Bahari-ömrüm ara döndərib xəzanə məni.
Xəzanələr verib aldım bu dürri-seyranı,
Yetirdi gənci-xudavəndə ol xəzanə məni.
Nə xəndə, giryeyi-bifeyzdir işim şəbü ruz,
Əgərçi döndərib eşqində zəfəranə məni.
Fərat aşdı başımdan və leyk mən təşnə,
Yaxıbdır odlara, ey vay, aşiqanə məni.
Əzizi-aləm ikən dilfikar Seyyid tək
Edibdi xar belə gərdişi-zəmanə məni.

Qurban olum o gözlərə kim, gördü yarımı,
Yarım görən göz, əlbət alır ixtiyarımı.
Qoy bir öpüm o gözləri kim, yarımı görüb,
Qurban edim o gözlərə mən hər nə varımı.
Nərgiz gözü qalır açıla görsə bağdə,
Çeşmi-xumarü sərv-qədü gülüzarımı.
Mərdümlük olmadı mənə çün çeşmi-yardən,
Kəsdim gözümdən axırı öz etibarımı.
Bimarı olmuşam mən o badami gözlərin,
İnnab gözlərim eləsin fikri-karımı.
Şadəm ki, xak edə məni bu çərxi-kəcmədar,
Damani-yarimə yetirə ta qübarımı.
Seyyid, o gün olurmu genə səhni-bağdə
Xürrəm görüm şüküftə güli-novbaharımı?

Rüxsarı gərçi çahdə pür abü tab idi,
Guya ki, bürci-Dəlvdə bir afitab idi.
Olmaz bahar mövsimi gün Dəlvdən əyan,
Amma o şəms Dəlvdə şeyün-ücab idi.
Görmüşdü Xızr abi-bəqanı o çahdə
Pəs gözlərində çeşmeyi-heyvan sərab idi?
Ol Dəlvi-asiman idi, Yusif bir afitab,
Sanma ki, həbli-müşki-siyəhdən tənab idi.
Atəş büruzə gəldi o çah içrə abdən,
Mənzuri-karvan o zaman gərçi ab idi.
Qəvvas olub Bəşir o dəryayi-çahdə,
Hasil o bəhrdən ona bir dürri-nab idi,
Əyyami-vəsl getdi əlindən bu Seyyidin,
Guya ki, bəzmi-vəsl xəyal idi, xab idi.

Aşüftəligim zülfi-siyəhtarı bilirmi?

Ya rəb, görəsən dərdi-dilim tari bilirmi?
Bilməz, bilirəm yar mənim suzi-nihanım,
Tufanə dönən göz yaşımı, bari, bilirmi?
Girəm bu gecə qaldı gözüm yolda, nə nəfi,
Ol mah özü etdigi iqrarı bilirmi?
Girəm ki, dögər başını səccadəyə zahid,
Tərsadə olan məniyi-zünnarı bilirmi?
Vaiz ki, deyir mey içənə əhli-cəhənnəm,.
Bir məğfirəti-qadiri-qəffarı bilirmi?
Abid ki, edir cənnət ilə Kövsərə rəğbət,
Meyxanə ilə badeyi-gülnarı bilirmi?
Seyyid ki, bilir öz-özünü mərifət əhli,
Bircə soruşun, feyzi-dəhü çarı bilirmi?

Ey əndəlib, rövnəqi-gülzar qalmadı,
Gül qarət oldu, xarə dəxi yar qalmadı.
Əğyardən həmişə edərdin şikayəti,
Səd şükr kim, zəmanədə əğyar qalmadı.
«Nətvis-Süha» büruzə gəlibdir əyan bu gün,
Dövrü qutardı, günbədi-dəvvar qalmadı.
Gün çıxdı, məhv oldu cahandan sitarələr,
Cüz nuri-şəms, şöleyi-ənvar, qalmadı.
Üzlər təvəccöh eylədi şəmsi-həqiqətə,
İqbalə döndü, kimsədə idbar qalmadı.
Ənhari-kəsrət oldu rəvan bəhri-vəhdətə,
Qeyr əz xudayi-vahidü qəhhar qalmadı.
Bütlərdən oldu beyti-xuda.pak, ey könül,
Yarımdan özgə xanədə dəyyar qadmadı.
Seyyid, mətai-şerini bazarə çəkmə sən,
Sərraf getdi, zərrə xəridar qalmadı.

Özüm getdimsə ol kudə dili-qəmpərvərim qaldı,

Səri-kuyində yarın bir fəqiri-müztərim qaldı.
Çağırdı bəzmi-işrətdən rəqib, ol mehriban getdi,
Səbu zanudə, mey minadə, əldə sağərim qaldı.
Gedib Fərhadü Məcnun, dəhrdən, mən qalmışam tənha,
Nə bir həmdəm, nə bir munis, nə yarü yavərim qaldı.
Vücudimi fələk, ari, qılıb nəqşi-əvarizdən, .
Bu aləmdə mənim zati olan öz cövhərim qaldı.
Diriğa, dərd kim, gəldi əcəl, mən getdim aləmdən,
Rəqibi-bülhəvəslərlə o mahi-ənvərim qaldı.
Cigər pərkaləsindən vermədin tabutuma zinət,
Təmamə yetmədi getdim, cahanda zivərim qaldı.
Bihəmdilləh ki, qaldı yadigar əşari-canbəxşim,
Əgərçi, Seyyida, nə mülkü malü nə zərim qaldı.

Qeyr ilə yarım gəzir, gərdən çəkib bir qu kimi,
Qalmışam viranələr küncündə mən bayqu kimi.
Zikr edərsəm gecələr ağzım sulanı zövqdən,
Bir süreyni var o şuxun balişi-pərqu kimi.
Dürri-dəndanı qəmindan qətrə-qətrə göz yaşım
Tiri-müjganı tutulmuş rişteyi-lölu kimi.
Mən deməm ki, içmədim mey sənsiz, ey namehriban,.
İçdim, amma ləblərindən ayrı, bir ağu kimi.
Sərvə derlər meyvə verməz, bəs nədir, ey sərvqəd,.
Pirəhəndən baş verib püstanların limu kimi?
Gözlərin ahuya bənzətdim, xəta etdim, o şux
Aqibət məndən rəmidə oldu bir ahu kimi.
Yarələnmiş mixləbi-şəhbazi-çeşmindən məgər,.
Nalə eylər ruzü şəb miskin könül yahu kimi.
Ruyi-atəşnakın üstə zülfün oynar dəmbədəm,
Löbət izhar eylər atəşbaz olan hindu kimi.
Sünbüli-zülfünlə ta ki, mərhəm etdim zəxmimə,
Bu verir hər gecə zəxmim bir güli-şəbbu kimi,
Seyyida, kilki-Müsəvvirdir əsayi-Musəvi,
Sən ona hərgiz nəzirə söyləmə cadu kimi.

Gər vəsli-yar olmaz, mən neylirəm baharı,
Yüz min bahar olsa olmaz könül qərarı.
Gülzarə gül gəlincə tək bəzmə yar gəlsin,
Hərçənd yoxdu yarın bir gülcə etibarı.
Sünbül xəcalətindən başın aşağə salmış,
Yarımda gördü yoxsa, ol zülfi-müşkbarı.
Udi-Qumarə bənzər, yarın şəmimi-zülfü,
Bir tarı bəst edibdir yüz nafeyi-tatarı.
Ey dil, əlim üzüldü ol zülfi-tardən kim,
Tari nəsib qılsın bir də görüm o tarı.
Bir sərv həsrətindən hər su rəvandır əşkim,
Bir cuyə etmə nisbət bu çeşmi-əşkbarı.
Gül-gül olub sirişkim, gülzar olub kənarım,
Mən neyləyim baharı, ya bağü laləzarı?
Dəfn eyləyin bu nəşim yollar kənarı üzrə,
Şayəd ki, qəbrim üstə yarın düşə güzarı.
Saqi, əlin fədası, dur  bir əyağ doldur--
Kim, Seyyidin bu şəbdən başında var xumarı.

İntizarım həddən ötdü, gülüzarım gəlmədi,
Sünbülüm, sərvim, gülüm, bağım, baharım gəlmədi.
İntizar ilə gözüm yollarda qaldı, ey xuda,
Ol gözüm nuri, üzü xurşidvarım gəlmədi.
Rişteyi-ömrüm yanar suz ilə nari-firqətə,
Ey könül, od tut ki, şəmi-şami-tarım gəlmədi.
Eylədin axır məni, ey çərx, Yusifdən cüda,
Misri-könlüm təxtinə ol tacidarım gəlmədi.
Guy tək qaldı bu meydan içrə sərgərdan başım,
Əldə çovkən, ərsəyə ol şəhsüvarım, gəlmədi.
Vermədi badi-səba müjdə qübari-məqdəmin,
Seyyida, dərmani-çeşmi-əşkbarım gəlmədi.

Eşq əhli oldu hər biri bir canə müştəri,
Pərvanə oldu şəmi-şəbistanə müştəri.
Eşq aləmində himməti-mərdanə göstərib,
Bir qarı oldu Yusifi-Kənanə müştəri.
Varın verən, deyəllər, utanmaz, məsəldi bu,.
Can nəqdi əldə oldum o cananə müştəri.
Rüxsari-yarı iqdi-ərəq cilvəgah edib,
Pərvin olubdu mehri-dirəxşanə müştəri.
Lazım dəgil pədər sənə, ey mehriban pəsər,
Dürri-yətimə çox olu mərdanə müştəri.
Ahım şərarı Müştəriyi-çərxi yandırar,
Ol aşinayə gər ola, biganə müştəri.
Vəsfi-ləbi-nigarı qılıb əşki-al ilə
Seyyid olubdu ləli-Bədəxşanə müştəri.

Öldürür gərçi, könül, həsrəti-pabus səni,
Var ümidim ki, fələk etməyə məyus səni.
Zahidin etmə nəzər cameyi-pəşminəsinə,
Könül, aldatmasın ol xirqeyi-salus səni.
Bu dili-şişəmisalında nədir rişteyi-can,
Yeri vardır desələr şöleyi-fanus səni.
Ey fələk, gəl ki, bir əgri oturub düz danışaq,
Əsəri-ahım edibdir belə mənkus səni?
Vəsldə göz yumuban arizi-yarə baxıram,
Edərəm hicrə, könül, vəsldə pabus səni.
Görmədim bir dil açan yer dəri-dildar kimi,
Ey səba, kim elədim hər yerə casus səni.
Bu qədər hicrdə əfsus çəkərsən Seyyid,
Öldürür axırı, əfsus, bu əfsus səni!

Neylərəm gülşəni kim, ol güli-əhmər getdi,
Göz yaşım cuyə dönüb sərvü sənubər getdi.
Ahü nalə dəmidir eylə fəğan, ey bülbül,
Qaldı yüz xar bu gülşəndə, güli-tər getdi.
Getdi ol cövhəri-can, qaçdı mənim rəngi-rüxüm,
Bu ərəz oldu tələf, ah, o cövhər getdi.
Düşəcəkdir dəxi minbəd işim nöqsanə,
Tutulub. məndən o məhparə mükəddər getdi.
Qərq edib əşk məni, atəşi-rüxsarüvi aç,
Sənə qurban olub, əldən bu səməndər getdi.
Yengi ay tək görünürdü qaşı, zülf aldı onu,
Ah! Əbr altına ol mahi-münəvvər getdi.
Ta ki,öpdüm ləbi-canpərvərin ol hurvəşin,
Xatirimdən həvəsi-çeşmeyi-Kövsər getdi.
Getdi ol yasəməni zülf, salıb yasə məni,
Yəsimə bais olub, ah, o səmənbər getdi.
Getdi Seyyid dolana kuyin o xalı həcərin,
Heyf kim, Kəbə təvafinə o kafər getdi.

Nola qan ağlasan, ey göz kim, ol huriliqa getdi,
Kəsib-arami-dil bizdən, o yari-dilrüba getdi.
Könül xəlvətsərayi-vəsldə sərdar ikən, birdəm
Qılıb ol məh bizi hicrində zarü mübtəla getdi.
Gözümdən xaki-payın aldı seyli-əşk tufanı,
Əcəbmi kur ola çeşmim ki, ondan tutiya getdi.
Nola çıxsa fəğanım çərxə hər bir üstüxanımdan-
Ki, bu üzvi-şikəstimdən bu gün ol mumiya getdi.
Xəyali-zülfü xalü arizindən ol güləndəmın,
O qədri ağladım, axırda çeşmimdən qəra getdi.
Qaraldı ruzgarım, Seyyida, hicrində ol mahın
Ki, guya səfheyi-afaqdən nuri-xuda getdi.

Nə həddi bir əhəd olsun sənə hüsn ilə oxşari,
Yaratmışdır səni öz surətində həzrəti-bari.
Əgərçi sən büti-Çinü Xətasən, ey sənəm, əmma
Səni zikr etməyən kəs, etməyib tovhidə iqrari.
Adın qurbanı, ta yetdim sənə, tovhidə yetdim mən,
Atıb təsbihi əldən, tərk qıldım tari-zünnari.
Xudanın «qülhüvəllahü əhəddən»[1] mətləbi sənsən,
Sənin tovhidüvə əmr eyləyib ixlasdə tari.
Şəmimi-ətri-zülfi-müşkbarın iştiyaqından
Atıbdır təblədən əttar dışra müşki-Tatari.
Soruşdum aduvi, ey sərvqamət, bilmədi zahid,
Müşəxxəs oldu kim, yoxdur onun tovhidə iqrari.
Təcəllayi-xudavəndi əhəd yarında peydadır,
Hanı Musa ki, Seyyid, fərq qılsın nurdən nari.

[İstinad1: De allah təkdir]

Cəfa oxunu atır qeyrə ol yeganə, haray!
Xədəngi-qəmzəsinə olmadım nişanə, haray!
Əgər ki, güldə vəfa görsə idi bülbüli-zar,
Bu qədr suz ilə etməzdi yanə-yanə haray.
Görə harayımı şayəd o şəh, sora halım,
Harayımı özümə eylərəm bəhanə, haray!
Tənim hilal kimi günbəgün zəif oldu,
Yetişmədi əlim ol mahi-dilsitanə, haray!
Hanı o qaşı kəmanım ki, yetsin imdadə,
Rəqib qoydu oxun çilleyi-kamanə, hara!
Mərizi-dideyi-yarəm hanı o İsa-dəm,
Ucaldı naləvü fəryadım asimanə, haray!
Könül binasını yıxdı .sirişki-çeşmi-tərim,
Qəmində seyli-fənayə gedir bu xanə, haray!
Piyadə dəştdə ol şahdən cüda düşdüm,
Yetir bu bikəsi, ey Xızr, karvanə, haray!

Xəyali-zülfü rüxi-ol pərilə leylü nahar,
Cünun təki mənə adət olub fəsanə, haray!
Təğafül ilə bu gün ötdü yar Seyyiddən,
Yəqin rəqib salıb yarı bəd gümanə, haray!

Çıxmaz dili-zarımdan o rüxsar xəyalı,
Bülbüldə əcəbmi ola gülzar xəyalı?
İstə.r könül-ol arizi-gülgunu ərəqnak,
Gül görsə, gülabə olur əttar xəyalı.
Şövqi-dəhənü fikri-rüxündə sənin, ey gül,
Mən eyləmərəm hiç yoxü var xəyalı.
Peyvəstə namaz üstə düşür yadıma zülfün,
Üz Kəbədədir, qəlbdə zünnar xəyalı.
Hər kimsənə bir şey gətirir fikrü xəyalə,
Məcmudən əfzəldi mənə yar xəyalı.
Cənnət nə gərəkdir mənə gər olmasa röyət,
Xoşhal qılıbdır məni didar xəyalı.
Bu xəstə könül ərşi-xudavəndi-əhəddir,
Gəlməz dili-məhzunuma əğyar xəyalı.
İstər tuta dil türreyi-pürpiçini, ey mah,
Əfsungərə adətdir olur mar xəyalı.
Seyyid verər öz canını rəşkü həsədindən,
Gəlsə dili-pürxununa dildar xəyalı.

Ey saqiyi-gülçöhrə, mahi-rəməzan oldu,
Gülzari-rüxi-dilbər zəf .ilə xəzan oldu.
Dildar tutub ruzə, zəf oldu ona qalib,
San yengi çıxan aydır, çərx üzrə əyan oldu.
Qaçmış o güli-alın ləli-ləbinin qanı,
Bağrım tutulub qəmdən, qönçə kimi qan oldu.
Aşüftə olub kakil əbruyi-kəcin tutdu,

Mah idi bu eyd üçün əbr içrə nihan oldu.
Açıldı dəri-məscid, cəm oldu riya əhli,
Bağlandı səri-mina, qəmdən xəfəqan oldu.
Niyyət gecəsi verdim iymanı, şərab aldım,
Sud oldu bu sövdadə, zahid, nə ziyan oldu?
Ta Hübbi-Əlidən mey Seyyid kimi nuş etdim,
Sərməstligim, saqi, məşhuri-cahan oldu.

Dilü can valehi-hər gülrüxi-cananə idi,
Gərçi cananələrin qəsdi dilü canə idi.
Könlümə düşmüş idi bir neçə bütlər həvəsi,
Bir zaman beyti-xuda dəhrdə bütxanə idi.
Suzişi-nari-cəfadən eləməzdi pərva,
Harda bir şəm görə dövrünə pərvanə idi.
Dili-şeyda səri-geysulərə olmuşdu əsir,
Bağlanıb silsileyi-eşqdə divanə idi.
Harda bir rişteyi-zülf olsa, olurdu mənə dam,
Kimdə bir daneyi-xal olsa mənə danə idi.
Hər büti-gülrüxi-peymanşikənin eşqi mənə,
Əhdü peymanımızın şahidi peymanə idi.
Göftguyi-ləbi-şirinü şəkərdən qeyri,
Hər nə kim söhbət ola Seyyidə əfsanə idi.

Təsəvvür eyləmə kim, məst edibdi badə məni,,
Gözündü məst qılan badədən ziyadə məni.
O tari-türrələrin eylə boynuma zəncir,
Cünuna var həvəsim, qoyma biqəladə məni,
Ümid var ki, tutam bir tərəfdə damənini,
Sovursalar kül edib firqətində badə məni.
Mənəm ki, aləm ara şəhsüvari-izzət idim,
Bu ərsəgahdə mat etdi bir piyadə məni.

Yavuqdu kim, bu fərəhdən öləm, eşitdim çün
Şəhid qılmağa yar eyləyib iradə məni.
Muradım ol məh əlində şəhid olmaqdır,
Nolur yetirsə fələk rəhm edib muradə məni.
Cəmali nəqşini sinəmdə səbt edib, Seyyid,
Salıbdı rəngə bu gün ol nigari-sadə məni.

Ey dil, genə ol şöbədəgər yadıma düşdü,
Piranəsər ol sadə pəsər yadıma düşdü.
Gördüm gülü, oldu üzünə həsrətim əfzun,
Baxdım aya ol rəşki-qəmər yadıma düşdü.
Heyrətdə idim bunca nədir gözdən axan qan,
Ol qanə dönəm xəstə çigər yadıma düşdü.
Vəslində keçən günləri kim, gəldi xəyalə,
Daxi deyə bilməm ki, nələr yadıma düşdü.
Kim getdi, dedim, nəkhəti-zülfün mənə yarın,
Nagəh o zaman badi-səhər yadıma düşdü.
Bir kimsə dedim varmı ki, rüxsaruvi öpsün,
Ari, o qara zülfün öpər, yadıma düşdü.
Olmuş kimə. məqdur dedim vəsli-miyanı,
Seyyid, gəlibən fikri-kəmər yadıma düşdü.

Zülf arasında könül arizi-dilbər tapdı,
Bu qaranlıq gecədə mahi-münəvvər tapdı.
Tutiyi-can ləbüvə püstə xəyalilə yatıb,
Həbbəza, taleyi-fərxəndə ki, şəkkər tapdı.
Tapdı ol dürri-giranmayəni axırda rəqib,
Gör ki, xərmöhrə bu aləmdə nə gövhər tapdı.
Tiğ pak etdi xəti arizi-ziybasından,
Bülbül əyyami-xəzan bir güli-əhmər tapdı,
Şükrlillah ki, könül qəmlərüvə gətdi pənah,
Özünə aləm ara yar ilə yavər tapdı.

Aldı divanə könül daməni-Məcnunu ələ,
Vadiyi-eşqdə bir mürşidi-rəhbər tapdı.
Seyyida, mövsümi-güldür, hamı dilşad oldu,
Bir məni piri-müğan zarü mükəddər tapdı.

Gizlədirdim bir zaman bu çeşmi-rövşəndən səni,
Gizlədir indi, nigarım qeyrilər məndən səni.
Qoy xədəngi-möhnətin rövzənlər açsın sinədən,
Dil görə, ey mahrüx, şayəd bu rövzəndən səni.
Bu qədü rüxsar ilə seyri-gülüstan eyləsən,
Fərq qılmaz bağban, ey sərv, gülşəndən səni.
Gərçi, nöh əflaki-kəcrov səxtdir, ey tiri-ah,
Qorxma, pərran eylərəm suz ilə cövşəndən səni.
Sən dua eylə yetim, ey can, bu gün cananıma,
Hiç qəm çəkmə qutarram məhbəsi-təndən səni.
Mən hara, həngameyi-vəslin hara, ey şəmi-hüsn,
Od tutub pərvanə tək yannam görəm gendən səni.
Seyyida, hər kimsənə bir mətləb istər dəhrdən,
Mətləbim yox qeyrdən, mən istərəm səndən səni.

Hər dəmdə qıllam ney tək nəvani,
Saldın nəzərdən mən binəvanı.
Siccinə düşdüm hicri-rüxündən,
«Tərif məkanı, ya mən yərani»[1].
Yandın bu narə, xak oldun, ey dil,
Tök ab gözdən, tərk et həvani.
Qönçə dəhanın əsrarın açma,
Sən məhrəm etmə badi-səbani.
Ol çini-zülfə gər nisbət etsəm,
Billah xətadır müşki-Xətani.
Kakil qəmindən var sərneviştim,

Döndərmək olmaz başdan qəzani.
Arif gözündə vəhdətdi kəsrət,
Kəsrətdə seyr et zati-xudani.
Zahirdə kəsrət, batində vəhdət,
Vəhdət gözüylə gör masivani.
Dəryadi qətrə, dəryayə düşsə,
Düş bəhri-eşqə eylə şitani.
Gər zati-həqqi bulmaq dilərsən,
Əğyarı tərk et, tap Mürtəzani.
Aləmdə yoxdur bir ondan özgə,
Əhvəl degilsən bir görsən ani.
Zati-Məhəmməd zati-Əlidir,
İki bədəndə bir bil o cani.
Sirri-dəhanın faş etmə Seyyid,
Nadana açma razi-nihani

[İstinad1: Ey məni axtaran, mənim məkanımı tanı.].

Qəmindən qönçə tək dil qanə döndü,
İşim bülbül kimi əfğanə döndü.
Yaman göz yaxşı dəgdi vəsli-yarə,
Visalım möhnəti-hicranə döndü.
Pərişan, tirəbəxt, aşuftəhaləm,
Günüm ol-zülfi-müşkəfşanə döndü.
Kənarımdan çün ol dürr oldu qaib
Gözüm yaşı axıb Ümmanə döndü.
Həzər qıl macərayi-çeşmi-tərdən
Sirişkim bəhri-bipayanə döndü.
O dürri-gənci-hüsnün firqətindən,
Könül bir mənzili-viranə döndü.
Dəxi səngi-cəfadən xali olmaz,
Du çeşmim kəffeyi-mizanə döndü.
Rəqibi-bülhəvəs məqsudə yetdi,
Dili-Seyyid cəfadən qanə döndü.

Bir bilmədim axır niyə bu qaş gözə gəldi,
Çıxsın gözü, əğyar gözündən gözə gəldi.
Derlərdi vücudi-dəhəni-yar ədəmdir,
Ol nöqteyi-sərbəst açıldı, sözə gəldi.
Tiğ etdi xətin pak üzündən o nigarın,
Əlminnətü-lillah, gecəmiz gündüzə gəldi.
Dil ruzi-ələst etdi qəbuli-qəmi-eşqin,
Nasutə qədəm qoydu, bəlayə dözə gəldi.
Tar eyləyən ol ayinəni dudi-dilimdir,
Sən böylə xəyal etmə ki, xəttin üzə gəldi.
Tufani-sirişkim çəkilib ruyi-zəmindən,
Gördükdə onu Kuhkən indi düzə gəldi.
Gördü ölürəm həsrəti-çeşmindən o şuxun,
Sormağa qəmim, çeşmi-xumarım sözə gəldi.
Bir söz, yüzə gəlməz sənə ol şahidi-məqsud,
Seyyid, tutalım sali-həyatın yüzə gəldi.